FƏLSƏFİ İNCİLƏR KİTABXANASI

Əbu Həmid Əl-Qəzali



# İLAHİ BİLİKLƏR

Fəlsəfi incilər kitabxanası

Əbu Həmid əl-Qəzali

# İLAHİ BİLİKLƏR
## (seçilmiş əsərlər)





"Adiloğlu" nəşriyyatı
Bakı 2006

Az.
Q 44

Kitab **İsa NƏCƏFOV** və **Vidadi MƏMMƏDOVUN** təşəbbüsü və yardımı əsasında tərcümə və çap olunmuşdur.

---

*Redaktor:* **Bayram Ağayev**
*filologiya elmləri namizədi*
*Bədii tərtibat və illüstrasiyaların rəssamı:*
**Fikrət ƏLƏKBƏROV**

*Azərbaycan dilinə tərcümə edənlər:* **Elçin ABBASOV**
**Nizami VƏLİYEV**

Q 44 **Əbu Hamid əl-Qəzali.**
İLAHİ BİLİKLƏR (seçilmiş əsərlər).
*Bakı, «Adiloğlu» nəşriyyatı-2006. 296 səh. (5 şəkil)*

*Kitabda böyük islam ilahiyyatçı-alimi, mütəfəkkiri Əbu Həmid əl-Qəzalinin ən mühüm əsəri olan «Dini elmlərin dirçəlişi» (İlahiyyatın intibahı) əsərindən iki fəsil, Sultan Məlikşaha müraciətlə yazılmış «Hökmdarlara nəsihət», «İlahi biliklər» və «Nur taxçası» adlı əsərləri toplanmışdır. Min ilə yaxın bir zaman keçməsinə baxmayaraq, bu əsərlər öz məzmunu, əhatə etdiyi problemlərin mahiyyəti baxımından müasir dövr üçün də aktual olaraq qalır.*

Q $\frac{4322110018}{121\text{-}2006}$ qrifli nəşr

## BİR NEÇƏ SÖZ

Oxuculara təqdim olunan bu kitab Əbu Həmid əl-Qəzalinin Moskvadakı «Ansar» nəşriyyat evində 2004-cü ildə rus dilində işıq üzü görmüş «Hökmdarlara nəsihət» kitabından tərcümə edilmişdir. Buraya böyük islam ilahiyyatçı-alimi, mütəfəkkiri Əbu Həmid əl-Qəzalinin ən önəmli yaradıcılıq nümunəsi olan «Dini elmlərin dirçəlişi» (İlahiyyatın intibahı) əsərindən «Mömin insanların gözəl hesab etdiyi, əslində isə belə olmayan elmlər haqqında» başlıqlı iki fəsil, Sultan Məlikşaha müraciətlə yazılmış «Hökmdarlara nəsihət», «İlahi biliklər» və «Nur taxçası» əsərləri daxil edilmişdir. Min ilə yaxın bir zaman keçməsinə baxmayaraq, bu əsərlər öz məzmunu, əhatə etdiyi problemlərin mahiyyəti baxımından müasir dövr üçün də öz aktuallığını qoruyub-saxlamışlar. İslam tarixinin ən nüfuzlu şəxsiyyətlərindən biri olan əl-Qəzali nadir zəka sahiblərindən biri olmaqla yanaşı, sonrakı dövrlərin islam Şərqində də onun qiymətli əsərlərinin ictimai şüurun zənginləşməsi prosesində rolu mühüm əhəmiyyət kəsb etmişdir. O, antik dövr fəlsəfəsini, mədəniyyətini də dərindən mənimsəyərək, onları böyük Şərq mədəniyyəti məcrasında inkişaf etdirmiş, aksioloji yanaşma nəticəsində onları islamın elmi-fəlsəfi-hüquqi əsaslarının zənginləşməsi xidmətinə cəlb etmişdir.

Bütün bunlarda əl-Qəzali müqəddəs Kitabın ona aşıladığı meyarlardan çıxış etmiş, öz nadir zəkasını yalnız bu sönməz işığın şüalarına etibar etmişdir. «Oğluma məktub»da da bu, aydın görünür: «Bil ki, nəsihət Kitabın əsasında yazılıb. Əgər sənə ondan hansısa bir nəsihət çatıbsa, o zaman mənim nəsihətim sənin nəyinə lazımdır? Əgər çatmayıbsa, onda mənə de: «Keçmiş illərdə sən nə qazanmısan?»».

Əl-Qəzali 1058-ci ildə (hicri 450) Məşhəd yaxınlığındakı Qəzal kəndində anadan olmuşdur. Toxuculuqla məşğul olan atası həmişə alimlərin söhbətlərinə məftunluqla qulaq asar və oğlanlarının da belə savadlı natiq olmalarını arzulayarmış. Tale onun arzusunu yerinə yetirir və hər iki oğlu bu yolda uğur əldə edir. Qəzali isə doğma şəhərinin ən savadlı sakini kimi tezliklə imam rütbəsini qazanır. Təhsilini artırmaq üçün o, müxtəlif şəhərlərə – Tusa, Gürgana, Nişapura, Əl-Müəskərəyə səyahətlər edir və dərin, hərtərəfli təhsil almağa müvəffəq olur. Gürgandan qayıdarkən o, yolda soyğunçulara rast gəlir. Qəzali onlardan heç olmasa dinlə-

diyi mühazirələrin yazıldığı qeyd dəftərlərini qaytarmalarını xahiş etdikdə, belə cavab alır: «Əgər sən biliklərindən belə məhrum ola bilirsənsə, özünü necə alim adlandıra bilərsən?». Bu hadisədən sonra Qəzali bütün qeyd dəftərlərini, yazdığı mühazirələri dərindən mənimsəyir və bilikləri həmişə, hər yerdə öz sahibi ilə birgə olur. Onun məşhur deyimlərindən «Sənin olan yalnız gəmi qəzaya uğradıqda itirə bilməyəcəyindir» kəlamı, çox güman ki, bu hadisə ilə bağlıdır.

Əl-Müəskərədə Qəzali dövrünün ən məşhur adamlarından biri olan böyük vəzir Nizam ül-Mülklə tanış olur. Onun heyrətamiz, dərin və hərtərəfli savadını, mühakiməsini, Allah eşqini görən Nizam ül-Mülk bütün bunları qiymətləndirir və tezliklə onu Bağdadın «Əl- Nizamiyyə» mədrəsəsinə rəhbər təyin edir. Əl-Qəzalinin Bağdadda çalışdığı dörd il onun elmin, şöhrətin zirvələrinə çatmaq yolunda ən mühüm mərhələlərindən biri olmuşdur.

Gözlənilmədən var-dövlətini insanlara paylayaraq Bağdadı tərk edən əl-Qəzalinin bu hərəkəti ilə bağlı etirafı əslində bu nadir şəxsiyyətin ilahi nura bürünmüş həyatı üçün təbii idi: «...öz müəllimlik fəaliyyətimdə çatmaq istədiyim məqsədlər haqqında düşündükdə gördüm ki, mənim bu məqsədlərə çatmaq istəyim təkcə Uca Allah rizasına görə deyil, məni bu işlərə sövq edən həm də böyük şan-şöhrətə çatmaq istəyidir. Bildim ki, uçurumun kənarındayam...».

Sonra on bir il dərviş həyatı yaşayan, bir sıra ölkələrə səyahətlər edən, islam aləminin nüfuzlu alimləri ilə tanış olan, bir çox elmlərin zirvəsinə çatan əl-Qəzali bunun ardınca bütün dünyaya yayılan, günümüzdə də böyük əhəmiyyət kəsb edən, islam ilahiyyatı üçün dəyəri hesaba gəlməz əsərlərini yazır.

Xəlifənin onu «elm məşəli»ni gücləndirmək naminə Bağdada qayıtmaq dəvətinə cavablarından birində əl-Qəzali deyirdi: «İndi İraqa yollanmaq deyil, daha çox həyatla vidalaşmaq vaxtıdır. Allaha gedən yol isə istər Tusdan olsun, istər Bağdaddan, eynidir».

İslam dünyasının ən nüfuzlu ilahiyyat alimlərindən olan, bir çox elmlərin böyük bilicisi əl-Qəzali 1111-ci il dekabrın 19-da (hicri 505, Cumada-əl- Axira ayının 14-də) ölümqabağı son olaraq: «Ey Uca Allah, Sənin iradənə baş əyirəm!»,- sözlərini deyərək Allaha qovuşmuşdur.

Zaman Əl-Qəzalinin əsərlərini hər yeni dövr üçün daha da cilalamışdır. Şərq həyatının bir çox sahələrini özündə cəmləyən bu əsərlər ilahi bütövlüyə xidmət edir, insanları, əlalxüsus da hökmdarları ədalətə, aqil olmağa səsləyir. Orada nəql olunan əh-

valatlar, onlara verilən şərhlər, müəllifin ruhani-fəlsəfi konsepsiyası vaxt ötdükcə müxtəlif formalarda ürəklərə, şüurlara təsir etmiş, islam şərqində hökmdar adilliyinin, hakimiyyətin ədalət üzərində bərqərar olunmasının, islami dəyərlərə söykənərək onun əxlaq kodeksinin ənənəviləşməsi kriteriyalarının müəyyənləşməsində öz rolunu oynamışdır.

Onun bilavasitə Sultan Məlikşaha müraciətlə yazdığı «Hökmdarlara nəsihət» əsəri sultanın simasında dövrünün hökmdarlarına ünvanlanmış bir əsər idi. Burada hökmdarları ədalətə çağırış ritorik səciyyə daşımırdı. Bu çağırış insanların zəngin ənənələrə söykənən real əhvalatlardan, deyimlərdən ibrət götürmələrinə hesablanmışdı.

Və hər yeni nəsil bu əsərləri yaşadıqları dövrün işığında oxuyur, oradakı əhvalatları öz zəmanəsində baş verənlər, öz başına gələnlərlə istər-istəməz müqayisə edir, bu «şüuraltı» tarixi yaddaşın müasirliklə səsləşə-səsləşə yaşadığının şahidi olur.

«Hökmdarlara nəsihət»dəki bəzi əhvalatlar, xüsusilə də Xorasan əmiri Əhməd ibn İsmayılın öz ordusu ilə Mərvə daxil olduğu zaman onun yerli əhaliyə toxunmamaq barədə verdiyi vədi pozan əsgəri necə sərt cəzalandırması, Zeyd ibn Əslamın Ömər ibn əl-Xəttab haqqındakı nəqli mənə mərhum prezidentimiz Heydər Əliyevlə (Allah ona rəhmət eləsin) bağlı şahidi olduğum bir çox məqamları xatırlatdı. Onlardan yalnız bir neçəsini Sizlərlə bölüşmək istərdim.

... 1997-ci ilin ortaları idi. O vaxt mən respublika baş prokurorunun birinci müavini vəzifəsində çalışırdım. Günün birində baş prokuror Eldar Həsənov daxili telefonla zəng vuraraq bildirdi ki, nahardan sonra Milli Təhlükəsizlik Nazirliyinə (MTN) getməliyik və bu, Prezidentin göstərişidir. Onun dediklərindən belə anlaşıldı ki, milli təhlükəsizlik naziri Namiq Abbasov hansısa çox ciddi bir məsələ barəsində Prezidentə məlumat verib və biz indi onu çözməliyik. Bu iki-üç kəlməlik telefon söhbətindən sonra neçə gün idi ki, daxildən məni çulğamış narahatçılıq bircə anın içərisində əriyib yox oldu. Deyilən vaxtda – nahardan sonra Eldar Həsənovun xidməti avtomobili ilə MTN-nə yola düşdük. Biz mənzil başına çatanda nazirin əhval-ruhiyyəsi çox yüksək idi. Fikirli olmağım onun kefini daha da duruldu. Kabinetinə daxil olarkən daxili işlər naziri Ramil Usubovu da orada gördüm. Üzgözündən nəsə bir narahatçılıq sezilirdi. Namiq Abbasov isə həmin an mənə marığa yatmış ovçunu xatırlatdı. Sanki çoxdan arzusunda olduğu şikar hədəfdə idi. Salamlaşıb əyləşən kimi o, qarşıma bir qovluq qoydu və çox nəzakətlə xahiş etdi ki, onunla

tanış olum. 5-10 dəqiqə müddətində sənədlərlə tanış oldum. Bu sənədlər əsasən soyadını unutduğum İbad adlı şəxsin MTN-ə yazdığı bir neçə ərizədən və ərizələri əsasında verdiyi izahatlardan ibarət idi. Sənədlərdən belə görünürdü ki, guya İbad mənim qəbuluma gələrək Milli Məclisin sədr müavini Afiyyəddin Cəlilovu OMON-çu olan yeznəsinin polisdə işləyən qardaşı ilə cinayət əlaqəsinə girərək öldürdüyünü bildirmiş, mən isə ərizəni qəbul etməkdən imtina etmiş və onu qovmuşam. Bu isə sözsüz ki, vəzifədən sui-istifadə etməklə ağır cinayəti gizlətmək demək idi.

İbad, doğrudan da, mənim qəbulumda olmuşdu, özü də tək yox. Polislə bağlı şikayətini isə yazılı deyil, şifahi şəkildə bildirmişdi. Ərizə və izahatlarında isə onu mənim qəbuluma gətirən şəxsin adını çəkməmişdi. Bu, mənim ən böyük silahım idi.

Sənədlərlə tanışlıqdan sonra suallar başladı. Aldıqları cavablar nə Namiq Abbasov, nə də Eldar Həsənovun könlünü açdı. Belə olan halda İbadla mənim üzləşməyimi tələb etdilər. Dərhal razılıq verdim. Çünki onlar yaxşı əməliyyatçı olsalar da, çox naqis istintaqçı idilər. Təxminən 10 dəqiqədən sonra İbadı Namiq Abbasovun kabinetinə gətirdilər. Ona birinci mən müraciət etdim. Sadəcə olaraq: «Başını qaldırıb, üzümə bax...»,- dedim. O, dərhal ərizə və izahları düz yazmadığını bildirdi. Sanki «dostlarım»ın üstünə su səpdilər. Pərtliklərini gizlədə bilməyib İbadın üstünə hücum çəkdilər. Ramil Usubovun isə prosesin gedişatından məmnun qaldığı təbəssümündən bəlli idi. İbaddan əvvəlki izahatını bir daha ala bilməyəcəyini görən Namiq Abbasov onun başqa otaqda gözləməsinə göstəriş verdi. Bu dəfə Eldar Həsənovun İbadı başqa otaqda dindirməyim barəsindəki göstərişinə etiraz etdim. Bunun mənasını dərhal başa düşmüşdüm. Onlar çox ümid edirdilər ki, bəlkə, İbad təklikdə mənim haqqımda nə isə deyəcək. Görünür, dindirmə otağı bu məqsədlə qabaqcadan lazımi avadanlıqlarla təchiz edilmişdi. Qəsdən etiraz edirdim, lakin sonra razı oldum. İbadın dindirilməsi başlanandan 10-15 dəqiqə sonra Eldar Həsənov adam göndərərək, dindirməni dayandırıb N. Abbasovun iş otağına qayıtmağımı xahiş etdi...

Hamı başa düşürdü ki, Heydər Əliyev kimi başçı olan bir ölkədə bu cür torlar hörmək mümkün deyil. Xüsusilə əgər söhbət insan taleyindən gedirdisə.

Bu əhvalatı misal gətirməkdə məqsədim odur ki, prezident Heydər Əliyev üçün yaxın-uzaq, doğma-ögey məmur yox idi. Onun gözündə hamı eyni idi və hər kəsdən də qanunlara əməl edilməsini eyni səviyyədə tələb edirdi.

* * *

... Yanılmıramsa, 14 may 1994-cü il idi. Prezidentin qəbul otağında əyləşib, qəbul olunmağımı gözləyirdim. Elə bu vaxt Bakı şəhər icra hakimiyyətinin başçısı Rəfael Allahverdiyev, baş nazir Surət Hüseynov, kənd təsərrüfatı naziri Müzamil Abdullayev və bir neçə başqa şəxs gözləmə otağına daxil oldu. Onların arasında Rəfael Allahverdiyev daha dilxor görünürdü. Salamlaşdıqdan sonra ondan nə baş verdiyini soruşdum. Sən demə, paytaxtın yalnız bircə günlük çörək ehtiyatı varmış. Yəni ertəsi gün şəhərdə aclıq başlana bilərmiş. Bir azdan gələnlər prezidentin iş otağına dəvət olundular. Heç bir dəqiqə keçməmişdi ki, Prezidentin qalın divarları dəlib keçən səsini eşitdim. «...Məsələni gecikdirməklə istəyirsiniz ki, məni xalqla üz-üzə qoyasınız. Siz xainsiniz. Elə bilirsiniz cinayətlə yığdıqlarınızı rahat yeyəcəksiniz? Sizi qaçqınların yanına aparacam, qıçlarınızı sındıracaqlar».

Bir saatdan sonra qəbulda olanlar qan-tər içində, pörtmüş halda prezidentin iş otağından çıxdılar. Düşünürdüm ki, bu cür gərginlikdən, əsəbilikdən sonra qəbul mənim üçün heç də yaxşı olmayacaq. Prezidentin masasına yaxınlaşıb salamlaşdıqdan sonra mənə oturmağa icazə verdi. Məni heyrətə salan onun çöhrəsindəki sakitlik, həlimlik idi...

Qəbuldan çıxıb insan kütləsinin arası ilə irəlilədikcə üzlərə baxır, sanki rastlaşdığım adamların ürəklərini oxumağa çalışır, düşüncələrində hansı qayğıları götür-qoy etdiklərini öyrənmək istəyirdim. Təbii ki, bu, bir arzu idi. Lakin içimdə elə bir yüngüllük hiss edirdim ki! Fikirləşirdim ki, dar ayaqda güvənc yerimiz, qayğımızı çəkənimiz var. Eyni zamanda çox kövrəlmişdim. Həmin görüş vaxtı Prezidentin içdən gələn səmimi söhbəti elə bil məni silkələyib yuxudan ayıltmışdı. Bir də axı belə söhbətlər yalnız doğmalar arasında olur! Özümə qarşı bu doğmalıq məni daha da kövrəltmişdi. Bu söhbəti haçansa kimlərləsə bölüşmək fikrində olmamışam. Amma Prezidentin söylədiyi bir məqam mənim heç xatirimdən çıxmır: «Elə bil həyatda mənə ev qismət deyilmiş. Bakıda nə qədər binalar tikdirdim. Ancaq Moskvadan dönəndə evim olmadı ki, içinə yığışım. Qardaşımın evində yaşadım. Naxçıvana getdim, orada da eyni vəziyyət. Qohumlarımdan birinin evində yaşaya-yaşaya ata yurdumu alıb, orada özümə ev tikdirdim. Bu dəfə ev hazır olanda Bakıya gəldim». Bu, illərlə hakimiyyət başında duran bir insanın şəxsi həyatında qazandıqları idi. Baxmayaraq ki, əslində milyonlarla insanın evinin qapısı onun üzünə açıq idi...

...Amma indiyə kimi Prezidentin bir gün ərzində o çörək problemini necə həll etdiyini bilə bilmədim.

* * *

... Fanatizm ağıldan yox, qəlbin istəyindən doğur. O, əvvəl-əvvəl təzəcə cücərmiş tumdan baş qaldıran zoğa bənzəyir. Amma az keçmir ki, mühitin, ətrafdakıların, xüsusilə də bu mühitdə rəhbərlik edən liderin fəaliyyəti nəticəsində qol-budaq ataraq, çayır sürətlə yayılıb ətrafındakıları məhv etdiyi kimi, insanın sağlam düşüncə qabiliyyətini məhv edir.

Əl-Qəzali dini fanatizmin dinin özünə və insanlara vura biləcəyi ziyanı əvvəlcədən görürdü. Ona görə də radikallığa qapılaraq hətta onların öldürülməsini tələb edirdi. Bu, səbəbsiz deyildi. Bəşəriyyətin keçdiyi tarixi yola nəzər salsaq, fanatizmin təzahür forma və məzmunundan asılı olmayaraq, milyonlarla insanın məhvinə səbəb olduğunun şahidi olarıq. Qəribə və təəccüblüsü odur ki, bir-birinə düşmən kəsilən təriqətlərin imamları mövcud ideyalara zaman-zaman siyasi məqsədlərinə uyğun forma yenilikləri gətirməyə çalışsalar da, məzmunca heç nə əlavə edə bilməmişlər. Lakin buna baxmayaraq, cəhalət içərisində çabalayan geniş kütlələri idarə etməyə nail olmuşlar və indi də olmaqdadırlar. Çünki təbiətcə müəyyən dərəcədə ətalətli olan adəm övladı biliklərə yiyələnmək əziyyətinə meyl göstərməmişdir. Əksəriyyət tarixi söhbətlərə, hədislərə, moizlərə qulaq asmağı fərdi mütaliədən üstün tutmuşdur. Bu, indiki dövrdə də belədir. Ən təhlükəlisi isə odur ki, gənclər arasında eşitdiyini əqlinin təfəkkür süzgəcindən keçirməyə meylli olanlar çox azdırlar.

Əl-Qəzalinin kitabda təqdim olunun əsərlərinin Azərbaycan dilinə tərcüməsi heç də təsadüfi deyil. Məqsədimiz zəmanəmizdə islamın müxtəlif ekstremist cərəyanlarına meyl edən, onların fəsadına mübtəla olan, ata-ana sözündən, nəsihətlərindən kənarda qalan, özünü valideynlərindən ağıllı sayan beyniqanlı gənclərimizə ən mütərəqqi, bəşəri din sayılan İslamın qanunlarını bu dini onlardan qat-qat dərin bilən misilsiz teoloqun dili ilə anlatmaq, onları əsl islami haqq yoluna dəvət etmək istəyi olmuşdur.

**İsa Nəcəfov**
*Konstitusiya Məhkəməsinin hakimi*

*Sənin olan yalnız*
*gəmi qəzaya uğradıqda*
*itirə bilməyəcəyindir.*

Əbu Həmid əl-Qəzali

# Əbu Həmid əl-Qəzali
# (1058-1111)

*Qədirbilən müasirlərinin «dinin həyatvericisi», «islamın sübutu» adı verdikləri Əbu Həmid əl-Qəzalinin mənəvi irsi islam aləminin mənəvi mirasının ayrılmaz tərkib hissəsi olmaqdan əlavə, bəşəriyyətin özünüdərkində əsas özüllərdən və məxəzlərdən biridir. Çünki əl-Qəzalinin ideoloji evolyusiyası prosesində təkcə Xilafət mədəniyyətinin nailiyyətləri deyil, həm də onun yaratdığı hər şeyi əhatə edən ideoloji sistemdən əvvəlki antik intellektual ənənənin taleyi, onun bu beş əsrlik müddətdə qavranılmasının yekunları əks olunub.*

*Əl-Qəzali keçmişin digər böyük mütəfəkkirləri kimi, sxematik bioqrafiyaların və tərcümeyi-halların qurbanı olaraq şəxsi həyatdan «məhrum edilmişdir». Qəzali ilə bağlı həqiqi məlumatlar onun tərəfdarları və bir o qədər də qızğın əleyhdarlarının dəyərləndirmələri altında itib-batmışdır. İstorioqrafların əsərlərində, ensiklopediyalarda, tərcümeyi-hallarda, xüsusi olaraq ona həsr edilmiş kitablarda, əsərlərinin təbdil və təfsirlərində, onların tənqidinə və təkzibinə dair yazılarda onun həyatı ilə bağlı gerçəkliklər, bioqrafik məlumatlar, mühakimələr isə, əsasən, bu haqda yazanların subyektiv qənaətləri və təsəvvürləri çərçivəsindən kənara çıxmır. Buna səbəb onun mütləq ideyaya doğru yüksələn mənəvi evolyusiyasının dramatizmi olmuşdur və Qəzali bilərəkdən bu evolyusiyanın əsirinə çevrilmişdir.*

*Əl-Qəzali üçün şəxsiyyətin həyat yolu ətrafı üçün əhəmiyyət daşıyan düzüm deyil, mənəvi inkişafın faktologiyası, özünütəsdiqin və özünü aşkarlamanın zahirdə forma alması kimi əhəmiyyətlidir. Bununla o, şəxsiyyətin mənəvi təkamülünü Xilafət mədəniyyətinin Məhəmməd Peyğəmbərdən (s) hicrətin altıncı əsrinədək (XI əsrədək) bərqərar olması prosesinin, onda gedən və bilavasitə özünün də iştirak etdiyi idraki evolyusiya axınını fərqləndirməklə, daxili tələbinə bağlamışdır. Bu, sufizmə gətirib çıxaran və düşüncəyə qayıdan yolda və peyğəmbərliyin mahiyyətini anlamaqda onun önündəki pərdəni qaldıran prosesdir. Bu prosesdə o, haqq-ədalətin bərpasının təməlini görürdü.*

*Xəlifənin onun Bağdada qayıdıb «elm məşəlini» gücləndirmək və onlarla Allah yolunda birləşmək barədə xahişinə son cavablarından birində əl-Qəzali deyirdi:*

*«İndi İraqa yollanmaq deyil, daha çox həyatla vidalaşmaq vaxtıdır. Allaha gedən yol isə istər Tusdan olsun, istər Bağdaddan, eynidir».*

*Təbii ki, əl-Qəzali «həyati məkan» və asudə vaxt olmadan daxili azadlığa yetə bilməzdi. Məhz bunlar dərketmədə təmizliyi şərtləndirmiş və buna şərait yaratmışdı. Bu da təkcə onun ideya «əməllərinə» deyil, bütün İslam aləminin beş əsrlik intellektual evolyusiyasına, neçə-neçə dövrdəki xadimlərin siyasi və mənəvi çarpışmalarına yekun vurmuşdur. Avtoritar təzahürlərin öyrənilməsi əl-Qəzalinin qarşısına yalnız onu ibadətkarlıq praktikasına görə deyil, həm də dinin ideoloji əsasları üzrə tənqidini də qoymuşdu. O, həqiqət kriteriyalarını yaşayışın sosial-tarixi şərtlərindən kənarda axtarsa da, onu elmin zəruri qaynağı statusundan da məhrum etmirdi. Mövcudolma şərtlərinin hüdudlarından çıxmaq həqiqi xarakterli bilik kriteriyaları axtarmaq deməkdir. O, «Yanlışlıqlardan xilas edən» adlı əsərində səhih biliyi axtarışların məqsədi kimi xarakterizə edərək yazırdı: «Bu elə bilikdir ki, dərk oluna biləni heç bir şübhə yeri qoymadan bizim üçün məlum edir və qeyri-dəqiqliyə, illüziyaya heç bir imkan saxlamır. Bu elə bilikdir ki, burada səhvlərdən müdafiə mütləq həqiqətə uyğun olmalıdır».*

*O, bundan çıxış edərək öz dövrünün dini-siyasi güclərinin nəzəriyyələrini kəskin tənqid edirdi. Ənənəvi inamlardakı sadə avtoritar formaların nümunəsində əl-Qəzali bu formaların «rasional» mülahizələrə, biliklərə və spekulyativ dəlillərə necə yol tapmasının sirrini açmışdı. Bununla o, əqlin necə özünüaldatma alətinə, yalanın və apoloqetikanın (hakimiyyətin uzurpasiyası, təkəbbür, yalan, başqalarının hesabına varlanmaq, təriqət fanatizmi və s.) «rasionalizasiyası» vasitəsinə çevrildiyini göstərirdi.*

*O, hər bir elmin əzəli əsaslarına qayıtmaq vəzifəsini qoyurdu. Şeylərə onlar özlüyündə necə varsa, elə də baxmağın vacib olduğunu söyləyirdi və bunu söyləyəndə də fitri keyfiyyətlərlə bağlı təsəvvürlərə söykənirdi.*

# ÖN SÖZ

Hakimiyyət və dövlət haqqında fikirlər əl-Qəzalinin mənəvi və ideoloji irsinin böyük bir qismini təşkil edir. Böyük filosofun axtarışları onu belə bir fikrə gətirmişdi ki, «siyasətin hökmü aristokratiyaya, sadə xalqa və bütün zahirdə olanlara çatsa da, batini, gizli olan bu hakimiyyətdən kənardır» [1]. Bu ideyanın kökü imaməti (dövlət və hakimiyyəti) vacib hesab edən islam nəzəri və elmi irsindən qaynaqlanır. Bu vacibliyi şeylərin özünün mövcud olma məntiqi şərtləndirir. Bu da əslində «İlahi mövcudiyyət qanunu»ndan başqa bir şey deyil və o, həm kainatdakı bütün şeylərin stabil mövcud olma qanunauyğunluqlarına, həm də Allahın onda yaratdığı xaosu (yaranma və məhv olma) əhatə edir. Bu, kəlam[2], fəlsəfə və fiqh elmlərinin zəngin ənənəsinə söykənən məntiqə uyğun dünyəvi bir konsepsiyadır. O, hələ sufi olmamışdan əvvəl yazdığı əsərlərində, ələlxüsus da «Əqidədə mötədillik» və «Batinilərə cavab»da müzakirə və tədqiq etdiyi problemlərə prioritet verirdi. «Dini elmlərin dirçəlişi» («İhyai-ulum id-din») kitabında Qəzali hakimiyyətin mahiyyətinin kompleks fəlsəfi konsepsiyasını təqdim edir, onun ideal nümunəsinin təsvirini verir, xilafətin siyasi tarixindəki hadisələri tənqidi şəkildə öyrənir və onun, öz terminologiyasından çıxış etsək, «siyasi dərəcələrinə» görə bölgüsünü aparır. «Dərəcələr» və yaxud siyasətin ümumi tipləri isə dörddür:

Peyğəmbərlərin siyasəti və onların hakimiyyəti: aristokratiyaya, sadə xalqa, bütün zahiri olana çatır, lakin batini, gizli olana çatmır.

Xəlifələrin, padşahların və sultanların siyasəti: onların hakimiyyəti də aristokratiyaya, sadə insanlara, zahiri olana çatır, lakin batini, gizli olana çatmır.

Üləmaların (islam alimlərinin) siyasəti və onların hakimiyyəti: aristokratiyaya çatır, sadə xalqa çatmır, gizli və batini olana çatır, lakin zahiri olana çatmır.

---

[1] Uyğun olaraq : xass, ammə, zahir, batin.

[2] Terminlərin izahı kitabın sonundakı predmet göstəricisində verilib.

Təbliğçilərin siyasəti və onların hakimiyyəti: sadə xalqa çatır, aristokratiyaya çatmır, zahiri olana çatır, batini olana çatmır.

Beləliklə, əl-Qəzali siyasi dini hakimiyyətin birbaşa dini funksiyasını onun əlindən alır və həmçinin batini olanı (ruh haqqında düşüncəni) onun nəzarətindən azad edir. O, hakimiyyətin işini yalnız cəmiyyətdə vətəndaş münasibətlərinin (aristokratiya ilə sadə xalq arasında) nizamlanması ilə məhdudlaşdırır. Yəni hakimiyyətin və dövlətin vəzifəsi ümumi (sadə xalq və aristokratiyanın) maraqların dərki və realizasiyası üzərində qurulan qanuna (fiqhə və şəriətə) uyğun hərəkət etməkdir. Yəni hakimiyyətin vəzifəsi dövlətdə və cəmiyyətdə vahid sosial qanunverici məkan yaratmaqdır.

Əl-Qəzali özünün «Hakimiyyətin ilahi aspektləri» adlandırdığı anlayışı fəlsəfəsinə daxil etməklə bu fikri məntiqi sonluğunadək inkişaf etdirmişdir. Onun konsepsiyasına görə, hakimiyyət və hakimiyyətə can atmaq «ilahiliklə» öz formasına görə uyğundur, lakin əgər hakimiyyət əxlaqi qaydalara əksdirsə, məzmunca ziddir. Hakimiyyət məhz əxlaqa bağlı olduqda «müqəddəs» məna kəsb etmiş olur, bu olmadıqda isə təkəbbürlülük yolunda zorakılıq mexanizminə çevrilir. Sonuncu hal hakimiyyətin mənasının və əsas vəzifəsinin nədən ibarət olduğunu bilməməkdən irəli gəlir. Halbuki məhz bunlar bütün yaranmış dövlətlərdə və cəmiyyətlərdə tarazlığın və ədalətin mühafizəsindədirlər.

Yuxarıda sadalanan ideyaların oxucunun hisslərinə, dərrakəsinə və fantaziyasına yaxın olsun deyə «məsləhətlər» formasında verilməsi, əxlaqi nöqteyi-nəzərdən yüksək yaradıcılıq nailiyyətidir. Nə qədər ki, dövlət və hakimiyyət mövcuddur, onlar öz dəyərini itirməyəcəkdir.

Əl-Qəzali bu həqiqəti çox gözəl bilirdi ki, hakimiyyət insanla heyvani instinktlərlə davranır, amma onu siyasi nərdivanla göylərə də qaldıra bilər. Hakimiyyət yaxşıya doğru irəlilədikdə (islahatlar apardıqda) «ilahiliyə» oxşayır, təkəbbürlü olduqda isə «ilahiliyi» inkar edir. Yəni hakimiyyət özündə həm xeyiri, həm şəri, həm gözəlliyi, həm çirkabı, həm həyatı, həm ölümü daşıyır. Bu səbəbdən əl-Qəzali ilahiliyi – insani, siyasəti – əxlaqi etməyə çalışır. Məhz bu səbəbdən o, «Hökmdarlara nəsihət»də yazırdı: «Sultanın qulu olan qul – yalnız metaforadır, amma bax, sultan – həqiqətən Allahın quludur».

Əl-Qəzali belə hesab edirdi ki, hökmdarın əsl hakimiyyəti onun zahiri atributlara yiyələnməsində deyil, hakimiyyətin batini,

aşkarda olmayan mahiyyətini – onun əsl mənasını dərk etməsindədir. Əgər insanda əsl hökmdarın həm xarici, həm də daxili cizgiləri birləşibsə, onu heç kəs hakimiyyətə dəvət etməsə belə, o, elə hökmdardır. Əks halda, hətta bütün cahan onu öz ağası adlandırsa belə, bunlarsız o – əsirdir. Buna görə də əl-Qəzali belə hesab edirdi ki, əsl hökmdara hər şeydən əvvəl öz «daxili ordusuna» – instinktlərinə, qəzəbinə, hiyləsinə və s. sahib olmaq vacibdir. Böyük filosof göstərmək istəyirdi ki, hakimiyyətin qarşısında yalnız bir vəzifə durmalıdır. Bu vəzifə də onun nə üçün yarandığıdır, yəni bütün dünyaya xeyir verməsidir. Bu səbəbdən əl-Qəzali sultana müraciətlə deyirdi ki, Allah ona hakimiyyət əta edib, inam toxumunu köksünə səpərək onu itaət suyu ilə suvarmağı ona görə əmr etmişdir ki, bu toxumdan kökləri yerin dərinliklərinə, budaqları uca göylərə yetən ağac boy atsın.

«Hakimiyyətin kökləri dərinliklərdə, budaqları göylərdədir» – bir simvolik obrazdır. Bu müqayisə bir tərəfdən dövlətin ədalət və ictimai tarazlığın qurulması istiqamətində fəaliyyəti, digər tərəfdən isə dövlətin varlığının əsasları arasında vəhdətin vacibliyini göstərir. Bunları əl-Qəzali hakimiyyətlə qarşılıqlı əlaqələndirirkən obrazlı şəkildə «inam ağacının kökləri» adlandırır. Bu köklər hər bir insanı əzəli başlanğıcdan cəmiyyətə və dövlətə bağlayır. Əl-Qəzali ehkamlar yaratmır, insan təbiətini əhliləşdirməyə çalışır. Elə yolla əhliləşdirməyə çalışır ki, bu yol həm hakimiyyətin və dövlətin dünyəvi əsaslarının möhkəmlənməsinə xidmət etsin, həm də onları əxlaqa və imana istinada gətirib çıxarsın. Başqa sözlə, əl-Qəzali Mütləqin müxtəlif ənənə və kriteriyalarına söykənərək əxlaqla siyasətin vəhdətini ortaya qoymaq istəyir. Bu vəhdətin qarşısında duran məqsədlər, habelə onun yaratdığı stimullar bu günü belə içinə almaqla cahanşümul əhəmiyyət kəsb edir. Dəqiq desək, dinc dövlət və cəmiyyət quruculuğu ilə bağlı dəyişməz əxlaqi dəyərlər öz gücündə qaldıqca onların əhəmiyyəti də azalmayacaqdır.

*Rəhman və rəhmli olan Allahın adı ilə!*

Şeyx, imam, dinin bəzəyi, islamın nüfuz sahibi, imamların adlı-sanlısı Əbu Həmid Məhəmməd ibn Məhəmməd əl-Qəzali ət-Tusi, Allah ondan razı olsun, Sultan Məhəmməd ibn Məlikşaha[3], Allah ona rəhmət eləsin, müraciətlə deyirdi:

Ey aləmin sultanı, məşriq və məğribin padşahı, sənə məlum olsun ki, Allah sənə aşkar lütfkarlıq göstərmiş və çox şeylər bəxş etmişdir. Buna görə sən ona minnətdar olmalı, bunları bəyan edib hamıya bildirməlisən. Kim ki Allah-təalaya, Ona həmd olsun, şükr etməzsə, həmin bəxş olunanlara zərər və ziyan yetirmiş olar və qiyamət günü öz naşükürlüyündən xəcalət çəkər. Ölümlə birlikdə yox olan cahü-cəlal ağlı olan üçün qiymət, bəsirəti olan üçün əhəmiyyət kəsb etməz. Çünki ömür nə qədər uzun olsa da, sona yetdikdə təkcə uzun olması baxımından fayda gətirməz. Nuh Əleyhissəlam belə min ildən yuxarı yaşamasına baxmayaraq, indi - beş min il ölümündən sonra heç elə bil olmamış kimidir.

Yalnız o lütfkarlıq dəyərlidir ki, o, həmişə- bütün gecələr və gündüzlər qalacaqdır. Bu lütfkarlıq isə əbədi xoşbəxtliyin və sonsuz firavanlığın səbəbi olan Allaha inamdır. Və Allah sənə bu lütfkarlığı göstərmişdir; qəlbində iman toxumunu cücərtmiş, sənə istiqamət vermişdir.

O, bu toxumu cücərtməyi və onu itaət suyu ilə suvarmağı sənə həvalə etmişdir ki, həmin toxum kökləri yerin dərinliklərində, başı göylərdə ağaca çevrilsin. Böyük və Qadir Allah buyurmuşdur: *«Məgər Allahın necə bir məsəl çəkdiyini görmürsənmi? Xoş bir söz (la ilahə illallah, Muhəmmədin rəsulullah) kökü yerdə möhkəm olub budaqları göyə ucalan gözəl bir ağac kimidir» (Quran, 14:24).*

Əgər etiqad Ağacın köklərini möhkəmlətməz, budaqlarının boy atmasına yardım etməzsə, onda şiddətlə əsən ölüm küləkləri və yoxluq fırtınası onun üçün təhlükəli olar və qulun son nəfəsi ilə yerindən qopub düşər. Və bu qul, Allah bizi bundan saxlasın, imanın itirər və rəbbi qarşısına əliboş çıxar.

---

[3] Peyğəmbərlər də daxil olmaqla, tarixi şəxsiyyətlərə aid qısa məlumatlar kitabın sonundakı adlar göstəricisində verilib.

Ey sultan, sənə məlum olsun ki, bu Ağacın on kökü və on budağı vardır. Onun birinci kökü ruha və qəlbə inam, birinci budağı isə cismani fəaliyyətdir.

O, bundan sonra ali məclisdə razılıqla qarşılandığını görüb həmin on kökün və on budağın mənalarını izah etdi ki, aləmin sultanı bu ağacı bəsləyib böyütməklə məşğul olsun. Həqiqətən də, əgər sultan heç olmasa həftədə bir gün tənhalığa çəkilib Allaha ibadət etsə və axirəti üçün savab işlərlə məşğul olsa, o, istəyinə çatmış olar. Həmin gün isə cümədir, çünki cümə möminlərin bayramıdır və onda elə bir səadət saatı vardır ki, hər kim səmimi qəlbdən və açıq ürəklə Böyük Allahdan nə diləsə, O (Ona həmd olsun!), həmin şəxsin duasını qəbul edər və ona savab verər.

Nə olar ki, sən yeddi günün birini Allahına ibadətə həsr edəsən? Əgər sənin bir qulun olsa və sən ona həftədə bir gün sənin xidmətində durmağı əmr etsən və altı gün ərzində heç bir işə can yandırmayan bu qul sənə qulaq asmaqdan imtina etsə, sənin halın necə olar? Axı sən heç öz qulunu yaratmamısan! O yalnız şərti olaraq sənin qulundur!

Sən isə, ey hökmdar, Allahın (c.c.) yaratdığı və əsl qulusan. Sən öz quluna icazə vermədiyini özünə necə müsaid bilirsən?

Cümə günü nəfsinizə pəhriz saxlamağı qarşınıza məqsəd qoyun. Cümə axşamları da belə etsəniz lap yaxşı olar. Gümə günü səhər durub qüsl edin, elə paltar geyinin ki, özündə üç əlamət daşısın. Yəni gözəl olsun, onda ibadət etmək mümkün olsun və o, ipək və ya zərli parçadan olmasın. Bu keyfiyyətlərdən uzaq geyimi Allah bəyənməz.

Səhər namazını (səlat əl-fəcr) camaatla birgə qıl. Bundan sonra gün çıxanadək danışma və qiblədən başqa yerə baxma. Əlinə hesab taxtası al və min dəfə: «La ilahə illəllah və Muhəmmədin rəsulullah» (Allahdan başqa allah yoxdur və Məhəmməd onun rəsuludur),- de. Gün çıxandan sonra qarelərə əmr et ki, bu kitabı (Quranı) sənin üçün oxusunlar. Qoy qare hər cümə günləri sənə Quran oxusun və bu, sənin yaddaşında qalsın. Elə ki, qare oxuyub qurtardı, dörd rükət namaz (səlat) qıl, Allaha həmd et. Çünki bu ibadətin, ələlxüsus cümə ibadətinin mükafatı böyükdür.

Bundan sonra harada olsan, İslam taxtında və ya təklikdə, həmişə: «Allahın Məhəmmədə xeyir-duası və salamı olsun!»,- deyə təkrar et. O gün nə qədər bacarırsan, o qədər lütfkarlıq göstər. Həftənin bu gününü Allah-təalaya həsr et ki, O, həftənin digər günlərini bu gününə bağışlasın.

# İMAN AĞACININ RİŞƏLƏRİNİN XATIRLANMASI

**Birinci rişə. Dini əsasların başlanğıcı**

Ey sultan, bil ki, sən yaradılmışsan və səni yaradan var. O, bütün aləmi və onda olan hər şeyi yaradandır. O, birdir, şəriki yoxdur, vahiddir, bənzəri yoxdur. O, əzəli olandır (fi əl-əzəl) və Onun mövcudiyyətinin sonu yoxdur. O, əbədiyyən mövcuddur və onun mövcudluğu pozulmazdır. Onun vücudunun başlanğıcı və sonunun olmaması vacibiyyətdir və yoxluq Ona yaxın düşə bilməz. O, özü-özlüyündə mövcuddur, hər şey Ona möhtacdır, O isə heç nəyə və heç kimə möhtac deyil. Onun mövcudiyyəti özüdür və O, bütün mövcudiyyətin səbəbidir.

**İkinci rişə. Qadir və Ulu Yaradan haqqında**

Bil ki, adı böyük və uca olan Yaradan nə obrazdır, nə də forma. O heç bir formaya sığmaz və yerləşməz, «necə?», «nə qədər?», «nə?», «niyə?» kimi suallar Ona aid deyil. Onun ağıla gələ biləcək heç bir şəkli və bənzəri yoxdur. Çünki bunlar yaradılmışlara xasdır. O isə Yaradandır və bu keyfiyyətlər Onda ola bilməz.

O, laməkandır, çünki heç haraya sığışmaz və bütün aləm Onun taxtının, Onun hökmünün altındadır, Ona tabedir. O, Ərş yaranmamışdan hələ məkandan yüksəkdə olmuşdur. Taxt (Ərş) Onu deyil, Onun rəhmi, aliliyi və qüdrəti Ərşi saxlar.

Onun məkana ehtiyacı yoxdur və O, bundan yüksəkdədir; Ərş yaranmazdan bu belə olub və yaranandan sonra da belədir. Əvəzlənmə və ya dəyişmələr Onun keyfiyyətinə təsir etməz. O, xilqətə aid xüsusiyyətlərdən yüksəkdədir və onlardan uzaqdır. Hələ ki biz yer aləmindəyik, Onun haqqında yalnız bilgiyə malikik. O biri dünyada O, bizə bu dünyada nəyəsə bir şeyə baxdığımız kimi adi görünməyəcək. Biz Onu gələcək həyatda bənzəri və tayı-bərabəri olmayan şəkildə görəcəyik, çünki gələcək həyatdakı müşahidəçilik yerdəki həyatda olan seyrə bənzəməz.

Onun oxşarı yoxdur, O, hər şeyi eşidən, hər şeyi görəndir.

**Üçüncü rişə. Qüdrət haqqında**

O, hər şeyə qadirdir və Onun qüdrət və hakimiyyəti mükəmməlliyin son həddidir. O zəiflənməz və əskilməz, əksinə, nə istəyibsə edib və nə istəsə edə bilər. Yeddi qat göy, yeddi qat yer, həmçinin Səltənət və Taxt-tac Onun qüdrətinə və Onun iradəsinə

tabedir. Hər şeyin hakimi Odur və Onun hakimiyyətindən başqa hakimiyyət yoxdur.

**Dördüncü rişə. Bilik haqqında**

O, hər şeyi biləndir və Onun Elmi hər şeyi əhatə edir. Yerlə göy arasında elə bir şey yoxdur ki, O, bunu bilməsin. Çünki hər şey Onun Elmi sayəsində baş verir və Onun Qüdrəti sayəsində yayılır. Və O – hər şeydən uca olan, səhradakı qum dənəciklərinin, ağac yarpaqlarında yağış damcılarının sayını, gizli fikirləri və küləklərin nədən əsdiyini biləndir. Göylərdə olan ulduzların sayı da Ona bəllidir.

**Beşinci rişə. İradə**

Həqiqətən, dünyada olan hər şey Onun İradəsi və Onun istəyi ilə mövcuddur. Və balaca-böyük hər şey – xırda və iri, yaxşı və pis, xeyir və zərər, artım və itki, asudəlik və yorğunluq, sağlamlıq və xəstəlik Onun yaratdığı nizam daxilindədir, Onun istəyinə tabedir və hikməti-ilahiyə uyğun baş verir. Əgər bütün insanlar, cinlər, mələklər və şəyatin bir yerə yığılsa, Onun İradəsi, Qüdrəti və Qüvvəsi olmadan, bircə zərrəni belə yerindən tərpətməyə, saxlamağa, böyütməyə və ya kiçiltməyə qadir deyil. O, nəyi istəsə və necə istəsə o da olacaq. Olmuş, olan və ya gələcəkdə olacaq heç bir şey Onun iradəsinə qarşı dura bilməz, çünki hər şey Onun ixtiyarında, sərəncamında və itaətindədir.

**Altıncı rişə. Onun hər şeyi eşidən və hər şeyi görən olması haqqında**

O, eşidilə bilən hər şeyi eşitdiyindən və görünə bilən hər şeyi gördüyündən Onun eşitməsi üçün yaxın və ya uzaqlığın, Onun görməsi üçün işığın və qaranlığın fərqi yoxdur. O, gecənin zülmətində sürünən qara qarışqanı görür. Onun üçün gizli qalan heç nə yoxdur. Soxulcanın yer altında hərəkətindən doğan səsi belə eşidəndir. O, qulaq vasitəsilə eşitməz və göz vasitəsilə görməz. Onun Elmi düşüncəsindən törəməz və Onun hərəkət üçün alətə və ya vasitəyə ehtiyacı yoxdur. Nəyə «Ol!» desə, o da olar.

**Yeddinci rişə. Nitq haqqında**

Onun əmrləri bütün yaradılışa şamildir və onlar üçün mütləqdir. Onun verdiyi vədlər və Onun təhdidi əsl həqiqətdir. Onun

əmrləri – Onun kəlamlarıdır. O, hər şeyi bilən, arzulayan, eşidən və görəndir. O danışa biləndir, amma Onun nitqi, boğaz, dil, ağız və dişlər vasitəsilə yaranan danışıq deyil.

Quran, Tövrat, Zəbur, peyğəmbərlərə (onlara salam olsun) göndərilən kitablar Onun kəlamlarıdır. Onun nitqi – Onun sifətidir. Onun bütün sifətləri isə əbədidir, daimidir. İnsanın nitqi hərflər və səslərdir, Allah-təalanın nitqi isə mübarəkdir, hərf və səslərdən yüksəkdədir.

**Səkkizinci rişə. Onun - Allah-təalanın fəaliyyəti haqqında**

Dünyada nə varsa, Onun tərəfindən yaradılmışdır və Ona şərik heç bir yaradıcı yoxdur. O – yeganə Xaliqdir. Çətinliklərin, qorxunun, kasıblığın, xəstəliklərin, qəbahətin də Onun tərəfindən yaradılmasına baxmayaraq, O, ədalətlidir. Onun əməlində haqsızlıq olmaz, çünki haqsız olan ona məxsus olmayana hökm edəndir. Böyük Yaradan isə Öz mülkünü idarə edir. Ondan başqa hakim yoxdur və nə olubsa, olur və olacaqsa, hamısı Onun mülküdür. O, bənzəri və şəriki olmayan hökmdardır və heç kim nə keyfiyyət, nə də kəmiyyət baxımından Ona qarşı dura bilməz. Ancaq O Özü hərəkətlərinə qərar verər və yerinə yetirər. Qalanlarına isə yalnız bunları olduğu kimi qəbul etmək, Onun işinə baxmaq və Onun verdiyi qərarla razılaşmaq qalar.

**Doqquzuncu rişə. O biri dünyanın (əl-axira) xatırlanması**

Allah-təala aləmi iki növdən – ruh və bədəndən ibarət yaratmış, bədəni ruhun məskəni etmişdir ki, o, bu dünyadan o biri dünyadakı həyat üçün ehtiyat yığsın. Hər ruhun bədəndə nə qədər qalacağını da O müəyyən edir. Bu vaxt bitəndə ruhun yerdəki həyatı da, ondan artıq və ya az olmadan, bitir. Ölüm saatı çatdıqda O, ruhu bədəndən ayırır. Amma ölünü qəbirə qoyduqda ruh Münkər və Nakirin[4] suallarına cavab vermək üçün yenidən bədənə qayıdır. Bu iki nəhəng və vacib varlıq ondan soruşurlar: «Rəbbin kimdir?», «Peyğəmbərin kimdir?». Əgər vəfat edən cavab verə bilməzsə, onda ona əziyyət verərlər və qəbrini ilanlar və əqrəblərlə doldurarlar.

Və hər şeyin müəyyən olunacağı, mükafat veriləcəyi, hər kəsin mühakimə edilib əməlinə əvəz alacağı Qiyamət günü ruh bədənə qayıdır, səhifələr paylanır və o insanın əməlləri hamının

---

[4] Münkər və Nakir – qəbirdə insanı sorğu-sual edən iki mələk.

diqqətinə verilir. Hər bir insan öz kitabına baxaraq bu dünyadakı işlərini və əməllərini görür, nə dərəcədə itaətkar və günahkar olduğunu dərk edir. Sonra insanın əməlləri mizan-tərəzidə ölçülür. Bundan sonra ona tükdən nazik, ülgücdən iti Sirat körpüsündən keçmək əmr olunur. Kim ki bu dünyada doğru yolda olub saleh əməllərə malikdir və düzgün həyat tərzi keçirib o, Sirat körpüsündən sakit və asan keçəcək. Amma bəyənilən həyat tərzi keçirməyən, xeyir əməl sahibi olmayan və Rəbbinə itaət etməyib öz nəfsinin əsirinə çevrilən şəxslər Sirata yol tapmayacaq, ondan keçə bilməyib Cəhənnəmə düşəcək.

Hamını Siratdan keçmək, öz əməllərinə görə cavab vermək gözləyir. Haqlı olanlar öz haqqını alacaq, yalançılar və müştəbehlər sınağa çəkilib ifşa olunacaqlar.

Bəzi adamlar sorğu-sualsız Cənnətə daxil olacaq, bəziləri zəif sorğu-sual ediləcək və onlara qarşı nəzakətli davranılacaq. Bəziləri isə suallara cavab verməkdə çətinlik çəkəcək, mübahisə etməli və inandırmalı olacaq. Sonra kafirləri heç bir xilas yolu olmayan Cəhənnəmə tökəcəklər. Mömin müsəlmanlar Cənnətə daxil olacaq, günahkarların isə Cəhənnəmə atılması əmr olunacaq. Peyğəmbərlərin, alimlərin, ən təmiz əxlaq sahiblərinin və Allaha yaxın olan qullarının müdafiə etdikləri insanlar əfv olunacaq. Müdafiə olunmayanlar öz günahı dərəcəsində cəzalandırılacaq və öz cinayətləri dərəcəsində əzab çəkəcəklər. Əgər o, bu dünyada imanını itirməmişsə, bunlardan sonra Cəhənnəmdən çıxıb, Cənnətə daxil olacaq.

**Onuncu rişə. Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, xatırlanması**

Allah hər şeyi qabaqcadan müəyyənləşdirərkən elə etmişdir ki, insanın fəaliyyəti, onun vəziyyəti, əməlləri fərqlənsin. Bunların bəzisi onun bədbəxtliyinin, bəziləri isə xoşbəxtliyinin səbəbidir. İnsan bunlar barədə öz istəyi ilə xəbər tuta bilməz.

Bundan sonra Allah Öz Rəhmi, Qüdrəti, Alicənablığı və Əməli-salehliyinin gücü ilə mələkləri xəlq etdi. Və onları əzəldən xoşbəxt olmasına qərar verdiyi kimsələrə – peyğəmbərlərə elçi göndərdi. Peyğəmbərləri isə insanlara göndərdi ki, onlara bədbəxtlik və səadət yollarını göstərib başa salsınlar ki, onlar da Allah qarşısında nahaq əməllərinə haqq qazandıra bilməsinlər. O, bizim peyğəmbərimiz Məhəmmədi, ona Allahın xeyir-duası və salamı

olsun, son peyğəmbər olaraq göndərdi və onu özünün elçisi və yol göstərəni etdi. Onun peyğəmbərliyini elə səviyyədə kamil etdi ki, daha bundan artığına yer qalmadı. Bu səbəbdən Allah-təala onu xatəmül-ənbiya, ona salam olsun, seçdi.

## İMAN AĞACININ BUDAQLARININ XATIRLANMASI

Ey sultan, bil ki, insan qəlbində hər dəfə baş qaldıran biliklər və fikirlər imanın kökləridir. Amma itaətkarlığın və ədalətin təzahürü olaraq onun bədəninin yeddi üzvü vasitəsilə gerçəkləşənlər isə imanın budaqlarıdır. Budağın saralıb-solması kökün zəifliyindən və onun ölüm qarşısında dayana bilməyəcəyindən xəbər verir. Bədənin fəaliyyəti – qəlbdəki inamın işarəsidir. İmandan törəyən əməllər isə haram buyurulandan nəfsini saxlamaq, Allahın göstərişlərinə əməl etməkdir. Bunlar isə iki cür olur: birincisi, səninlə Böyük Allah arasında olandır. Məsələn, oruc tutmaq, namaz, zəkat, şərab içməmək kimi. İkinci isə səninlə ətrafındakılar arasında olandır. Məsələn, təbəələrinə qarşı ədalətli olmaq, onları istismar etməmək kimi. Birincidə əsas olan Onun əmrlərinə tabe olmağın, Onun icazə vermədiyindən çəkinməyindir. Və sənin ona münasibətin, sənin qullarının sənə necə münasibət bəsləməsini istədiyin kimi olmalıdır. İkinci, sənin insanlara münasibətin əgər sən qul, başqası sultan olsa, onun sənə necə münasibət bəsləməsini istədiyin kimi olmalıdır.

Və bil ki, səninlə Böyük Yaradan, Ona həmd olsun, arasında baş verənlərdə Onun səni bağışlaması çox asandır. Amma O, səni insanlara qarşı haqsızlığa görə Qiyamət günü əfv etməyəcək. Bu, böyük təhlükədir.

Doğru-düzgün, ədalətli rəftar etməyən hökmdarların heç biri cəzadan yayına bilməz. İş bu yerə gəldikdə ən vacib məsələni – ədalətin əsaslarını izah edək. Sən bil ki, Qiyamət günü öz dünya həyatında nə dərəcədə düzgün və ədalətli olmağın barədə sorğu-sual ediləcəksən.

Adilliyin on əsası vardır.

## ƏDALƏTİN VƏ DÜZGÜNLÜYÜN ƏSASLARI

**Birinci əsas**

Birinci əsas, sənin hakimiyyətin onun mənasını başa düşməyin və təhlükəsini anlamağın üçündür. Həqiqətən, hakimiyyətdə olmaq bir qismətdir və ondan tam şəkildə, düzgün istifadə edəni sonsuz və ən böyük səadət gözləyir. Kim bunu bacarmasa elə müsibətə düçar olar ki, bundan da dəhşətli və amansızı yoxdur.

Hakimiyyətin zəruriliyi və təhlükəsi haqqında Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, buyurduğu buna sübutdur: «Sultanın bir gün ədalətli olması, yetmiş illik ibadətindən yaxşıdır».

Peyğəmbər əleyhissəlam buyurmuşdur: «Qiyamət günü Allahın taxtının kölgəsindən başqa, kölgələnməyə və sığınmağa bir yer olmayacaq. Onun kölgəsinə isə yalnız yeddi əməl sahibi sığına biləcək; öz təəbələrinə münasibətdə ədalətli olan sultan, Rəbbinə itaətdə böyümüş gənc, ürəyi həmişə, hətta bazarda olsa belə, məsciddə olan adam, Allah adına bir-birlərini sevənlərin hər ikisi, tənhalıqda Allahını zikr edən və axirət dünyası üçün az iş gördüyündən göz yaşı tökən insan, gözəl və eybsiz qadının dəvətini, ona meyli olsa belə, rədd edib: «Mən Allahdan qorxuram»,- deyən və sol əli belə sağ əlinin payladığı səxavətdən xəbərsiz olan».

Peyğəmbər əleyhissəlam daha buyurmuşdur: «Allaha ən yaxın və sevimli olan şəxs adil sultandır. Allahın ən çox xoşlanmadığı və Ondan ən uzaq olan isə ədalətsiz hökmdardır».

O daha sonra buyurub: «Məhəmmədin Ruhunun Sahibinə and olsun ki, adil sultana göylərdə onun bütün təəbələrinin əməlləri qədər savab yazılar. Onun hər duası yetmiş duaya bərabər tutular[5]. Belə olduqda qula şahlıq rütbəsi verib, onun həyatının bir saatını başqasının bütün həyatına bərabər etməkdən böyük mükafat yoxdur. Kim bu mükafatlandırıldığı vaxtın əhəmiyyətini dərk etməsə, qəddar olub, öz nəfsinə aludə olacaq. Və ən qorxulusu da Allahın onu özünün düşmənləri cərgəsinə keçirməsi təhlükəsidir».

Hakimiyyətin nə dərəcədə təhlükəli ola biləcəyini İbn Abbasın, Allah ondan razı olsun, nəql etdiyi də göstərir: «Bir dəfə

---

[5] Başqa əlyazmada «Yetmiş min duaya».

Allahın Rəsulu, ona Tanrının xeyir-duası və salamı olsun, Kəbə önündə keçirilən yığıncağa gəlir. Oradakılara Peyğəmbər əleyhissəlam belə deyir: «Qəyyumluğunuz altında və xidmətinizdə olanlarla bu üç şeydə belə davranın: əgər onlar sizdən mərhəmət umsalar – mərhəmətli olun; əgər sizdən onları mühakimə etmənizi istəsələr – ədalətli olun və sonuncu, dediyinizə əməl edin. Bunlara əməl etməyənə Allahın və mələklərin qəzəbi tutar və heç bir vacib, yaxud əlavə ibadət onu qaldıra bilməz».

Və o əleyhissəlam buyurub: «Hər kim iki rəqib arasında ədalətsiz mühakimə yeritsə, Allahın ona lənəti olsun!».

Peyğəmbər buyurub: «Qiyamət günü Allah üç adamın üzünə baxmaz; yalançı hökm sahiblərinin, zinakar qocanın və şöhrətpərəst kasıbın». Burada onların istəklərində həddini aşdıqları nəzərdə tutulur.

Rəsul əleyhissəlam bir dəfə öz məsləkdaşlarına buyurub: «Gün gələcək siz qərbi və şərqi fəth edəcəksiniz və onlar sizin əlinizdə olacaq. O yerlərin bütün hakimləri, Allahdan qorxan, möminlik yolun tutan və əmanəti geri qaytaranlar istisna olmaqla, Cəhənnəmə girəcəklər».

O buyurmuşdur: «Allahın öz qullarını tapşırdığı hakimlər içində onları aldadan, düz istiqamət göstərməyən və rəhm etməyənlərdən heç biri Cəhənnəmdən qurtula bilməyəcək».

O buyurmuşdur: «Hər kim ki müsəlmanlar üzərində hakimiyyətə sahibdir, ancaq onlarla öz doğmaları kimi davranmır, onun yeri artıq Cəhənnəmdir».

Allahın Rəsulu buyurmuşdur: «Mənim ümmətimdən ikisi mənim himayəmdən məhrum olacaq: despot hökmdar və zərərli yenilikləri və fanatizmi ilə dinin sərhədlərini aşan kəs».

Rəsul əleyhissəlam buyurub: «Allah bu beş adama qəzəb yetirər: təəbələri onun qarşısında bütün vəzifələrini yerinə yetirdikləri halda, onlarla ədalətli davranmayıb zülmdən qurtarmayan hökmdara; tabeliyində olanların güclü (haqlı), gücsüz (haqsız) olmasına görə deyil, uostluğa və hüsn-rəğbətinə görə qərarlar verən müdirə; arvad və uşaqlarını Allaha ibadət etməyə çağırmayan, onlara dinin buyurduqlarından məlumat verməyən və ruzisinin haradan gəldiyinə əhəmiyyət verməyən ailə başçısına; tutduğu işçiyə iş görüləndən sonra pulunu ödəməyən adama; öz arvadı və onun cehizi ilə insafsız davranan adama».

Belə nəql edirlər ki, Ömər ibn əl-Xəttab əl-Fəruq, Allah ondan razı olsun, bir dəfə dəfn mərasimində iştirak edirmiş. Bir kişi irəli çıxıb cənazə namazı (səlat əl-canazə) qılır, meyiti qəbrə qoyduqdan sonra əlini məzarın üstünə qoyub deyir: «İlahi, əgər sən ona cəza versən, bu, Sənin haqqındır, çünki o, Sənə itaətkarlıq göstərməmişdir. Əgər Sən onu əfv etmək istərsənsə, onun, həqiqətən, Sənin rəhminə ehtiyacı var. Ey mərhum, əgər sən hökmdar, rəis, xəttat, qəddar və vergi toplayan olmamışsansa, xoşbəxtsən». Bundan sonra o kişi adamların gözündən itir. Ömər ibn əl-Xəttab əmr edir ki, onu tapıb gətirsinlər. Lakin o adamı heç yerdə tapa bilmirlər. Onda Ömər (Allah ondan razı olsun) buyurur ki, o şəxs Xızır əleyhissəlam imiş.

Peyğəmbər, Allahın ona xeyir-duası və salamı olsun, buyurub: «Vay halına hökmdarların, rəislərin və qəddar adamların, Qiyamət günü onları göydən asacaqlar və onları Cəhənnəmdə üzü üstə elə sürüyəcəklər ki, yer həyatında elədikləri əməllərə peşiman olacaqlar».

O buyurmuşdur: «Hər kim ki on nəfərin qəyyumu olmuş (lakin onlarla ədalətli rəftar etməmişsə), onu Qiyamət günü əlləri boynuna zəncirlənmiş gətirəcəklər. Əgər onun yaxşı əməlləri olubsa, zəncirləri açacaq, yox əgər yoxdursa, daha da ağırlaşdıracaqlar».

Əli ibn Abu Talib, Allah ondan razı olsun, buyurub: «Göylərdəki Hakimlə görüşəndə vay olsun yerdəki hakimlərin halına. Yalnız ədalətli olan, şəxsi marağına görə yox, haqq adına qərar verən, qohumbazlığa meyl etməyən, qorxu və ya tamaha görə qərarını dəyişməyib Allah Kitabını özlərinin əməlləri üçün ayna seçən və onu əsas tutmaqla qərar verən hakimlər bu müsibətdən kənar olacaqlar».

Rəsul əleyhissəlam buyurub: «Qiyamət günü hökmdarları Tanrının qarşısına gətirəcəklər və Allah, O, Böyük və Hər şeyə qadirdir, onlara buyuracaq: «Siz yerdə Mənim qullarımın qəyyumları olmusunuz». Sonra onlardan birindən soruşacaq: «Sən mənim qullarıma niyə Mən müəyyən etdiyimdən ağır cəzalar vermisən?». O cavab verəcək: «Ey mənim Rəbbim, çünki o, Sənə itaətsizlik göstərirdi və buyurduqlarınıza zidd gedirdi». Böyük və Qadir Allah deyəcək: «Sənin qəzəbin Mənim qəzəbimi keçməli deyildi». Sonra O, başqasından soruşacaq: «Niyə sən Mənim qullarıma mən buyurduğumdan yüngül cəzalar vermisən?». O cavab verəcək: «Ey

Allahım, mən onlara rəhm etmişəm». Onda Allah-təala buyuracaq: «Sən necə Məndən artıq rəhmli ola bilərsən? Həm cəzanı ağırlaşdıranı, həm də onu yüngülləşdirəni götürün Cəhənnəmin küncünə atın!»

Hüzeyfə, Allah ondan razı olsun, söyləmişdir: «Mən heç bir hökmdarı, mömin olsun-olmasın, təriflәyə bilmərəm. Çünki eşitmişəm ki, bir dəfə Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Qiyamət günü hakimləri gətirib Sirat körpüsündən keçirəcəklər ki, ədalətsiz qərarlar verənləri, məhkəmədə rüşvət alanları və ya tərəflərdən birini daha artıq dinləyənləri Cəhənnəmə atsınlar. Onlar bu körpüdən aşağı yetmiş il uçacaqlar ki, nəhayət, Cəhənnəmin dibinə çatsınlar».

Həmçinin söylənilir ki, peyğəmbər Davud əleyhissəlam heç kim onu tanımasın deyə, libasını dəyişib gecələr gəzər və adamlardan Davudun necə həyat keçirdiyi barədə soruşarmış. Bir dəfə mələklərdən Cəbrail insan simasında onun qarşısına çıxır. Davud ondan soruşur: «Sən Davudun həyatı haqqında nə deyə bilərsən?». Cəbrail cavabında deyir: «Davud çox yaxşı insandır. Ancaq xəzinədən deyil, öz əlləri ilə qazandığı çörəklə qidalansaydı, daha yaxşı olardı». Göz yaşları və kədər içində geri dönən Davud Allaha əl açıb deyir: «İlahi, mənə elə bir sənət öyrət ki, mən onun sayəsində öz zəhmətimlə və öz əllərimlə çörək qazana bilim!». Onda Allah ona zireh hazırlamağı öyrədir.

Ömər ibn əl-Xəttab da, Allah ondan razı olsun, hər gecə evdən çıxar, gözətçilərlə birgə gəzərdi ki, harada bir zədə görsə onu düzəltdirsin. O, deyirdi: «Əgər qotur bir qoyun belə çaydan uzaqda qalıbsa və mən heç nə etmirəmsə, Qiyamət günü bunun cavabını verməli olacam».

Ey sultan, sən bir Ömərdə, Allah ondan razı olsun, olan iltifata və ədalətə bax. İnsanlardan heç kim onun möminliyi səviyyəsinə çatmayıb. Gör o, necə düşünürdü və Qiyamət gününün əzabından necə ehtiyat edirdi. Sən isə öz təəbələrinin vəziyyətinə diqqət yetirmədən və məmləkətinin əhalisinə laqeyd yanaşmaqla hökmranlıq etmisən.

Abdulla ibn Ömər və onun ailə üzvlərindən bir neçəsi belə söyləyib: «Biz Allaha yalvarırdıq ki, Ömər ibn əl-Xəttabı yuxuda bizə göstərsin. Nəhayət, on iki il sonra mən onu yuxuda gördüm. O, qüsl edib, izara bürünmüşdü. Mən ondan soruşdum: «Sən öz Rəbbinlə necə görüşdün? Və O, səni necə mükafatlandırdı?». O,

cavabında soruşdu: «Mənim sizi tərk etməyimdən nə qədər vaxt keçib?». Mən cavab verdim: «On iki il». Onda o buyurdu: «Mən sizdən ayrılandan bu vaxtadək Tanrıya hesabat verirdim. Qorxurdum. Əgər Allah hər şeyi bağışlayan, Rəhmli, Səxavətli və Alicənab olmasaydı, məhv olacaqdım». Bu, yerdəki həyatında qamçısından başqa, heç bir hakimiyyət simvolu olmayan Ömərin vəziyyətidir.

**Əhvalat**

Yunan imperatoru Ömər ibn əl-Xəttabın yanına elçi göndərir ki, onun gördüyü işlərə nəzər yetirsin və onun əməllərinə tamaşa etsin. Elçi Mədinəyə daxil olub onun sakinlərindən soruşur: «Sizin padşahınız haradadır?». Ona cavab verirlər ki, bizim padşahımız yoxdur, bizim rəhbərimiz var. O, indi şəhərdə deyil.

Elçi onu axtarmağa çıxır və görür ki, o, günəşin altında yerdə - isti qumun üstündə, qamçısını balınc əvəzi başının altına qoyaraq yatıb. Alnından o qədər tər axıb ki, yer islanıb. Elə ki, elçi bunu görür, qəlbində ona qarşı bir ehtiram baş qaldırır. O deyir: «Bu, qarşısında bütün şahların qorxudan dinclik tapmadığı insandır. Sən Ömər, adilsən. Buna görə də qorxu bilmədən sakit yatırsan. Bizim padşah isə zorakıdır və təəccüblü deyil ki, hər zaman qorxu içində yatır. Mən şahid oldum ki, sizin dininiz – Haqq dinidir. Əgər mən bura elçi kimi göndərilməsəydim, İslamı qəbul edərdim. Sonra mütləq qayıdacam və müsəlman olacam».

Ey sultan, bil ki, hakimiyyətin xətəri böyük, bəlası çox, söhbəti uzundur. Hökmdar olan yalnız din alimlərinə yaxın olmaqla qurtula bilər. Bu alimlər ona ədalətin yolunu öyrədər və onun bu təhlükəli vəziyyətini yüngülləşdirərlər.

**İkinci əsas**

Sən həmişə belə alimlərə doğru yönəlməli və onların nəsihətlərini dinləməyə çalışmalısan. Kafir alimlərin dünyəvi həyatın nemətlərinə həvəs göstərən davamçılarından qorunmalısan. Onlar səni mədh edib yoldan çıxararlar. İstəyərlər ki, haram mala aludəçilikdən, dinin qadağan etdiyi yolla (haram) əldə ediləndən və sənin əlində olanlardan yalan və hiylə ilə nə isə qazansınlar və sən onlardan razı qalasan. Həqiqi alim isə sənin əlindəkinə göz dikməz. Və o, sənə məsləhətlərində və söylədiklərində maraq güdməz.

Belə nəql edirlər ki, əl-Bəlxinin qardaşı xəlifə Harun ər-Rəşidin yanına gələndə, o soruşur: «Sən zahidin qardaşısan?». Əl-Bəlxi deyir: «Mən qardaşam, ancaq zahid deyiləm».

Harun ər-Rəşid deyir: «Mənə bir məsləhət ver». Cavabında eşidir: «Həqiqətən, Allah səni Əbu-Bəkr əs-Sadiqin yerinə qoymuşdur və səndən doğruluq tələb edir. O, sənə Ömər əl-Fəruqun mövqeyini vermiş və səndən həqiqəti yalandan ayırmağı tələb edir. O, səni Osman Zynnureynin yerində oturtmuş və səndən onun kimi sadə və əliaçıq olmağı tələb edir. O, Əli ibn Əbu Talibin yerini sənə vermişdir və səndən elm və ədalət tələb edir». Harun ər-Rəşid deyir: «Mənə məsləhətlərini artıq et». O deyir: «Yaxşı. Bil ki, Allahın Cəhənnəm adlanan bir yeri var və O, səni həmin yerin qapıçısı qoymuş və üç şey: xəzinə, qamçı və qılınc verib, insanların Cəhənnəmə girməsinin qarşısını almağı tapşırmışdır. Buna görə də kim ehtiyac üzündən qapına gəlsə, ona xəzinəndən pay verməyə etiraz etmə, kim Rəbbinin buyurduğuna qarşı getsə, onu qamçı ilə cəzalandır və kim də nahaqdan adam öldürsə, onu mərhumun yaxın qohumu icazə verərsə, bu qılıncınla edam et. Əgər sən öz Rəbbinin əmrini yerinə yetirməsən, onda axirətdə Cəhənnəm sakinlərinin başçısı olacaqsan». Harun ər-Rəşid deyir: «Mənə daha bir neçə məsləhət ver». O, cavabında söyləyir: «Sən suyun mənbəyi, canişinlər isə səndən axan kiçik çaylardır. Əgər qaynaqda su təmiz olsa, bu çayların bulanıqlığı ona maneçilik törətməz. Yox, əgər bu mənbə bulanıq olsa, onda çayların təmizliyi belə ona kömək edə bilməz».

**Əhvalat**

Bir dəfə Harun əl-Rəşidlə Abbas Fudeyl ibn İyyada baş çəkməyə yollanırlar. Onun evinin qapısına çatanda Fudeylin bu Quran ayəsini oxuduğunu eşidirlər:

*«Yoxsa dünyada pis əməllər edənlər (axirətdə) onları iman gətirib yaxşı işlər görənlərlə bir tutacağımızı, onların həyatlarının və ölümlərinin eyni olacağını güman edirdilər» (Quran, 45:21).*

Ayənin mənası: Yoxsa, yanlış iş görənlər və pis əməllər törədənlər onların xeyir iş görənlər və möminlərlə bir səviyyədə tutulacaqlarını düşünürlər? Əlbəttə yox. Onlar fikirlərində yanılırlar.

Bu zaman Harun ər-Rəşid deyir: «Əgər biz bura nəsihət almağa gəlmişiksə, bu elə kifayətdir». Sonra o, Abbasa göstəriş verir ki, qapını döysün. O, qapını döyüb deyir: «Möminlərin əmirinə

qapılarını aç!». Bu vaxt Fudeyl soruşur: «Əmirəl-möminin mənimlə nə işi var?». Abbas yenə söyləyir: «Əmirə tabe ol və qapını aç!». Bu zaman gecə imiş, evdə çıraq yanırmış. O qalxıb çırağı söndürür və qapını açır. Harun ər-Rəşid içəri girib əlini gəzdirir ki, Fudeyl ilə görüşsün. O, əli ilə Fudeyli tapanda deyir: «Əgər Qiyamət günü cəzadan qurtula bilməsə, vay sənin bu əlinin halına». Sonra əlavə edir: «Ya əmirəl-möminin, Allah qarşısında sorğu-suala hazırlaş. Çünki O, səni Siratda digər müsəlmanlardan ayıracaq və səndən onların hər birinə görə ədalət tələb edəcək». Harun ər-Rəşid bərkdən hönkürməyə başlayır və bunu görən Abbas deyir: «Ey Fudeyl, bir qədər sakit ol. Sən əmirəl-mömini öldürürsən». O isə cavab verir: «Ey Haman, onu öldürən sən və sənin tayfandır. Sən isə mənə deyirsən ki, sakit ol, sən əmirəl-mömini öldürürsən». Bu vaxt Harun ər-Rəşid Abbasa deyir: «Sənə Haman deməklə, o, məni də firon adlandırmış oldu». Sonra Harun ona min dinar uzadır və deyir: «Bunlar halal puldur – mənim anamın mirasından qalıb». Fudeyl isə ona belə cavab verir: «Sən bunu mənə verərkən mən sənə bunlardan əl çəkib Allahının yanına qayıtmağı əmr edirəm». Və pulu qəbul etməyib onu tərk edir.

Ömər ibn Əbdüləziz Məhəmməd ibn Kəəb əl-Kurzidən xahiş edir ki, ədalətin necə olduğunu onun üçün təsvir etsin. O deyir: «Səndən yaşlı müsəlmana oğul, sənlə həmyaşıd müsəlmana qardaş, səndən kiçik yaşlı müsəlmana ata kimi ol. Günahkar olanı öz günahı (cinayəti) dərəcəsində cəzalandır. Kin bəslədiyin hər hansı müsəlmanı vurmaqdan qorx, çünki bu, səni Cəhənnəmə aparar».

Çox mömin adamlardan biri dövrünün hökmdarının yanına gəlir. Hökmdar ona deyir: «Mənə öyüd ver». Mömin şəxs deyir: «Ya əmirəl-möminin, sizə məlum olsun ki, mən bir dəfə Çinə getmişdim. O vaxt Çinin hökmdarı xəstəliyə düçar olmuşdu, onun qulağı batmışdı və o eşitmirdi. Bir dəfə mən onun ağlaya-ağlaya bu sözləri dediyini eşitdim: «Mən kar olduğuma görə ağlamıram. Ona görə ağlayıram ki, qapımda duran və məndən kömək istəyən məzlumun fəryadını eşidə bilmirəm. Şükür Allaha ki, O, mənim gözlərimi saxlayıb». Bundan sonra o, fərman verir ki, zülmə məruz qalmış adamlar qırmızı geyinsinlər. Və hər gün filin belinə oturub gəzər, kimin əynində qırmızı paltar görərdisə, onu çağırıb şikayətini qəbul edər və şikayətçi olduğu adamla münasibətini ədalətli həll edərdi.

Ey əmirəl-möminin, siz bir kafir padşahın Böyük Allahın qullarına necə şəfqətlə davrandığına baxın. Sonra özünüzün, Pey-

ğəmbər, Allahın ona xeyir-duası və salamı olsun, nəslindən və mömin olmağınıza baxmayaraq, təəbələrinizə münasibətinizə nəzər yetirin».

Bir dəfə Əbu Kulab Ömər ibn Əbdüləzizin məclisinə gəlir. Ömər ona buyurur: «Mənə məsləhət ver». O deyir: «Adəm əleyhissəlamdan bu günümüzədək səndən başqa xəlifə qalmamışdır». Ömər deyir: «Mənə daha bir neçə nəsihət ver». O cavab verir: «Sən birinci xəlifəsən ki, öləcəksən». Ömər yenə ondan nəsihət etməsini istəyir. Əbu Kulab deyir: «Əgər Allah səninlə olsa, səni heç kim qorxuda bilməz. Yox, əgər O, səninlə deyilsə, sən heç yerdə gizlənə bilməyəcəksən». Onda Ömər deyir: «Sənin söylədiklərin mənə kifayət etdi».

Süleyman ibn Əbdülmalik xəlifə idi və bir dəfə fikrə dalıb dedi: «Mən bu dünyada çox xeyir işlər gördüm. Görəsən mənim o dünyada əhvalım necə olacaq?» O dövrün ən bilikli və ən mömin adamlarından olan Əbu Hazimin yanına adam göndərdi və tapşırdı ki, ona belə söyləsin: «Səhərlər yediyin yeməyi mənə göndər». O da bir parça kəpəkdən çörək göndərdi və bildirdi ki, onun səhər yeməyi budur. Süleyman bunu görəndə ağladı, ona qarşı qəlbində böyük rəğbət hissi doğdu. Üç gün heç nə yeməyib oruc saxladı. Yalnız üçüncü günün gecəsi ailəsi ilə birlikdə şam elədi və o, kəpək çörəyini yedi. Məhz bundan sonra onun oğlu Ömər ibn Əbdüləziz dünyaya gəldi. Əbdüləziz dövrünün ən şərəfli, düzgünlüyü ilə seçilən, ədalətli, mömin və əməli-saleh şəxsiyyəti oldu. O, Ömər ibn əl-Xəttabın, Allah ondan razı olsun, yolunu tutdu. Və deyilənlərə görə, bunlar Süleymanın xeyirxahlığı, orucu və çörəyi yediyinə görə olub.

Ömər ibn Əbdüləzizdən, Allah ona rəhmət eləsin, soruşurlar: «Sənin bu qədər düzgün olmağına səbəb nə olub?». O deyir: «Bir dəfə mən öz xidmətçimi vurdum. O isə mənə dedi: «Mən Qiyamət qopacağı gündən əvvəlki gecəni təsəvvür edirəm». Bu sözlər mənim ürəyimi yerindən oynatdı».

Bir məşhur şəxs Harun ər-Rəşidin Ərəfatda başıaçıq, qızmar gün üstündə ayaqyalın durub, Allaha əl qaldırıb belə dediyini görür: «Sən – Sənsən, mən isə mənəm. Mənim xasiyyətim hər gün Sənin itaətindən çıxmaq, Sənin xasiyyətin mənə hər gün Sənin Əfvin və Rəhminlə qayıtmaqdır». Bunu görən həmin adam dedi: «Qüdrətli yerin hər şeyə qadir göylər qarşısında itaətinə baxın!».

Bir dəfə Ömər ibn Əbdüləziz Əbu Hazimdən nəsihət istəyir. Əbu Hazim ona deyir: «Yatanda ölümü başının altına qoy. Ölümün tez gəlməsini istəsən, onun yanında ol, ölümün gec gəlməsini istəyirsənsə, onun yanında ondan yayın».

Buna görə hökmdarlara başqalarının nəsihətlərini dinləyib onları nəzərə almaq və hər dəfə alim görəndə ondan məsləhət istəmək vacibdir.

Alim isə padşahlara doğru yol göstərməli, onları aldatmamalı və onlardan haqq sözünü əsirgəməməlidir. Və hər kim ki yalan danışır, o, zülmün iştirakçısına çevrilir.

**Üçüncü əsas:**

Yalnız özünü ədalətsizliklərdən çəkindirməyib, həm də qulluğunda olanları, canişinlərini və müavinlərini tərbiyələndirmək və onların haqsızlıq etməsinə icazə verməmək. Çünki sən axirətdə təkcə öz haqsız əməllərinə görə deyil, onların da haqq işlərinə görə sorğu-sual ediləcəksən.

Ömər ibn əl-Xəttab öz valisi Musa əd-Əşəriyə yazmışdı: «...sonra...[6] Həqiqətən, ən xoşbəxt hökmdar təəbələri xoşbəxt olan, ən bədbəxt hökmdar – təəbələri bədbəxt olandır. Zülmdən çəkin, çünki sənin xidmətçilərin də səni təqlid edirlər. Sən otlağa düşmüş və həddən artıq otlamaqdan kökəlib öz ölümünə bais olan heyvan kimisən. Çünki belə heyvanı məhz köklüyünə görə kəsirlər və yeyirlər».

Tövratda isə yazılmışdır: «Hökmdar əgər öz təəbələrinin düzgün olmayan əməllərindən xəbər tutarsa, lakin heç bir tədbir görməzsə, bu haqsızlıqlar onun adına yazılacaq və o, buna görə ittiham edilib cəzasını alacaq».

Hökmdar bilməlidir ki, ən ədalətsiz insan imanını və axirətdəki gələcək həyatını dünyadakı başqalarına məxsus nemətlərə satandır. İnsanların çoxu öz nəfsinin quludur və həvəsində olduğuna çatmaq üçün hər cür hiyləyə əl atır. Bütün qulluqçular və xidmətçilər özlərinin dünya həyatındakı payından ötəri hökmdarlarını aldadır və onu haqsızlığa təhrik edirlər. Bununla da öz məqsədlərinə çatmaq üçün onu Cəhənnəmə sürükləyirlər. Haram dirhəm qazanmaqdan ötrü sənin məhvinə çalışandan isə daha pis düşmən yoxdur.

---

[6] Bu sözlər («sonra isə») imamın möizəsində və ya hökmdarların məktublarında Allahın və Məhəmməd peyğəmbərin tərifindən sonra verilir.

Öz təbələrinə qarşı ədaləti gözləmək istəyən hökmdar öz nökər-naibinə də ədalətli olmağı öyrətməli və onlara öz arvad-uşağına baxdığı kimi nəzarət etməlidir. Bu da yalnız hökmdarın ədaləti könlündə bəsləyəcəyi, ağıl və imanı kef və qəzəbin deyil, kef və qəzəbi ağlın və imanın əsirinə çevirəcəyi zaman mümkündür.

O həm də bilməlidir ki, ağıl mələklərlə eyni mahiyyətdən və Allahın ordusundan, kef və qəzəb isə şeytanın ləşkərindəndir. Allah ordusunu arxaya keçirib, şeytan ordusunu önündə tutan başqalarına qarşı necə ədalətli ola bilər? Ona görə də ədalət günəşi birinci hökmdarın qəlbində baş qaldırmalı, sonra ev sakinlərini və padşahın yaxınlarını nuruna boyamalı və yalnız bundan sonra onun işığı təbələrə çatmalıdır. Günəş olmadan işıq əldə etmək istəyən isə mümkün olmayanı istəyir və əlçatmaz olanın arzusundadır.

Ey sultan, bil və anla ki, ədalət əqli dolğunluqdan yaranır. Dolğun əqlə sahib olmaq isə şeyləri olduğu kimi görmək, onların xarici görünüşünə aldanmayıb mahiyyətini dərk etmək deməkdir. Məsələn, əgər sən dünya həyatından ötəri insanlara əziyyət edirsənsə, onda mütləq bunda hansı məqsədin olduğunu bilməlisən. Və əgər burda sənin məqsədin yaxşı qidalanmaqdırsa, onda sən bilməlisən ki, bu, heyvani istəkdir. Çünki yeməkdə və içməkdə hədd tanımamaq heyvanlara aid xüsusiyyətdir. Yox, əgər sənin məqsədin, tutaq ki, ipəkdən don geyməkdirsə, onda bilməlisən ki, sən kişi cildində bir qadınsan. Çünki özünü bəzəmək və yüngüllük qadın işidir. Yox, əgər sənin məqsədin düşmənə qəzəbini tökməkdirsə, onda sən – insan cildində vəhşisən. Yox, əgər sən bununla insanların sənə xidmət etməsinə çalışırsansa, onda sən özünü ağıllı göstərmək istəyən axmaqsan. Çünki ağıllı olsaydın, bilərdin ki, sənə xidmət edənlər əslində öz qarınlarına və öz istəklərinə qulluq edənlərdir. Və əslində onların xidməti və itaəti sənə deyil, özlərinədir. Bunun göstəricisi olaraq deyək ki, məsələn, əgər onlar eşitsələr ki, hakimiyyət sənin əlindən çıxır və bir başqasının əlinə keçir, elə o anda səni tərk edəcəklər. Kim onlara dinar və dirhəm vəd etsə, onlar da ona xidmət və itaət edəcəklər. Həqiqətən, bu, çox gülüncdür.

Şeylərə hərtərəfli baxa bilən və onun zahiri görünüşünə aldanmayanlar ağıl sahibləridir. Biz bu məsələləri söylədik və onların mahiyyətini izah etdik. Kim bunlara inanmırsa, o, ağıllı adam deyil. Və hər kimin ki ağlı yoxdur, o, dindar ola bilməz və onun yeri Cəhənnəmdir. Bu səbəbdən hər cür xoşbəxtliyin əsası ağıldır.

**Dördüncü əsas**

Hökmdarlar, adətən, təkəbbürlü olurlar. Təkəbbürdən isə qisasa və qəzəbə səbəb olan narazılıqlar törəyir. Qəzəb – ağlın şər ruhudur, onun düşməni və faciəsidir. Biz bunu artıq «Qəzəb kitabı» və «Zərərli şeylər fəsli»ndə[7] xatırlamışıq. Əgər sənin qəzəbin çoxdursa, onda sən öz işlərində rəhmli davranmağa çalışmalı, səxavət göstərməyi və bağışlamağı öyrənməlisən. Sən buna vərdiş edəndən sonra peyğəmbərlərə və Allahın dostlarına bənzəyəcəksən. Yox, əgər qəzəbini tökməyi özünə vərdiş etsən, onda heyvana və vəhşilərə oxşayacaqsan.

**Əhvalat**

Xəlifə Əbu Cəfər əl-Mənsur əl-Mübarək ibn Fədlin yanında bir nəfəri öldürməyi əmr edir. İbn Fədl deyir: «Ey əmirəl-möminin, onu edam etməzdən qabaq bir əhvalata qulaq as. Əl-Həsən əl-Bəsri rəvayət edirdi ki, Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «Allahın hamını bir yerə cəm edəcəyi Qiyamət günü carçılar söyləyəcək: «Allah qarşısında yaxşı əməl sahibləri, yerinizdən qalxın». O zaman yalnız insanları əfv etmiş olanlar ayağa qalxacaq və Allah buyuracaq: «Onları azad edin, Mən onları bağışladım».

Hökmdarlar ən çox onları pisləyən və haqlarında xoşagəlməz sözlər danışanlara qəzəblənər və onların qanını axıtmağa çalışarlar.

İsa ibn Məryəm, ona salam olsun, Yəhya ibn Zəkəriyyəyə deyir: «Əgər kimsə sənin haqqında haqq söz danışrsa, Allaha minnətdarlıq et. Yox, əgər kimsə sənin haqqında nahaqdan danışırsa, onda Allahına daha çox təşəkkür elə. Çünki O, sənin yaxşı əməllərinin sayını, sən heç nə etməsən belə, daha artıq edər. Yəni onun xeyir əməlləri də böhtan danışdığına görə sənin adına yazılar».

Bir dəfə Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, yanında bir kişini xatırlayıb deyirlər ki, o, cəsur insandır. Peyğəmbər soruşur: «Bu nə deməkdir?». Ona deyirlər: «O, kimlə qarşılaşsa, onun öhdəsindən gələr və onu basar». Peyğəmbər, ona xeyir-dua və salam olsun, buyurur: «Cəsur adam özgəsinə deyil, özünə qalib gələndir».

---

[7] «İhyai-ulum id-din» kitabından.

Rəsul əleyhissəlam deyib: «Bu üç keyfiyyəti olan adamın imanı kamil olar: öz qəzəbini boğanın, adil olanın və imkanı olduqda bağışlayanın».

Bir dəfə Zeynalabidin Əli ibn Hüseyni məsciddə bir nəfər təhqir etdi. Onun xidmətçiləri irəli yeriyib günahkarı cəzalandırmaq istəyəndə Zeynalabidin onları saxlayıb dedi: «Ona əl vurmayın». Sonra üzünü bu adama tutub belə söylədi: «Ey insan, mən sən deyəndən daha artıq günah sahibiyəm. Və sən mənim haqqımda çox şeyi bilmirsən. Əgər istəyirsənsə, mən sənə bəzi şeylər danışa bilərəm». Həmin adam xəcalət çəkdi və utandı. Zeynalabidin əynindəki köynəyini çıxarıb ona verdi və əmr etdi ki, ona daha min dirhəm versinlər. Həmin şəxs gedərkən dedi: «Mən şəhadət verirəm ki, bu gənc, həqiqətən, Allahın Rəsulunun, Allahın ona xeyir-duası və salamı olsun, nəvəsidir!».

Belə nəql edirlər ki, Zeynalabidin bir dəfə öz nökərini iki dəfə səsləsə də, o cavab vermir. İmam soruşur: «Mənim səni çağırdığımı eşitmədinmi?». Nökər cavab verir: «Bəli, eşitdim». O deyir: «Niyə bəs cavab vermirdin?». Nökər deyir: «Mən bilirdim ki, sən kamil əxlaq sahibisən, ona görə səndən qorxmurdum». Onda imam deyir: «Həmd olsun Allaha ki, mənim qulumu məndən qorxmaqdan qurtarıb».

Həmçinin deyirlər ki, onun bir nökəri var idi, bir dəfə qoyunun üstünə yıxılıb, heyvanın qıçını qırdı. İmam ondan soruşdu: «Niyə belə etdin?». O, cavabında dedi: «Mən bunu qəsdən, sizi qəzəbləndirmək üçün etdim». Zeynalabidin buyurur: «Mənim qəzəbim və hissim sənə bunu öyrədənə – şeytanadır. Allah rizasına səni azad edirəm».

Rəvayət edirlər ki, bir nəfər Zeynalabidini nalayiq sözlərlə təhqir edir. O buyurur: «Ey insan! Mənimlə Cəhənnəm arasında bir sədd vardır və əgər mənim qismətimdə onu aşıb odların içinə düşmək varsa, sənin söylədiklərinin mənim üçün heç bir əhəmiyyəti yoxdur. Yox, əgər mən bu səddi aşmayacağamsa, onda mən sənin dediyindən daha pisəm».

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, deyib: «Xeyirxah və rəhmli insan daim oruc tutmuş kimidir, (bunlardan məhrum) insansa, öz ailəsindən başqa, heç kim üzərində hakimiyyəti və ağalığı olmasa belə, müstəbidlərlə bir sırada tutular».

Allahın Rəsulu, ona salam olsun, deyib: «Cəhənnəmin qapısından şəriətin buyurduğunun əksinə olaraq, kin-küdurətdən əl çəkməyənlərdən başqa, heç kim girməyəcək».

Belə nəql edirlər ki, Allahın lənətinə gəlmiş şeytan peyğəmbər Musa əleyhissəlamı görüb ondan soruşur: «Ya Musa, gəl mən sənə üç şey öyrədim, əvəzində sən Allahdan mənim üçün bir şey istə». Musa əleyhissəlam deyir: «Bu üç şey nədir ki?». Şeytan cavab verir: «Ey Musa, özünü paxıllıqdan, qəzəbdən və kindən qoru. Çünki paxıl yelbeyin olar və mən onunla uşaq topla oynadığı kimi oynaram. Özünü tamahkarlıqdan qoru, çünki o, insanın dünya həyatını və imanını korlar. Və özünü qadınlardan qoru, çünki mənim insanlar arasında qadınlardan artıq güvəniləsi müttəfiqim yoxdur».

Allahın Rəsulu, ona salam olsun, buyurub: «Hər kim öz qəzəbini boğsa, baxmayaraq ki, o, bunu etməyə də bilərdi, Allah onun qəlbini xoşhal və imanlı edər. Kim Allah qorxusundan lovğa və təkəbbürlü görünməmək üçün uzun ətəkli paltarlar geyməzsə, Allah onu şərəf libasına bürüyər».

O həzrət buyurub: «Allahın qəzəbini unudan qəzəbli adamlara lənət olsun».

Bir dəfə Məhəmməd Peyğəmbərin, Allahın ona xeyir-duası və salamı olsun, yanına bir nəfər gəlib ondan xahiş edir: «Məni elə bir işə öyrət ki, mən bu işimə görə Cənnətə daxil ola bilim». «Qəzəblənmə», - deyə peyğəmbər buyurur. «Daha nə?» - kişi soruşur. Peyğəmbər buyurur: «Günorta namazından sonra yetmiş dəfə Allahdan bağışlanmanı xahiş et ki, O, sənin yetmiş illik günahlarından keçsin». Həmin şəxs deyir: «Axı mənim yetmiş illik günahlarım yoxdur». Peyğəmbər buyurur: «Onda sənin ananın günahları bağışlanar». O adam yenə deyir: «Mənim anamın da yetmiş illik günahları yoxdur». Allahın Rəsulu deyir: «Onda sənin atanın». Həmin şəxs cavab verir: «Mənim atam da yetmiş illik günah sahibi deyil». Peyğəmbər buyurur: «Onda sənin qardaşlarının». «Bəli», - deyə, o şəxs cavabında söyləyir.

İbn Məsud nəql edir ki, Rəsulallah, Allahın ona xeyir-duası və salamı olsun, bir dəfə əmlak bölüşdürərkən bir nəfər bölgünü ədalətli hesab etməyərək söyləyir: «Bu bölgü Haqq bölgüsü deyil». Bu sözləri Peyğəmbərə çatdıranda o, əsəbiləşir və rəngi qızarır, lakin yalnız bu sözlərlə kifayətlənir: «Allah mənim qardaşım Musaya rəhmət eləsin. Onu o qədər incitdilər, amma o, bu haqsızlıqların hamısına dözdü».

Bu bir neçə əhvalat və rəvayətlər hökmdarlara nəsihət üçün gərəkdir və əgər onlar möhkəm iman sahibləridirsə, bunlardan nə-

ticə çıxaracaqlar. Əgər bizim çəkdiyimiz misallar onlara təsir etməzsə, bunun səbəbi onların qəlbində imanın olmaması, dindən isə boşboğazlıqdan savayı, bir şey qalmamasıdır.

**Beşinci əsas**

Sənə düşən və ya təqdim olunan hər bir işə baxarkən özünü rəiyyət, başqasını isə hökmdar kimi təsəvvür et. Özünə rəva görmədiyini başqa müsəlmana arzulama. Əgər sən buna yol versən, öz təəbələrini aldatmış və satmış olarsan.

Belə rəvayət edirlər ki, Bədr savaşı günü Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, bir kölgə yerdə oturmuşdu. Bu zaman Cəbrail mələk onun yanına endi və söylədi: «Ey Məhəmməd, sən özün kölgəlikdə oturub yoldaşlarını günəşin altında qoymusan?». Bax beləcə, o da məzəmmət olunurdu!

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «Kim Cəhənnəmdən qurtarıb Cənnətə girmək istəyirsə, o, ölüm ayağında belə şəhadət gətirməyə özündə güc tapmalı və həyatda özünə rəva bilmədiyini digər müsəlmanın başına gəlməsinə imkan verməməlidir».

O əleyhissəlam buyurub: «Hər kim ki səhərlər qəlbində Allaha xoş niyyətlə yuxudan durmursa, onda Allahdan heç bir əlamət yoxdur. Müsəlmanların dərdini çəkməyən kimsə isə onlardan deyil».

**Altıncı əsas**

Sənin ehtiyacı olanlara və qapında dayananların umacaqlarına etinasız yanaşmamağın üçündür. Özünü bu təhlükədən qorumalısan. Səndən umacağı olan müsəlmanların sayı nə qədər çox olsa da, əlavə itaətkarlıq xatirinə onların istəyini yerinə yetirməkdən yayınma.

Bir dəfə Ömər ibn Əbdüləziz qapısına gələn insanların ehtiyaclarını həll edirdi. Günortayadək oturub çox yoruldu və evinə girdi ki, bir az istirahət etsin. Bu zaman oğlu ona belə dedi: «Qapında bu qədər ehtiyacı olan adam dayandığı və sənin onlara laqeyd olduğun zaman əcəlin səni yaxalamayacağına təminatın varmı?». «Sən haqlısan, mənim oğlum», - o, cavabında bildirdi və qalxıb işini davam etdirmək üçün saraydakı yerinə getdi.

**Yeddinci əsas**
Sən özünü dəbdəbəli paltarlar geyinmək, ləzzətli təamlar yeməyə aludəçilik kimi ifrata varan istəklərə öyrətməməlisən. Sən sadə olmalısan, çünki sadəlik olmadan ədalət də olmaz.

Ömər ibn əl-Xəttab, Allah ondan razı olsun, möminlərin birindən soruşdu: «Sən mənim əməllərimdə sənə xoş olmayan nəsə görmüsənmi?». O cavab verdi: «Mən eşitmişəm ki, sən öz masanın üstünə iki kökə qoyursan. Və daha eşitmişəm ki, sənin iki köynəyin var; birin gecə, birin də gündüzlər geyirsən». Ömər soruşdu: «Bunlardan başqa, daha nə deyə bilərsən?». O cavab verdi ki, heç nə. Onda əl-Xəttab söylədi: «And olsun Allaha ki, bunlar uydurmadır».

**Səkkizinci əsas**
Əgər sən nəzakətli və mehriban ola bilirsənsə, sərt və qaba hərəkət etmə.

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «Qiyamət günü Allah öz təəbələrinə rəhm etməyən hakimlərdən heç birini bağışlamayacaqdır. O Əleyhissəlam Allaha belə dua edərdi: «İlahi, öz təəbələrinə mərhəmətli olan hökmdarlara rəhm et, öz təəbələrinə qarşı amansız hökmdarlara qarşı isə amansız ol».

O əleyhissəlam buyurub: «Hakimiyyət və idarəçilik ona lazımi şəkildə yanaşanlar üçün xeyirli, məsuliyyətsiz yanaşanlar üçün isə zərərlidir».

Hişam ibn Əbdülmalik Əməvi xəlifələrindən biri idi. Bir dəfə o, üləma Əbu Hazimdən soruşdu: «Xəlifə mövqeyinin təhlükəsindən necə xilas olmaq mümkündür?». O dedi: «Hər dirhəmini halal yolla qazanıb doğru, təyinatına uyğun xərcləməklə». Xəlifə dedi: «Bunu kim bacara bilər ki?». O cavab verdi: «Cənnət həzzini istəyib, Cəhənnəm əzabından qorxan».

**Doqquzuncu əsas**
Sən dinin qayda-qanunlarına riayət etməklə öz təəbələrinin sevgisini qazanmağa çalışmalısan. Allahın Rəsulu, ona Tanrının xeyir-duası və salamı olsun, özünün ardıcıllarına deyirdi: «Mənim ümmətim içində ən yaxşıları sizi sevənlər və sizin sevdiklərinizdir. Mənim ümmətim içində ən pis insanlar

isə sizə kin bəsləyib lənət deyənlər və sizin də nifrət edib lənətlədiklərinizdir».

Hökmdar hüzurunda onu mədh edən hər kəsə aldanmamalı və rəiyyətin tamamən ondan razı olduğunu düşünməməlidir. Çünki hökmdara tərif söyləyənlər bunu ondan qorxduqları üçün edərlər. O, ölkənin hər yerinə inanılmış adamlarını göndərməli və öz səhvlərini görmək üçün onlardan rəiyyətin vəziyyətini xəbər alıb, məlumat toplamalıdır.

**Onuncu əsas**

Kim olursa olsun, heç bir adamın rifahı üçün sən dinin göstərişlərini pozmamalısan. Çünki dünya nemətlərindən ötəri Allahın qəzəbinə gəlmiş hər bir kəsin son mənzili Cəhənnəmdir.

Ömər ibn əl-Xəttab, Allah ondan razı olsun, demişdir: «Mən yuxuya dalanda insanların yarısı mənə əsəbiləşmiş olur. Həqiqətən, haqqı əlindən alınanın qəzəbindən qurtulmaq qeyri-mümkündür. Düşmən olanların da bir-birinə xeyirxahlığı mümkün deyil. İnsanların ən cahili isə insan rizası üçün Allah rizasını tərk edəndir».

Müaviyə Aişəyə, Allah ondan razı olsun, yazır ki, ona kiçik ibrətamiz nəsihətlər versin. Aişə də ona bunları yazır: «Mən bir dəfə Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, belə dediyini eşitdim: «Hər kim ki, insanların acığı tutsa belə, Allahı qane etməyə çalışsa, Allah ondan razı qalar və insanları da ondan razı edər. Hər kim ki insan rizası üçün Allahı qəzəbləndirmiş olsa, yəni insanları (Allaha) ibadətə çağırmasa, onlara dini məsələləri öyrətməsə, insanlara haram yedirtsə, işçiyə onun haqqını, qadına onun hüququ çatanı verməsə, Allah ondan narazı qalar və insanları da ona qarşı narazı edər».

## İMAN AĞACINI QİDALANDIRAN İKİ MƏNBƏ HAQQINDA SÖHBƏT

İndi isə sən artıq İman Ağacının köklərinin və budaqlarının mahiyyəti ilə tanış olduqdan sonra bil ki, bu Ağacın su içdiyi iki mənbə vardır.

**Birinci mənbə – yer aləmini, onun mahiyyətini və nədən onda insanın yarandığını bilməkdir.**

Ey sultan, sən bil ki, bu dünya müvəqqəti, insan isə bir səyyahdır. Onun üçün ilk dayanacaq anasının bətni, sonuncu dayanacaq isə məzarıdır.

Həqiqətdə isə insanın daimi məkanı, vətəni, əbədi mövcudluğu bu həyatdan sonra başlayır. İnsan ömründən gedən hər il – bir keçiddir; ötən hər ay – onun yolunda olan dayanacaqdır; hər həftə – onun yolunun üstünə çıxan yaşayış məskənidir; hər gün – onun qət etdiyi bir mildir; hər nəfəs – onun atdığı addımdır. İnsan hər yeni nəfəsi ilə axirət həyatına yaxınlaşır. Bu həyat, sadəcə olaraq, bir körpüdür və bütün həyatını bu körpünün tikintisinə həsr edənlər bir gün anlayacaqlar ki, onlar ömürlərini bu məşğuliyyətə sərf edən sərsəmlər olmuşlar. Həqiqətən, o insanlar müdrikdirlər ki, həyatlarını bu məşğuliyyətə sərf etməmişlər, ehtiyacları olandan artığın arxasınca düşməmişlər. İnsan nə qədər çox var-dövlət toplamasına baxmayaraq, onun qisməti geyiminə, qidalanmasına, fitrə və zəkata payladığı tələb olunan məbləğdən artıq deyildir. Bu məbləğdən artıq qazanılan var-dövlət onun üçün bir bəlaya çevriləcək; elə bir bəlaya ki, ölən gününə kimi insandan ayrılmayacaqdır. Və o, ona qismət edilənlərin hesabına, qadağan olunanların isə cəzasını verəcəkdir.

Əlbəttə ki, halal qazanılan var-dövlət üçün insan sorğu-suallardan azaddır. Haram yolla əldə edilənlərə görə isə o, mütləq cəzalanacaqdır. Buna görə qəbir evində veriləcək cəza ona göndərilmiş bəladan daha ağır olacaqdır.

Bununla belə, əgər insan iman əhlindəndirsə və onun çiyinləri hər iki mələkdən xali olmayıbsa, qorxu üçün heç bir əsas yoxdur, çünki allah rəhman və bağışlayandır.

Ey sultan, bilməlisən ki, bu dünyada rahat həyat bir neçə gün davam edir. Bütün ömür çətinlik və əzabla keçir. Əsl rahatlıq axirətdədir və o, daimidir. Ağıllı insan bu müvəqqəti həyatdakı bütün sınaqları uğurla keçir ki, əbədi həyatda rahatlıq tapa bilsin.

**İzahat**

Sevgilisi olan birinə desələr ki, əgər sən bu gecə onun yanına getsən, bu, son görüş olacaq, səhərəcən səbr edib gözləsən, heç bir çətinlik və narahatçılıq olmadan sevgilin minlərlə gecə sə-

nin olacaq. Hansı qərar daha ağıllı olar? Hətta bu sevgi atəşli olsa, yarsız yaşamaq əzab versə də, daha düzgün olar ki, bir gecənin əzabını yola verib, əvəzində minlərlə gecə əldə edəsən. Bu dünyadakı həyat isə axirət həyatının heç mində biri də deyildir, müqayisəyə gəlməzdir. Çünki gələcək həyat daimidir və onun mövcudluğunu zamana sığdırmaq qeyri-mümkündür.

Biz dünyəvi varlığı əks etdirən böyük bir kitab yazsaq da, indi yalnız on dünyəvi əməldən bəhs etməklə kifayətlənəcəyik. Biz Allahın köməkliyi ilə onun mahiyyətini on misal ilə açmağa çalışacağıq.

***I Misal. Bu dünyanın sehri və cazibədarlığı haqqında.***

Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur:

«Bu dünyadan özünüzü qoruyun, çünki onun sehri Harut və Marutun sehrindən də güclüdür».[8]

Onun ən əsas sehri səni ovsunlamasındadır; sənə elə gəlir ki, o, sənin əlindədir və sən çox rahatsan. Lakin əgər sən həyatın mahiyyətinə diqqət etsən, aydın olar ki, o, mütəmadi olaraq, asta-asta səndən uzaqlaşır.

Bu dünyadakı həyat bir kölgədir: Sənə elə gəlir ki, o, bir yerdə durub. Əslində isə o, daimi hərəkətdədir. İnsan həyatı da belədir; o, hər zaman hərəkət edir və azalır. O, səni diqqətsiz olduğun, özünü itirdiyin, inamının və hissinin azaldığı bir anda tərk edib gedir.

***II Misal.*** Həyat sehrinin biri də məhəbbətdir. O, sənə məhəbbət verir. Verir ki, sən ona bağlanasan. Daha sonra özünü bu yolda kömək edən dost kimi göstərir və qəfil olaraq da sənin düşməninə çevrilir. O, sanki əxlaqsız bir qadındır; kişiləri aldadaraq, özünə aşiq edir, daha sonra evinə dəvət edərək məhv edir.

## İzahat

İsa Peyğəmbər əleyhissəlam ona gələn vəhylərdən birində bu dünyanı qoca qarı cismində görərək ondan soruşmuşdur: «Sənin neçə ərin olub?» O cavab vermişdir: «O qədər çox ki, heç saymaq mümkün deyil». İsa soruşub: «Onlar ölüblər, yoxsa səndən boşanıblar?». Qadın cavab verib: «Xeyir, mən özüm onları öldürüb,

---

[8] Harut və Marut – məşhur cadugərlər. Quranda onların adları çəkilib (2: 102). Allah onları insanları aldadan cadugərlər olduqları üçün cəzalandırıb.

axırlarına çıxmışam». İsa buyurub: «Mən sənin uğrunda bu gün də mübarizə aparan axmaqlara heyran oluram. Məgər onlar görmürlər ki, sən əvvəlkilərlə necə rəftar etmisən? Nə üçün onlar bundan dərs almırlar?»

*III Misal.* Onun sehrindən biri də odur ki, öz zahirini bəzədiyi halda, bütün qüsurlarını və bəlaları içində gizlədə bilir.

Bununla da həyat bixəbərləri görüntüyə uyduraraq özünə cəzb edir. O, ətir-kirşanla, gözəl bahalı libasla, daş-qaşla özünə bəzək vuraraq ətrafındakıları cəzb edən qoca bir qadına bənzəyir. Lakin bütün bu zahiri gözəllik götürülsə, ətrafdakılar bu qadının nə qədər qüsurlu olduğunu və böyük səhv edərək ona aşiq olduqlarını dərk edərlər.

Deyilənə görə, Qiyamət günü bu dünya mavigözlü, sınıqdişli, çox çirkin bir qadın surətində insanlara göstəriləcəkdir. Onu görənlər: «Allahım, sən özün bizi bu dəhşətdən qoru», – deyərək yalvaracaqlar. Sonra insanlara deyiləcəkdir: «Bu, həmin həyatdır ki, ona görə siz bir-birinizə nifrət etmişsiniz, qan tökmüsünüz, onun gözəlliyinə görə də yaxınlarınızı qətlə yetirmisiniz». Daha sonra bu qadını atəşə atmaq əmri gələrkən o deyəcək: «Allah, bəs mənim sevgililərim hanı?». Və onları da bu qadınla birlikdə Cəhənnəm atəşinə atacaqlar.

*IV Misal.* Hər bir insan düşünməlidir ki, o, dünyaya gələnə kimi nə qədər zaman keçmişdir? Və onun ölümündən sonra onun qeyri-mövcudluğu nə qədər davam edəcəkdir? Və bu keçmişlə əbədiyyət arasında olan zaman kəsiyi nə qədər davam edir? Məhz bu müddət onun yer üzündə yaşadığı dövrü özündə ifadə edir. Və insan bilməlidir ki bu dünyada onun həyatı bir səyyah yolçuluğunu xatırladır. Başlanğıcı beşikdə, sonu isə qəbirdədir. Bu həyatdakı hər bir il – bir dayanacaqdır, hər ay – bir fərsəngdir, hər gün – bir mildir, hər nəfəs – bir addımdır.

Burada insanlar daima hərəkətdədir. Bu yolçuluqdan kimsə bir fərsəng, başqası isə az və ya çox yol qət edə bilir. İnsanlar rahat yeyib-içirlər, öz əyləncələrindən ayrılmırlar. Sanki onlar bu dünyadan axirətə keçməyəcəklər. İnsanlar elə işlərlə məşğuldurlar ki, onun nəticəsini bəlkə 20 ildən sonra gördülər. Lakin qətiyyən fikirləşmirlər ki, 10 ildən sonra onlar məzarda ola bilərlər.

*V Misal.* Bil ki, bu fani dünyada insanlar tərəfindən zövq və əyləncə üçün haram yolla qazanılan hər şey haqq dünyasında on-

lara qarşı qoyulacaqdır. Necə ki, bu dünyada çox şirin və yağlı yeyən bir insanın həzm orqanları xəstələnib ona əzab verir. Çox yeməkdən əzab çəkən insan düşdüyü vəziyyətindən – mədə ağrılarından, ondan gələn pis iydən əzab çəkərək ətrafındakılardan utanır. Bir müddət sonra toxluq, kef və əyləncə hissi keçsə də, utanc insanı müşayiət edir. İnsan bu həyatdan nə qədər dərin zövq almağa başlayırsa, onun həyatının sonu da bir o qədər əzablı olur. Eyni zamanda bu cür varlı insanlar, kef əhli ölüm anında da çox ağır cəzalandırılacaqdır. Bu an var-dövləti, mal-qarası, bağ-bağçası, qulu lazım olandan daha çox olan insanların ruhu bədənindən çıxarkən şiddətli ağrılar verəcəkdir.

Bu həyatda hər şeydən qədərincə dadanlar isə ölüm anında da ruhun bədəndən çıxma ağrısını daha az hiss edəcəklər. Lakin harın insanlara ölüm anında – ruh bədəndən çıxarkən verilən əzab ölümdən sonra nəinki azalmayacaq, hətta daha da şiddətlənəcəkdir, çünki dünya malına bağlılıq insan qəlbinin xüsusiyyətidir. Ürək isə özü-özünə ölmür.

*VI Misal.* Ey sultan, bil ki, dünyəvi işlər insanlara elə də çətin olmayan, uzun surməyən, vaxt aparmayan əməllər kimi görünür. Lakin bir işdən yüz iş çıxar və insan bunlara həyatının əhəmiyyətli hissəsini sərf edə bilər.

İsa Peyğəmbər əleyhissalam buyurmuşdur: «Hər kim ki bu dünyaya bel bağlayır, o, sanki dəniz suyunu içən birisidir; o, bu sudan nə qədər çox içirsə, onun yanğısı bir o qədər artır. Və o, susuzluğunu yatırmadan bu suyu içə-içə ölür».

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Dənizə girən insan quru ola bilməyəcəyi kimi, dünyəvi işlərlə məşğul olan insanın da ləkələnməməsi qeyri-mümkündür».

*VII Misal.* Bu dünyada yaşayan hər bir insan gözəl evə dəvət edilmiş bir qonaqdır. Bizi evinə dəvət etmiş ev yiyəsi əvvəlcə evi təmizləyir, bəzəyir, masaya qızıl və gümüşdən düzəldilmiş əşyalar düzür. Tək-tək, on-on evə gələn qonaqlar bütün bunlardan zövq alaraq faydalanırlar. Qonaqlar evi tərk etdikdən sonra bütün bu cah-cəlal növbəti qonaqları qəbul etmək üçün öz növbəsini gözləyir.

Ürəyi təmiz olan, gözü tox olan hər bir insan qonaqlıqda işlətdiyi bu qiymətli əşyaları özü ilə aparmağı düşünmədən yerinə qoyur və evi abırla tərk edir.

Axmaq insanlar isə qonaqlıqda onlara təklif edilən bu əşyaları ona bağışlanmış sayaraq aparmaq istəyir. Gedərkən isə ev yi-

yəsi bu əşyaları geri qaytarmasını ondan xahiş edir. Qonaq buna görə həm utanc duyur, həm də etdiyi hərəkətdə özünü haqlı çıxarmağa çalışır. Bu həyat da bir qonaq evidir. Buradan yalnız yolunuzu davam etdirməyə lazım olanı götürə bilərsiniz. Hər şeyi götürməyə cəhd etmək mənasızdır.

*VIII Misal.* Bu dünyada dünya malından doymayan, kef və əyləncə ilə həyat sürən, axirət dünyasını düşünməyən insanları gəmi ilə uzaq səyahətə çıxmış kütləyə bənzətmək olar. Bu gəmi dənizin ortasında bir adaya yan alır. Kapitan gəmidəkiləri xəbərdar edir ki, qısa müddət ərzində ehtiyaclarını ödəmək, abdəst alıb namaz qılmaq üçün adaya düşə bilərlər, lakin heç bir başqa işlə məşğul olmadan tez gəmiyə qayıtmalıdırlar. Bəziləri kapitanın sözünə əməl edərək dəstəmaz alıb, namaz qılıb, dua edib, tez gəmiyə qayıdırlar. Bu insanlar tez qayıtdıqlarına görə gəminin ən yaxşı yerində özlərinə yer edə bilirlər. Digərləri isə adanın gözəlliyindən zövq alırdılar; quşların oxumasını dinləyir, rəngarəng güllərdən ibarət çəmənləri seyr edir, barlı-bərəkətli ağaclara baxırdılar. Beləri geri qayıtdıqda ən yaxşı yerləri tutulmuş görüb, məğlubiyyət qarşısında ən darısqal, qaranlıq yerlərdə özlərinə yer edirlər. Səyyahlardan bəziləri isə adanın səfasından zövq almaqla bərabər, müxtəlif rənglərə bərq vuran daşları da özləri ilə götürməkdən çəkinmirlər. Gəmidə isə onlara ən qeyri-münasib yerlər qismət olur – üstəlik, yer çox darısqal olduğundan özləri ilə gətirdikləri daşları boyunlarından asmağa məcbur olurlar. Bir neçə gündən sonra daşların rəngi qaralır və onlardan pis iy gəlməyə başlayır. Darısqallıqdan onlar bu daşları dənizə atmağa məcbur olurlar. Bu səyyahlar daşları ağır zəhmət hesabına toplamalarına çox peşiman idilər. Lakin elələri də var idi ki, əsrarəngiz adanın sehri qarşısında hər şeyi unudaraq gəmiyə də qayıtmadı. Onlar gəmidən olan çağırışlara da fikir vermədilər. Adada qalan bu səyyahlardan bəziləri aclıqdan öldü, bəziləri isə canavar və çaqqal kimi vəhşi heyvanların şikarı oldu.

Hamıdan əvvəl gəmiyə qayıdanlar ürəyində Allah xofu olan - iman əhli, həlak olanlar isə Allahı unudub bu dünyanın səfasına uyaraq ona güvənən allahsızlar və bütpərəstlər idi. Rəhmli və Bağışlayan Allah buyurmuşdur: *«Bu (əzab) ona görədir ki, onlar dünyanı (Fani dünya malını) axirətdən (axirət nemətlərindən) üstün tutarlar» (Quran, 16:107).*

Gəmiyə gec qayıdanlar isə ürəklərində Allah imanı olan, lakin hələ də dünya nemətindən əl üzmək istəməyən insanlardır;

onlardan bəziləri zəngin ola-ola bu həyatdan zövq alıblar, bəzilər isə kasıb, fəqir olmalarına baxmayaraq, həyatda səfa sürə bilirdilər, lakin bir gün günahları onların üzərində qələbə qazana bildi və onlar da bu fani dünyanın ləkələnmişləri oldular.

*IX Misal.* Bir dəfə Əbu Hüreyrə, Allah ondan razı olsun, demişdir ki, Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, belə buyurmuşdur: «Əbu Hüreyrə, istəyirsən mən sənə dünyəvi həyatı göstərim? O cavab verib: «Bəli, ey Allahın Elçisi». Bu zaman Rəsul onun əlindən tutub, içərisində insan başları, sümüklər və digər murdarlığın olduğu bir çirkab quyusunu göstərərək deyib: «Ey Əbu Hüreyrə, bu gördüyün başlar bir zamanlar sizin başınız kimi dünya malına sahib olmaq üçün düşünüb çalışırdı. Onlar da sizin kimi uzun həyat arzusu ilə dualar edirdilər. Sizin kimi var-dövlət toplayırdılar ki, bu dünyada özlərinə həyat qursunlar. İndi isə görürsən ki, bədənləri külə dönmüş, sümükləri çürümüşdür. Bu paltarlarla isə bir vaxtlar onlar özlərini bəzəyirdilər. İndi isə külək bu paltarları quyudakı çirkaba gətirib atmışdır. Bu heyvan sümükləri isə onların vaxtı ikən üzərində dünya ölkələrini gəzdikləri heyvanların sümükləridir.

Bu çirkab isə bir vaxtlar onların bir- birinin əllərindən qapdıqları, min hiylə ilə qazandıqları ləzzətli yeməklərdir. İndi isə onların üfunətindən bura heç yaxın da düşmək olmur.

Gördüyün kimi, bu, dünyəvi həyatın nəticəsidir. Və hər kim ki onun üçün göz yaşı tökmək istəyir, qoy etsin, çünki o, göz yaşı tökməkdən ötrüdür». Əbu Hüreyrə daha sonra dedi: «Bundan sonra orada iştirak edənlərin bəziləri ağladı».

*X Misal.* İsa Peyğəmbər əleyhissəlam zamanında yol ilə gedən üç nəfər xəzinə tapır. Onlar ac olduqları üçün aralarından bir nəfəri yemək almağa göndərirlər. Yemək almağa gedən yolda öz-özünə deyir: «Əgər mən onların yeməyinə zəhər qatsam, onlar öləcək və bütün xəzinə mənə qismət olacaqdır». O, düşündüyü kimi edərək yeməyi zəhərləyir. Digər iki nəfər isə belə qərara gəlirlər ki, yoldaşları gələn kimi onu tutub öldürsünlər və xəzinə yalnız onlara qismət olsun. Yemək dalınca gedən geri qayıdan kimi digər iki nəfər onu tutub öldürür. Daha sonra onlar zəhərli yeməyi yeyərək özləri də ölürlər. Buradan keçən İsa Peyğəmbər, ona salam olsun, öz əshabələrinə buyurmuşdur: «Bu – dünyəvi həyatdır. Bir baxın, o, onları necə də məhv edib, özü isə hələ də mövcuddur. Dünyəvi həyatın arxasınca gedənlərə lənət olsun».

**İkinci mənbə – ölümdən əvvəlki son nəfəs haqqında bilgi**

Ey hər şeydən məlumatlı, təcrübəli sultan, bil ki, insanlar iki növə bölünürlər: birinci növ insanlar bu həyatın yalnız zahirini görüb uzun həyata ümid edən və son nəfəslərini düşünməyənlərdir. Digərləri isə ağıllı insanlardır. Onlar axirəti, son nəfəsi və bu dünyanı imanlı şəkildə tərk etmək üçün düşünənlərdir; onlar bilirlər ki, bu dünyadan qəbir evinə nə aparmaq mümkündür, nə isə onlardan sonra düşmənlərinə qismət olacaq. Bu isə onlar üçün axirətdə də çox ağır cəza və tənbehə çevrilə bilər.

Bunu hər kəs, xüsusən hökmdarlar bilməlidir. Çünki məhz onlar tez-tez insanların qəlbini narahat edir, allah bəndələrini qorxudur, onların qəlbinə bu yol ilə hökm edir və əyanları ilə insanlara zülm etdirirlər. Bu bir həqiqətdir ki, Allahın heç kəsin canını qurtara bilmədiyi ölüm mələyi kimi tanınan Əzrail adlı mələyi vardır. Və sultanın bütün müvəkkilləri qızıl və qida ilə mükafatlandırıldıqları halda, sultan özü rahatlıqdan başqa, heç bir mükafat almayacaqdır. Sultanın tapşırıqlarını yerinə yetirənlər müdafiə olunacaqları halda, sultanın özünə heç bir müdafiə kömək etməyəcəkdir. Onun əmrlərini yerinə yetirənlər ölümdən elə həmin gün və həmin saat möhlət hüququna malik olacaqlar: əmr və tapşırıqları verənin özünə isə heç bir möhlət verilməyəcəkdir. Əzrail ilə bağlı, onun möcüzəli əməllərindən xəbər verən hadisələr haqda çoxsaylı məlumatlar var. Biz yalnız bir əhvalatı misal gətirəcəyik.

**1-ci Əhvalat**

Bu hadisəni islam dinini qəbul etmiş yəhudi alimi Bəhb ibn Münəbbih nəql etmişdir. Günlərin bir günü məşhur hökmdarlardan biri ölkəsinin əhalisinə heyvan dərilərindən tikilmiş libaslarını nümayiş etdirmək üçün səfərə çıxır. Öz hakimiyyətini nümayiş etdirmək üçün isə o, vəzir və vəkillərinə onu müşayiət etmək əmri verir. Daha cah-cəlallı görünsün deyə, hökmdar daş-qaşla bəzədilmiş ən iti çapan atını minir. Onu əhatə edən əyanlarının, əsgərlərin arasında şəstlə səfər edən hökmdara birdən lənətlənmiş İblis rast gəlir. İblis hökmdarın burnuna öz nəfəsini üfürərək, özündən razılıq hissini daha da artırır. Bu hissin təsiri altında şah özü-özünə deyir: «Bu dünyada mənə tay varmı?» Bundan sonra şah daha şəstlə, heç kəsi saymadan yoluna davam edir. Elə bu zaman onun qar-

şısını nimdaş geyimli bir kişi kəsərək ona salam verir. Şah bu salamı cavabsız qoyur. Adam atın üzəngisindən tutub onu saxlayır. Qəzəblənmiş şah onun üstünə qışqırır: «Əlini çək, məgər bilmirsən kimin atının üzəngisini tutmusan?». Kişi belə cavab verir: «Mənim səninlə çox vacib işim var". Hökmdar deyir: «Gözlə, indi atdan düşərəm».

Kişi yalvarırcasına davam edir: «Mən sənin atdan düşməyini gözləyə bilmərəm». Hökmdar soruşur: «Yaxşı, işin nədir?». Kişi əlavə edir: «Bu bir sirrdir və mən onu yalnız sənin qulağına deyə bilərəm». Şah kişiyə doğru əyilərkən deyir: «Mən ölüm mələyiyəm və canını almaq istəyirəm». Hökmdar özünü itirərək deyir: «Mənə bir qədər möhlət ver ki, evə gedib arvadım və uşaqlarımla vidalaşım». Kişi isə belə cavab verir: «Xeyr, sən bir də onları görməyəcəksən. Çünki sənin vaxtın artıq bitib». Və o, şahın canını elə at üstündə də alır.

Buradan qayıdan mələk əməlisaleh bir insanın yanına gedir. Bu kişi mələyin salamına salamla cavab verir. Mələk ona deyir: «Mənim sənə sözüm var. Lakin bu bir sirrdir». Kişi cavab verir: «Elə isə qulağıma de». Mələk deyir. Kişi isə: «Xoş gəlmisən, Allaha çox şükür ki, sən gəldin. Mən sənin yolunu çoxdan gözləyirəm, sənin gəlişin bir qədər uzun çəkdi». Mələk ona deyir: «Əgər bir işin varsa, get onu həll et». O cavab verir: «Mənim üçün Allahımla görüşməkdən vacib iş ola bilməz». Mələk buyurur: «Mənə deyilib ki, sənin canını sən istədiyin şəkildə alım». Kişi cavab verir: «İzn ver, dəstəmaz alıb, namaz qılım. Mənim canımı namaz üstə alarsan». Ölüm mələyi onun canını arzuladığı şəkildə alaraq, Allah-təalanın hüzuruna aparır.

**2-ci Əhvalat**

Deyilənə görə, məşhur bir hökmdarın çoxlu var-dövləti olub. O, Allahın yaratdığı bütün nemətləri toplayıbmış ki, şöhrətli olsun və həyatını topladığı nemətləri xərcləməklə keçirsin. O, şahlara layiq bir saray tikdirir. Sarayda möhkəm qapılar, çoxlu sayda qulluqçu, əsgər və keşikçilər var idi. Bir gün hökmdar öz yaxınlarını, qohumlarını, əyanlarını saraydakı ziyarətə dəvət edərək, onlara ləziz yeməklər və hədiyyələr verir. Taxtındakı döşəkçəyə dirsəklənən şah öz-özünə belə deyir: «Ey könül, sən bütün dünya malına sahib olmusan, indi isə sakitləş, ye, iç, kefini gör».

Şah sözünü deyib qurtarmamış, sarayın qabağında nimdaş geyimli, boynunda torba asılan bir nəfər peyda olur. O, sarayın qapılarını elə döyür ki, bütün divarlar lərzəyə gəlir. Bundan qorxuya düşən qulluqçular: «Ey, miskin, bu nə səsdir, nə tərbiyəsizlikdir? – deyirlər,- gözlə, biz yeyəndən sonra artıq nə qalsa, sənə də verərik». Kişi deyir: «Hökmdarınıza deyin ki, mənim yanıma gəlsin, vacib sözüm var». Qulluqçular deyirlər: «Rədd ol, sərsəm! Sən kimsən ki, hökmdarımız sənin yanına gəlsin?». O cavab verir: «Sizə dediyimi ona çatdırın". Qulluqçular hadisəni şaha nəql edərkən, o deyir: «Nə üçün siz onu buradan qovmamalısınız?»

Bundan sonra qapı daha bərk döyülür və qulluqçular onu cəzalandırmaq üçün əllərində silah hücum edirlər. Bu an o deyir: «Yerinizdə qalın, çünki mən ölüm mələyiyəm». Bu, hamını bərk qorxuya salır və hökmdarın əmrini yerinə yetirməyə tərəddüd edirlər. Bunu eşidən şah buyurur: «Ona deyin ki, mənim əvəzimə başqa birisini aparsın». Mələk deyir: «Mən əvəz aparmıram, məhz sənin dalınca gəlmişəm. Sənin toplayıb qoruduğun var-dövlətindən heç bir fərqin yoxdur». Nitqi tutulmuş şah güclə deyir: «Lənət olsun o var-dövlətə ki, məni yolumdan azdırmış, Allahıma dualar etməyi unutdurmuşdur. Mən belə düşünürdüm ki, bu var-dövlət məni xoşbəxt edəcək, indi isə görürəm ki, əksinə oldu. O, mənə bədbəxtlik gətirdi. İndi əliboş qalmışam. Bütün topladıqlarım isə düşmənlərimə qismət oldu». Elə bu zaman Allah onun var-dövlətinə nitq verir. Və o, dilə gələrək deyir: «Nə üçün məni lənətləyirsən? Özünə lənətlər yağdır. Allah səni də, məni də torpaqdan yaratmış, məni sənə qismət etmişdir ki, sən kasıblara əl tutasan, məscidlər, körpülər, ölkənin sərhədlərində qalalar tikdirəsən və bununla axirətdəki xoşbəxt həyatını təmin edəsən. Sən isə məni yalnız öz zövqü-səfan üçün toplamısan. Sən mənə sahib olduğun üçün heç Allaha da təşəkkür etmədin, indi isə məni düşmənlərinə qoyub gedirsən. De, hansı günahlarıma görə sən məni lənətləyib nifrət edirsən?!». Sonra ölüm mələyi şaha ağzındakı sonuncu tikəsini də udmağa imkan vermədən canını aldı və şah ölərək taxtdan yerə sərildi.

**3-cü Əhvalat**

Yəzid ər-Fəkkaşi, Allah ondan razı olsun, belə nəql edirdi: «İsrail tayfasında çox qəddar bir hökmdar vardı. Bir gün onun yanına əcaib görkəmdə, çox qorxunc görünən bir kişi gəlir. Bundan

bərk qorxuya düşən hökmdar tez soruşur: «Ey insan, sən kimsən? Mənim evimə səni kim buraxıb?». O cavab verir: «Mən bura bu evin sahibinin razılığı ilə gəlmişəm, mən o kəsəm ki, mənə heç kəs mane ola bilməz, heç bir qəddar hökmdar məni nə qorxuda, nə də əlimdən qurtula bilməz. Mən harasa gəlmək üçün heç bir şahdan icazə almıram». Bunu eşidən şahın qorxudan ürəyi əsir, nitqi tutulur: «Sən ölüm mələyisən!». O cavab verir: «Bəli!». Şah yalvararaq deyir: «Səni yaradan Allaha and verirəm, mənə bircə gün möhlət ver ki, tövbə edim, Allahımdan rəhm diləyim və Yaradanın qəzəbinə tuş gəlməmək üçün topladığım var-dövləti öz həqiqi sahiblərinə geri qaytarım». O deyir: «Axı mən sənə necə möhlət verə bilərəm? Sənin vaxtın tamamdır». Hökmdar yenə yalvarır: «Elə isə, mənə bircə saatlıq möhlət ver». Mələk deyir: «Sənin heç bircə saatın da qalmayıb. Sən həyata laqeyd yanaşıb, günlərini bada vermisən». Hökmdar soruşur: «Sən məni Allahın hüzuruna sorğu-suala apararkən yanımda kim olacaq?». O cavab verir: «Yalnız sənin əməllərin». Hökmdar deyir: «Axı mənim heç bir işim, əməlim yoxdur». Mələk deyir: «Onsuz da sənin yerin Cəhənnəm, son işin isə Allahın cəzasını çəkmək olacaq». Daha sonra mələk hökmdarın canını alır və o ölərək taxtdan yerə sərilir. Hökmdarın ölüm xəbərini eşidən şəhər əhli ah-nalə qaldıraraq göz yaşı tökürlər. Əgər onlar bilsəydilər ki, hökmdarlarını Allahın hansı cəzası gözləyir, ah-nalələri daha yüksək, göz yaşları isə daha çox olardı.

**4-cü Əhvalat**

Belə nəql olunur ki, bir dəfə Əzrail Süleyman ibn Davudun yanına gəlir və Süleymanın yanında əyləşən bir kişiyə diqqətlə baxır. Əzrail otaqdan çıxdıqdan sonra bu kişi soruşur: «Ey peyğəmbər, bu adam kim idi?». Peyğəmbər cavab verir: «Ölüm mələyi». Kişi həyəcanla deyir:

«O, çox diqqətlə mənə baxırdı, yəqin canımı almağa gəlib. Yalvarıram, məni onun əlindən xilas et». Peyğəmbər soruşur: «Axı mən səni necə xilas edə bilərəm?». Kişi deyir: «Küləklərə əmr et ki, məni Hindistanın ən uzaq guşəsinə aparsınlar. Bəlkə o, məni orada tapa bilməyə». Peyğəmbər kişinin istədiyini küləklərə əmr edir. Çox kecmədən külək onu Hindistana aparır. Bir qədər sonra Əzrail Süleyman Peyğəmbərin yanına qayıtdıqda peyğəmbər ondan soruşur: «Sən nə üçün o adama elə diqqətlə baxırdın?». Mələk cavab verir: «Mənə əmr edilmişdi ki, bu gün onun canını Hin-

distanda alım. Mən isə təəccüblənirdim ki, onu Hindistandan çox-çox uzaq bir yerdə görürəm. Lakin Allahın əmri yerinə yetsin deyə, qəfil külək əsib, onu canı alınacaq yerə apardı.

**5-ci Əhvalat**

Belə nəql edirlər ki, bir gün İskəndər Zülqərneyn[9] heç bir dünya malına malik olmayan bir tayfanın yanından keçirmiş. Bu tayfa əhli ölülərini qapılarının ağzında basdırır, tez-tez bu qəbirlərə qulluq edir, təmiz saxlayır və Allaha dualar edirmişlər. Onların qidası ot və dən imiş. İskəndər bu tayfanın şahını yanına çağırtdırmaq üçün adam göndərir. O isə bu dəvəti qəbul etməyərək deyir: «Mənim onunla heç bir işim yoxdur». Bunu eşidən İskəndər özü onun yanına gedərək soruşur: «İşləriniz necə gedir? Nə üçün sizin qızılınız, gümüşünüz, dünya malından heç nəyiniz yoxdur?». O cavab verir: «Çünki bu dünyada heç kim dünya malından doymayıb». İskəndər yenə soruşur: «Bəs nə üçün sizin qəbirləriniz qapılarınızın ağzındadır?» Şah cavab verir: «Ona görə ki, ölümü hər an xatırlayaq və dünya malına olan laqeydliyimiz qəlbimizdə azalmasın. Yoxsa dünya malı bizi Allah yolundan azdıra bilər». İskəndər yenə soruşur: «Bəs siz ancaq otla necə qidalanırsınız?» O cavab verir: «Biz mədəmizi heyvanların məzarına çevirmək istəmirik. Onsuz da yemək ləzzəti udlaqdan o yana keçmir». Sonra o, əlini pəncərədən çölə uzadaraq, oradan bir insan kəlləsini götürüb, Zülqərneyndən soruşur: «Ey Zülqərneyn, heç bilirsən, o, kim olub?». İskəndər cavab verir: «Xeyr». Şah deyir: «O, öz əyanlarına zülm edən, onlarla ədalətsiz rəftar edən və buna görə də Allah tərəfindən canı alınaraq Cəhənnəmə vasil edilən dünya şahlarından biridir. Bu isə onun başıdır». Daha sonra o, əl uzadaraq başqa bir kəlləni götürüb, İskəndərin qarşısına qoyaraq, yenə də soruşur: «Bəs bunu tanıyırsan?». İskəndər cavab verir: «Xeyr». O deyir: «O, çox ədalətli, öz əyanları ilə sevgi və mərhəmətlə rəftar edən və buna görə də ölümündən sonra ruhu Allah tərəfindən Cənnətə göndərilən bir şah olub».

Daha sonra o, əlini Zülqərneynin başına qoyaraq deyir: «Bəs sənin başın bu iki başdan hansı birinə tən olacaq?». Hönkür-hönkür ağlayan Zülqərneyn onu öz bağrına basaraq deyir: «Əgər mənim dostluğumu qəbul etsən, səni özümə vəzir edər, varidatımı isə

---

[9] Zülqərneyn – «İki buynuzlu», Makedoniyalı İskəndərin ləqəbi. O, məşhur sərkərdə, fateh, böyük dövlətin yaradıcısı olmuşdur (e.ə.323-cü ildə vəfat etmişdir).

səninlə bölərəm». O cavab verir: «Mənim buna heç bir ehtiyacım yoxdur». İskəndər soruşur: «Niyə?». O cavab verir: «Çünki bütün insanlar dövlətinə və hakimiyyətinə görə səninlə düşməndirlər. Lakin onların hər biri sadəliyimə, kasıbçılığımdan məmnun, aza qane olduğuma görə mənimlə dostdurlar. Və belə olduqda Allah hər zaman səninlədir».

İndi isə sən son nəfəs, onun gizli mənası haqqında hadisələr bilməli və mənimlə birlikdə etibarlı bilgilər əldə etməlisən. Sən bilməlisən ki, insanlar çox laqeyd yaşayırlar. Ölümdən qaçmaq üçün çırpınırlar və əcəl haqqında söhbətləri sevmirlər ki, dünya malına olan ehtirasları, yeyib-içib, kef çəkdiklərinin ləzzəti azalmasın.

Bir hədisdə deyildiyi kimi, hər kim ki ölümü və qəbir evini unutmur, məzarı Cənnət bağı olacaq və hər kim ki ölümünü unudub, onu xatırlamır məzarı Cəhənnəm quyusuna çevriləcəkdir. Peyğəmbərimiz kafirlərlə müharibədə ölən şəhidlərin mükafatını təsvir edərkən Aişə (Allah ondan razı olsun) soruşur: «Ey Rəsul! Şəhid kimi ölməyən şəhidlik zirvəsinə ucala bilərmi?». Və o əleyhissəlam belə cavab verir: «Hər kim ki, gündə 20 dəfə ölümünü düşünür, şəhidlik zirvəsinə ucalacaqdır».

O əleyhissəlam buyurmuşdur: «Ölümü tez-tez düşünün, bu, günahlarınızı yuyar və sizin həyata sevginizi azaltmış olar». Və ondan soruşublar: «Ən ağıllı və aqil insan kimdir?» O əleyhissəlam cavab verib: «Ən ağıllı insan o kəsdir ki, hamıdan çox ölümünü düşünür, ən aqili isə onun gəlişinə ən çox sevinəndir; belələrinə həm bu dünyada, həm o dünyada hörmət və ehtiram var. Və dünyəvi həyatı biz buyurduğumuz kimi dərk edib, son nəfəslərini düşünənlərin bu dünyadakı işləri çətin olmayacaq»; onun qəlbində «İnam ağacı» daha dərinə kök atıb, inkişaf edib qollu-budaqlı olacaq və o, Allahını həqiqi inamla qarşılayacaqdır. Qüdrətinə və sözünün gücünə həmd olan Allah sultanın əqlini nurlandıracaqdır ki, o, dünyəvi və axirət həyatını yaxşı dərk edə bilsin, gələcək həyatını düşünərək Allahım bəndələrinə və yaratdıqlarına qarşı mərhəmətli olsun. Çünki hökmdarın allah bəndəsi olan milyonlarla əyanı vardır. Əgər ki, o, onlarla ədalətli davransa, özünə tərəfdar qazanar və onların tərəfdaşlığını, müdafiəsini qazananın Qiyamət günü qorxusu yoxdur. Əgər ki, hökmdar onlarla pis rəftar edibsə, əyanlar dönüb düşmən olacaq və hökmdarın vəziyyəti çətinə düşəcəkdir. Tərəfdaşları düşmənə çevrilən hökmdarın vəziyyəti çox ağır olur.

**I Fəsil**

# ƏDALƏT, ŞAHLAR VƏ ONLARIN HƏYAT TƏRZİ HAQQINDA

Bil və agah ol ki, Onun (Ona həmd olsun!) yaratdığı insanlardan peyğəmbərlər (onlara salam olsun) və hökmdarlar onun seçilmişləridir. Allah peyğəmbərləri bu dünyaya göndərib ki, onlar bəndələrə Allaha düzgün ibadəti və Onun dərki yaşarını öyrətsinlər. Və Aqil Allah hökmdarları seçib ki, onlar əyanları arasında ixtilafa yol verməsinlər, dünyəvi məsələlərin həllinə maraq göstərsinlər. Qadir Allah hökmdarlara ən yüksək mövqe bəxş etmişdir.

Hədislərdə deyildiyi kimi, sultan Allahın yerdəki kölgəsidir. Və bil ki, Allahın yerdəki kölgəsi olub hökmdarlığa ucalan hər kəs Onun bəndələri tərəfindən sevgi ilə qarşılanmalıdır. Onlar hökmdarlarının arxasınca gedib, ona tabe olmalı, etibar etməli və onunla mübahisəyə girməməlidirlər. Uca Allah buyurub: *«Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar sahiblərinə itaət edin» (Quran, 4:59).*

Qəlbində Allah inamı olan hər kəs şahları, sultanları sevməli, onların əmrlərinə tabe olaraq bilməlidir ki, Yaradan istədiyi bəndəyə şahlıq bəxş edir. Qadir Allah buyurmuşdur: «Ey Məhəmməd, de: *«Ey mülk sahibi olan Allah! Sən mülkü istədiyin şəxsə verər, istədiyin şəxsi yüksəldər, istədiyin şəxsi alçaldarsan. Xeyir yalnız Sənin əlindədir. Həqiqətən, Sən hər şeyə Qadirsən»» (Quran, 3:26).*

Ədalətli sultan əyanları ilə ədalətli olub zülm və haqsızlığa yol verməmişdir. Ədalətsiz sultanın hökmdarlığı uzun sürmür, çünki Peyğəmbərimiz belə buyurub: «Allahsız hökmdarın hakimiyyəti uzun sürər, ədalətsizin isə yox».

Salnamələrdə deyilir ki, atəşpərəstlər[10] dörd min il bu dünyaya hökmranlıq ediblər. Bu hakimiyyət ona görə uzun sürmüşdür ki, onlar öz rəiyyətləri ilə ədalətli, işlərində ciddi olublar. Onlar öz icmalarında qəddarlıq və ədalətsizliyə qətiyyən yol vermirdilər. Ölkədəki işlərin təşkili məhz ədalətlə həyata keçirilir, rəiyyətə münasibətdə ayrıseçkiliyə yol verilmirdi.

[10] Zərdüştlük, atəşprəstlik – qədim İran əhalisinin dini

Və bilməlisən ki, bu dünyanın çiçəklənməsi, böhrana düşməsi şahlardan asılıdır. Əgər sultan ədalətlidirsə, dünya inkişaf edir və rəiyyət xoşbəxt yaşayır. Ərdəşirin, Əfridunun, Bəhramgurun və Xosrov Ənuşirəvanın dövründə məhz belə olmuşdur[11]. Yox, əgər sultan ədalətsizdirsə, o zaman dünya əd-Dahhakın, Əfrasiyabın, Yəzdətgur əl-Hatinin dövründəki kimi qaranlığa qərq olacaqdır.

Və əgər ki, yuxarıda qeyd etdiklərimizdən kimsə narazı olub soruşsa ki, atəşpərəstlərə 4000 il bu dünyanın idarə edilməsi necə həvalə oluna bilərdi? Biz cavab veririk: «Çünki onlar zülm və qəddarlıq göstərmədən əmr edir, ədalətli tədbirlər görürdülər». Bu kitabda biz çalışacağıq ki, bu sülaləyə məxsus olan hər bir hökmdarın həyatı, onların şahlıq dövrü, rəiyyətlə münasibətləri və bu sülalənin ilk şahı haqqında məlumat verək. Biz bunu ardıcıl, adbaad, heç nəyi təhrif etmədən çatdıracağıq.

## Şah sülaləsindən olan hökmdarlar haqqında hekayətlər

Adəm haqqında rəvayətlərdə deyilir ki, onun övladlarının sayı çoxaldıqdan sonra o, Şit və Kayumrat adlı övladlarına «Həyat kitabından» 40 səhifə verərək tapşırıb ki, burada yazılanlara əməl etsinlər. O, Şitə dünya işlərini və axirətə nəzarəti, ilk hökmdar olub 30 il hakimiyyət sürən Kayumrata isə şahlıq həvalə edir. Ondan sonra hökmdar Şink olmuş və hakimiyyəti 40 il davam etmişdir. Ondan sonra cinlərlə mübarizə aparan və 30 il hakimiyyət sürən Taxtamurt gəlir. Ondan sonra müxtəlif döyüş ləvazimatı, atıcı silah icad edən, böyük işlər görərək 700 il hakimiyyət sürən Cəmşid gəlir. Ondan sonra isə xəbis, cadugər olub bədlik gətirən, əd-Dəhhak[12] kimi tanınan Bayurasb gəlir. Bu qəddar tiranın hakimiyyəti 1000 il sürüb. Ondan sonrakı Əfridun xeyirxah ada, xoş görünüşə və mülayim xarakterə malik idi. Onun hakimiyyəti 500 il sürüb. Ondan sonra gələn Mənuçöhr bir çox elmlərdən hali olmuş, xeyli sayda böyük işlər görərək 120 il şahlıq etmişdir.

Ondan sonra hakimiyyətə 22 il şahlıq edən Kudaris gəlir. Hakimiyyət daha sonra türklərin Qasqalid adlandırdıqları İran şahı

---

[11] Müəllif əfsanəvi qədim fars hökmdarlarından Əzdəşir ibn Babək Sasan, Əfridun ibn Əskəban ibn Cəmşid, Bəhramgur ibn Yəzdəgird əl-Asim və Xosrov şah Ənuşirəvan ibn Kəbəz ibn Feyruz ibn Yəzdəgird ibn Bəhramgurun adlarını çəkir.

[12] «Əd-Dəhhak» – şən, baməzə

Əfrasiyaba keçib. O, çox mərd idi. Onun süvari və atlı ordusu düşməni hər zaman narahat edirdi. Əfrasiyab 12 il bir ay hakimiyyət sürüb. Ondan sonra 50 il hakimiyyətdə olan Ravinin Təhmasib də öz şücaəti ilə seçilirdi. Ondan sonrakı Kaykibad isə əsl strateq, sərkərdə olmuş və öz rəiyyəti ilə çox mülayim davranmışdır. Onun hakimiyyəti 120 il sürüb. Ondan sonra 120 il hökmdarlıq edən Keykavus isə özünəməxsus şahlıq fəaliyyəti ilə fərqlənirdi. Ondan sonra gələn və 60 il hakimiyyət sürən Keyhasir isə əməlisaleh adam olmuş və gözəl həyat yaşamışdır. O, çox məharətlə ölkələrarası danışıqlar aparmış və böyük işlər sahibi idi. Ondan sonra gələn və 120 il şahlıq sürən Kəharasib isə həm hərbi, həm də dəhşətli işlərin gözəl bilicisi idi. Ondan sonra müdrikliyi ilə seçilən Təminasif 120 il hökmdarlıq etmişdir.

Daha sonra 93 il hakimiyyət sürən Əsfəndiyar gəlir. Ondan sonra Zərdüştlük[13] dininə sitayiş edən və 120 il hakimiyyət sürən Kəştasib gəlir. Ondan sonra hakimiyyətə 112 il hökmdarlıq edən Bəhmən ibn Əsfəndiyar gəlib. O, çox zalım, eyni zamanda döyüşkən ruhlu, apardığı döyüşlərdə isə hər zaman bəxti gətirən bir şah olmuşdur. Daha sonra hakimiyyətə onun qızı Həmani gəlib. 17 il hökmranlıq etmiş Həmani dövlət işlərində daha çox öz fikirlərinə əsaslanır və öz addımlarını daha mütərəqqi sayırdı. Ondan sonra 41 il hakimiyyət sürən Daran isə çox zəif və qorxaq olub. Onu bütün işlərində bədbəxtlik müşayiət edirdi. Ondan sonra hakimiyyətə gələn Daran ibn Daran isə əksinə, mahir sərkərdə və ağıllı hökmdar idi. Onun dövləti 50 il mövcud olub.

Ondan sonra hakimiyyətə Zülqərneyn kimi tanınan yunanıstanlı İskəndər gəlir. O, tez-tez uzaq səfərlərə çıxır, möcüzələri sevir, ölkələr fəth edərək, hakimləri özünə tabe edirdi. İskəndərin hakimiyyəti 36 il davam edib. Ondan sonrakı şah Əzdəşir ibn Babək ibn Sasan olmuş və onun hakimiyyəti 78 il sürmüşdür. Ondan sonrakı Sabur 33 il hakimiyyət sürmüşdür. Daha sonra gələn Azdəmird 30 il üç ay hökmranlıq edib. Daha sonra 20 il şahlıq edən Bəhram ibn Bəhramiyan gəlir. Sonra 9 il şahlıq edən Nursi gəlir. Ondan sonra Hərməz ibn Nursi gəlir və o, 70 il 5 ay hökmdarlıq etmişdir. Ondan sonra 70 il hakimiyyət sürən Sabur gəlir. Ondan sonra onun qardaşı olan və 20 il hakimiyyət sürən Azdəmir gəlir. Ondan sonra isə hakimiyyəti 5 il davam edən Sabur ibn Sabur gə-

[13] Zərdüşt – c.ə.II-I minilliklərdə Zərdüştilik dininin banisi

lir. Ondan sonra isə taxt-taca 12 il sahib olmuş Bəhram ibn Sabur gəlir. Daha sonra 30 il hakimiyyət sürən və ədalətsizliyi, qəddarlığı, əxlaqsızlığı ilə tanınan Yəzdəgird gəlir.

Ondan sonra hakimiyyətə Bəhramgur gəlib. O, dövlətin idarə edilməsini yaxşı bilən, mahir ox atan, ova, müxtəlif oyunlara həvəs göstərən, şəraba, ünsiyyətə meylli olan bir hökmdar idi. Onun hakimiyyəti 63 il davam edib. Ondan sonrakı şah isə 80 il hakimiyyət sürən Yəzdəgird olub. Sonra hakimiyyətə Hərməz gəlmiş və o, 11 il hökmdarlıq etmişdir. Ondan sonra 11 il hakimiyyət sürmüş Feyruz ibn Hərməz gəlir. Ondan sonra 5 il 2 ay şahlıq etmiş Əsgər gəlir. Ondan sonra gələn Keykibad isə 40 il hakimiyyət sürmüşdür. Ondan sonra gələn müdrik Cəmasib 1 il altı ay hakimiyyət sürüb. O, ulduzlar haqqındakı elmi bilir və bu elm haqqında ağıllı, məntiqi düşüncələrə malik idi. Ondan sonra Xosrov Ənuşirəvan gəlir. O, ədalətli, imkansızlara kömək edən, haqlı qərarlar qəbul edən bir şah kimi tanınmış və 48 il hakimiyyət sürmüşdür.

Ondan sonrakı Hərməz 12 il hakimiyyət sürmüşdür. Ondan sonra 38 il hakimiyyət sürmüş Xosrov ibn Əbraviz isə çox sayda xəzinəyə, var-dövlətə, silah-sursata sahib olmuş və şənliklərin, zövq-səfanın böyük aludəçisi idi. Əgər biz bunu qələmə alsaq, böyük bir kitab yaranar. Ondan sonra 7 il hakimiyyət sürən Şeyravih ibn Xosrov isə xain bir hökmdar kimi tanınır. Ondan sonrakı Əzdəşir isə 1 il altı ay hakimiyyətdə olub. Sonra 55 gün hakimiyyət sürən Qədər gəlir. Ondan sonra Bauran Dəxt gəlir və o, 6 ay hakimiyyət sürüb. Ondan sonra Azrəmi Dəxt isə 4 ay hakimiyyət sürmüşdür. Ondan sonrakı Fərəhzad 11 ay hökmdar olmuşdur. Ondan sonra gələn və sonuncu yadelli hökmdar olan Yəzdəgird ibn Şəhriyar isə 20 il hakimiyyət sürmüşdür. Daha sonra hakimiyyət müsəlmanların əlinə keçdi. Onlar yadellilər üzərində qələbə çalıb hakimiyyətdən də sıxışdırmağa nail oldular və müsəlmanların dövləti Məhəmməd Peyğəmbərimizin, ona Allahın xeyir-duası və salamı olsun, xeyir-duası ilə güclənməyə başladı. Bu, xüsusən Ömər ibn əl-Xəttabın (Allah ondan razı olsun) hakimiyyəti dövründə daha da geniş vüsət aldı.

Bil və agah ol ki, adlarını çəkdiyimiz şahlar bu dünyaya hökmranlıq ediblər. Onlar həyatda arzuladıqlarına nail olub, ömürlərini zövq-səfa ilə keçirmişlər. Bu dünyadan köçdükdən sonra isə yuxarıda göstərdiyimiz kimi, onlardan sonra adları, əməlləri, insani xüsusiyyətləri haqqında salnamələr qalmışdır. İnsanlar onları

məhz bunlara görə tanıyır və xatırlayırlar. Və hər bir insan bu dünyadakı əməlinə görə xatırlanıb yad ediləcəkdir. Əgər o, xeyirxah olubsa, xeyirlə, zülmkar olubsa, etdiyi zülmlərlə yaddaşlarda yaşayacaqdır.

Və hər bir insan bu dünyada xeyirxahlıq toxumu səpməli, onu əskildən nöqsan və bağışlanmaz günahlardan uzaq olmalıdır. Hökmdarlar xeyirxah ad və əməlisaleh iz qoymalıdırlar ki, qəbir evində olanda pis sözlərlə xatırlanmasınlar. Şair demişkən: « Ey gənc, əgər ki, zülm qəlbinə hökm olubsa,

Tövbə et, qaç ondan!
Zəmanənin günahlarından qorx!
Və o zaman ondan xilas olarsan!
Səndən sonra qalan o xatirələr
Çalış ki, xoş sözlərlə yaddaşlarda həkk olsun.
Həyatda zövqlə əbədi yaşamağın yolu ancaq bundadır».

Deyilənə görə, insanlar öldükdən sonra onların haqqında yaşayan xatirələr bu fani dünyada onların ikinci həyatıdır. Aqil hökmdar özündən əvvəlki şahların tarixini bilməli və bu dünyanın mahiyyətini dərk etməlidir. Bu həyat çox nadir halda arzuları gerçək edir. Onun bəlaları isə həddən artıq çoxdur. Bütün ümidləri, arzuları ona bağlamaq yanlış olar. Bu, elə bir yoldur ki, bu yolun yolçusunun günaha batmaması qeyri-mümkündür və ağıllı insan çalışmalıdır ki, düşmənlərinin sayını artırmasın. Əks təqdirdə, düşmənlərlə münasibəti çözmək çətin olacaqdır. Və Böyük Yaradan – ədalətli Hakim Qiyamət günü öz rəqiblərini müdafiə etməyəcəkdir. O, bu dünyada haqqı tapdananların haqqını bərpa edəcək, haqqı tapdayanları isə cəzalandıracaqdır. Bütün dünya malı insanların onun üstündə mübarizə aparıb, ədavətə girməsinə qətiyyən dəyməz. Bununla bağlı bir əhvalat da vardır.

**Əhvalat**

Nişapurun (Xorasanın) sərkərdəsi olan Əbu Əmi ibn İlyas dövrünün ən aqil və mömin insanlarından olan şeyx Əbu Əli əd-Dəhhakinin (Allahın rəhmi onun üzərindən əskik olmasın) yanına gəlir. O, Dəhhakinin qarşısında diz çökərək deyir: «Mənə öyüd ver». Əbu Əli cavab verir: «Ey əmir! Əgər sənə bir sual versəm, mənə düzünü deyərsənmi?». O deyir: «Mən sənə düzünü deyə-

rəm». Şeyx soruşur: «Ən çox nəyi sevirsən... var-dövlətini, yoxsa düşmənlərini?». O cavab verir: «Var-dövlətimi daha çox sevirəm». Şeyx yenə soruşur: «Bəs sən bilmirsən ki, sevdiyin var-dövlət səndən sonra sevmədiyin düşmənlərinə nəsib olacaq? Və sən dövlətini özündən sonra onlara qoyub gedəcəksən». Əmir acı göz yaşları axıdaraq: «Bəli, bu mənim indiyə qədər eşitmədiyim ən kamil öyüddür», - deyir.

Və qüdrətinə şükürlər olan Ulu Yaradan bu dünyaya bizə Məhəmməd Peyğəmbəri, ona Allahın xeyir-duası və salamı olsun, elçi göndərib. Məhz peyğəmbərlərin sonuncusu olan Məhəmmədin, ona Allahın xeyir-duası və salamı olsun, xeyir-duası ilə kafir ölkələr müsəlman dövlətlərinə çevrildi. Çox mübarək bir zamanda dünyaya gələn Peyğəmbərimiz ilahi qanunlara əsaslanaraq yeni bir dünya yaratdı. O zamanlar ən ədalətli, qərəzsiz, əməlisaleh hökmdarlardan biri Xosrov Ənuşirəvan idi. Çox ağıllı siyasətçi olan Xosrov hətta özündən əvvəlki şahlardan da yüksək zirvədə idi. Bunun əsas səbəbi isə Məhəmməd Peyğəmbərimizin, ona Allahın xeyir-duası və salamı olsun, onun hakimiyyəti zamanı dünyaya gəlməsi və insanlara firavanlıq bəxş etməsindədir. Ənuşirəvan, Peyğəmbərimiz dünyaya gəldikdən sonra 2 il hakimiyyət sürmüşdür. Ənuşirəvan haqqında yüksək fikirdə olan Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, deyirdi: «Mən ədalətli hökmdarın dövründə dünyaya gəlmişəm». Həqiqətən də, o, çox ədalətli olduğundan Peyğəmbərimiz ona «ədalətli hökmdar» demişdir. Bu dünyada isə xeyirxah şöhrət, ləyaqətli ad hər şeydən ucadır. Ədalətli hökmdarlar öz rəiyyətinin qeydinə qalır, onları mükafatlandırır və düzgün siyasət yürüdürdülər. Belələrinin əməlləri hətta günlərimizə qədər gəlib çatmışdır. Hər bir ölkə öz hökmdarlarının adı ilə tanınır. Çünki onlar yaşayış məskənləri, körpü və emalatxanalar tikdirir, torpaqları şumladır, suvarma kanalları çəkdirirdilər. Qeyd etdiyimiz bütün bunları qərəzsiz, ədalətli, hər şeyin həddini gözləməyi bacaran Ənuşirəvan da yaratmışdır.

**Əhvalat**

Belə nəql olunur ki, bir gün Ənuşirəvan özünü ağır xəstəliyə vuraraq, yaxınlarına bildirir ki, onun sağalması üçün xaraba bir kənddən kərpic parçası gətirilməlidir. Bu kərpici tapmaq üçün o, ölkənin dörd bir yanına öz dostlarını göndərir. Lakin onlar ölkəni

qarış-qarış gəzdikdən sonra geri qayıdırlar. «Bütün ölkəni qarış-qarış gəzməyimizə baxmayaraq, nə bir dağılmış yaşayış məskəni, nə də onun bir parça kərpicini tapa bildik», – deyirlər. Sevincindən Allahına şükürlər edən Ənuşirəvan deyir: «Həqiqətdə isə mən ölkənin vəziyyətini və əyanlarının sədaqətini sınamaq istəyirdim. Mən öyrənmək istəyirdim ki, ölkədə bərpası vacib olan məskən varmı? Mənə məlum oldu ki, abadlaşdırılmamış heç bir məskənimiz yoxdur. Dövlətin idarə edilməsi, ölkənin vəziyyəti ən yüksək səviyyədədir».

Və bil ki, əvvəlki hökmdarlar tikintiyə böyük önəm verirdilər. Onlar başa düşürdülər ki, ölkə inkişaf etdikcə, rəiyyət də varlanacaq və onların təşəkkürləri daha da artacaqdır. Və onlar aqil və alim insanların dedikləri bu sözlərin həqiqiliyinə inanırdılar: «Ölkədəki din – şahdan, şah – ordudan, ordu puldan, pul – dövlətin inkişafından, dövlətin inkişafı - məmurların ədalətindən asılıdır». Onlar zülmə və ədalətsizliyə göz yummur və öz rəiyyətlərinin haqlarının tapdanmasına yol vermirdilər. Onlar başa düşürdülər ki, tiranların idarə etdiyi, rəiyyətə zülm edilən ölkələrin əhalisi öz məskənlərini qoyub qaçır, xəzinəyə gələn gəlirlər azalır, əyanların həyat səviyyəsi aşağı düşür və belə ölkə dağılmağa başlayır. Xalq heç zaman ədalətsiz hökmdarı sevə bilməz; belə hökmdar xalqın lənətinə tuş gələcək və bununla da həyatdan zövq almamaqla yanaşı, öz üzərinə bir çox bəlaları, hətta ölümü də çəkmiş olacaqdır. Bu kitabın müəllifi demişdir: «Ədalətsizliyin iki növü var: birinci ədalətsizlik hökmdarın rəiyyətə, güclünün gücsüzə, dövlətlinin kasıba olan haqsızlığıdır. İkinci isə sənin özünə qarşı olan ədalətsizliyindir ki, onun da səbəbi günahlarının çoxluğudur. Elə isə ədalətli ol ki, ədalətsizlikdən qurtulasan. Bununla bağlı belə bir əhvalat da var.

**Əhvalat**

Belə nəql olunur ki, İsrail tayfasında balıqçılıqla ailəsini dolandıran bir nəfər bir gün çox böyük bir balıq tutur və sevinərək özözünə deyir: «Bu balığı bazarda yaxşı qiymətə satıb, pulu uşaqlarıma xərcləyərəm». Yolda ona rast gələn orta yaşlı bir nəfər ondan soruşur: «Balığı mənə satarsan?» Balıqçı başa düşür ki, «hə» desə, o, balığı bazardakından iki dəfə ucuz qiymətə alacaq. Bu səbəbdən də: «Xeyr, satmıram», – deyir. Lakin bu kişi əlindəki taxta ilə onu

döyüb, pul ödəmədən balığı götürüb gedir. Əlacsız qalan balıqçı onu lənətlədikdən sonra deyir: «Ay Allah, sən məni zəif və kasıb yaratmısan. Onu isə güclü və dövlətli. Yalvarıram, onun cəzasını bu dünyada ver, mənim axirətə qədər dözməyə səbrim yoxdur!»

Balığı götürüb gedən kişi onu bişirmək üçün arvadına verir. Yemək hazır olduqdan sonra arvadı onu süfrəyə dəvət edir. Kişi balığa əl uzadarkən balıq birdən canlanıb, onun barmağını dişləyir. Ağrıdan rahatlığını itirən kişi həkimə gedir. Həkim ona bildirir ki, xəstəlik qola yayılmasın deyə, barmağı kəsilməlidir. O, barmağının kəsilməsinə razılıq verir. Lakin barmağı kəsildikdən sonra da ağrı azalmır, əksinə, şiddətlənir. Yenə də həkimə müraciət etməyə məcbur olur. Həkim ona bildirir ki, xəstəliyin qola keçməməsi üçün əl kəsilməlidir. Əli kəssələr də, bu dəfə də ağrıyır. Həkim qolu da dirsəyədək kəsir. Lakin ağrı bu dəfə çiyinə qədər şiddətlənir. Ağrılara dözməyən kişi bu qolunu kəsdirmək məcburiyyətində qalır. Lakin ağrı nəinki azalmır, hətta bütün çiynini bürüyür. Naəlac qalan kişi həkimdən çıxaraq, Allahına bu bəlanın qurtarması üçün yalvarmağa başlayır. Yolda o, yorğunluqdan bir ağaca söykənib yuxuya gedir və yuxuda bir kişinin ona dediyi bu sözləri eşidir: «Ey bədbəxt, sən öz bədənini hələ nə qədər kəsdirəcəksən? Get və düşməninin könlünü al». Yuxudan ayılan kişi özözünə deyir: «Mən o balığı balıqçını vurub, ona ağrı yetirərək əldə etmişdim. Elə məni də həmin balıq dişlədi. Demək mənim düşmənim o balıqçıdır». O, şəhərə gedərək həmin balıqçını tapıb, tərəddüd etmədən qarşısında diz çöküb əfv diləyir. Balığın pulunu ödədikdən sonra isə etdiyi işə peşiman olduğunu bildirir. Balıqçı da öz növbəsində onu bağışlayır. Elə həmin andaca onun ağrıları keçir və bütün gecəni o, Allaha tövbələr edir. Səhər tezdən isə Qüdrətli, Mərhəmətli Allahın rəhmi ilə o, öz əvvəlki vəziyyətinə qayıdır. Allah Musa əleyhissəlama buyurub: «Ey Musa! And olsun qüdrətimə, əgər o, düşməninin könlünü almasaydı, bütün ömrü boyu ona zülm verərdim».

**Əhvalat**

Peyğəmbər Musa əleyhissəlam Allahla dağdakı söhbətlərinin birində xahiş edir ki, Allah ona öz haqq və ədalətini göstərsin. Qadir Allah deyir: «Ey Musa, hətta sənin kimi cəsur və ciddi adam da gördüklərinə dözməyə bilər. Musa peyğəmbər deyir: «Sənin köməkliyinlə bacararam». Allah buyurur: «Elə isə, filan bulağın

yanında gizlənib, mənim qüdrətimin və ədalətimin şahidi ola bilərsən». Musa əleyhissəlam həmin yerə gedərək gizlənir. Birdən bir atlı peyda olur. O, atdan düşərək bulaq suyundan içib, dəstəmaz alır və daha sonra içində 1000 dinar olan pul kisəsini kəmərindən açaraq yanında qoyur ki, namaz qılsın. Lakin o, namaz qıldıqdan sonra pul kisəsini unudaraq, yoluna davam edir. Bundan sonra bura su içməyə gələn bir oğlan uşağı pul kisəsini götürüb gedir. Bir qədər keçdikdən sonra isə bulağa su içməyə bir kor qoca kişi gəlir. Susuzluğunu yatırdıqdan sonra o, dəstəmaz alaraq, ibadətə başlayır. Birdən atlı geri qayıdır və kor qocaya deyir: «Bir qədər öncə mən burada içində 1000 qızıl dinar olan pul kisəsini unutmuşam. Səndən başqa, bura heç kəs gəlməyib». Qoca cavab verir: «Mən koram, sənin pul kisəni necə görə bilərdim?» Qocanın sözlərinə inanmayan atlı bərk əsəbləşərək, qılıncı ilə onu öldürür. Lakin onun üzərindən pul kisəsini tapmayaraq gəldiyi yerə qayıdır.

Bütün bunları müşahidə edən Musa əleyhissəlam deyir: «Ay Allah, mənim bütün bunlara dözməyə səbrim çatmır. Sən aqil və ədalətlisən, bu baş verənləri mənə izah et». Bu an göydən yerə enən Cəbrail (ona salam olsun) ona deyir: «Qüdrəti göylərə ucalan Allah sənə deyir: «Mən bütün məhrəm olanların yaradıcısı, sənə gizlin olanların bilicisiyəm! Pulu götürüb gedən o uşağın atası həmin atlının işçisi olub, lakin o atlı ona halal qazandığı pulu verməmişdi. Uşağın atası da əməyinin qarşılığını almadan ölüb. Kisədə ona çatacaq miqdarda pul var idi. İndi o pul onun övladına qismət oldu. O kişi isə kor olmazdan əvvəl atlının atasını öldürüb. İndi isə o atlı atasının qisasını aldı. Və kor kişi də öz cəzasını çəkdi. Gördüyün kimi, bizim haqq və ədalətimiz çox dəqiqdir»». Gördüklərindən heyrətə gəlmiş Musa Allahından əfv diləyir.

Biz bu hadisəni verdik ki, aqillər bilsin; Allahdan heç bir şey gizli qala bilməz və o, haqları tapdananların haqqını həm o, həm də bu dünyada geri qaytarır. Lakin biz dərd gələndə xəbərsiz olur, onun haradan gəldiyini heç ağlımıza da gətirmirik.

Zülqərneyndən soruşurlar: «Sənin şahlığında səni ən çox sevindirən nədir?». O deyir: «İki şey; onlardan biri haqq və ədalət, ikinci isə mənim o kəslərə təşəkkürümdür ki, onlar başqaları ilə ədalətli davranarkən daha çox mənə yaxşılıq etmiş olurlar».

Və Peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Həqiqətən, Allah xoş əməlləri sevir. O hətta qo-

yunu kəsərkən ona əzab verməmək üçün bıçağını itiləyən insana da məhəbbətlə yanaşır».

Ömər ibn əl-Xəttab, Allah ondan razı olsun, demişdir ki, Peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, belə buyurub: «Allah yer üzündə ədalət qədər gözəl heç nə yaratmayıb. Və haqq-ədalət Allahın yerdəki mizanıdır və bu ölçüyə əməl edən hər kəsi O, Cənnətə aparır».

Ömər, Allah ondan razı olsun, deyib ki, Peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «Həqiqətən də, Cənnətdə əməlisaleh olanların öz yerləri var. Hətta onlar yalnız öz rəiyyətlərinə və ailələrinə yaxşılıq etmiş olsalar belə».

Kətada Quran ayətlərindən birini – *«...Çəkidə həddi aşmayasınız» (Quran, 55:8)* – şərh edərək demişdir: «O, (Allah) ədaləti nəzərində tuturdu və deyirdi: «Ey Adəm övladı! Özünə qarşı necə ədalət istəyirsənsə, başqaları ilə də elə ədalətli ol».

Və ibn Ömərə (Allah ondan razı olsun) əsaslanaraq deyirlər ki, Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Qadir Allah Adəmi yerə göndərərkən ona dörd söz deyib buyurmuşdur: «Ey Adəm, sənin bildiyin və övladlarının da biləcəyi bu dörd sözdədir: bir söz sənə, bir söz Mənə, üçüncü səninlə Mənim münasibətimə, axırıncı isə səninlə insanların münasibətinə aiddir. Mənə aid olan söz odur ki, sən Məni yaradan kimi qəbul edib, itaət et və Mənə qətiyyən şərik qoşma. Sənə aid olan söz – Mən sənə əməllərimin qarşılığını verəcəyəm. Səninlə Mənim aramda olan söz – bu, sənin Mənə olan duaların və Mənim sənə olan cavabımdır. Səninlə insanlar arasında olan söz – onlar arasında haqq və ədaləti bərqərar etməlisən».

Kətada demişdir: *«Üç növ haqsızlıq var; bağışlanmayan haqsızlıq odur ki, Allaha şərik qoşasan. Allah-təala buyurub: «Həqiqətən, Allaha şərik qoşmaq böyük zülmdür»» (Quran, 31:13).*

Və bir müddət sonra unudularaq əfv edilən ədalətsizlik bəndələrin bir-birinə qarşı olan ədalətsizliyidir. Üçüncü növ ədalətsizlik isə insanın özünə qarşı ədalətsizlikdir. İnsan bunu başa düşüb, Allahından əfv dilədikdə, Qadir Allah onu bağışlayır. Çünki harada ki Allah var, orada onun rəhmi də var.

Hökmdar dindar olmalı və dinə sevgi ilə yanaşmalıdır. Din və hökmdar sanki bir bətndən dünyaya gəlmiş ekiz qardaşlardır. O, ibadətlə məşğul olub, vacib dini ayinləri vaxtında yerinə yetir-

məlidir. Ehtiraslardan, pis vərdişlərdən, dini qanunların həyata keçməsini zəiflədə bilən hər şeydən, şəkk və şübhədən uzaq olmalıdır. Və əgər şah rəiyyətlərindən kimin öz dininə və məzhəbinə şübhə ilə yanaşdığını bilsə, onu qarşısına gətirtməli, bu bəndəni haqq yoluna çəkmək üçün onunla sərt olmalı, lazım gəldikdə təhqir edib hədələməlidir. Əgər bu bəndə günahını başa düşüb, haqq yoluna dönsə, onu cəzalandırmadan azad etməlidir. Yox, əgər bunların bir köməyi olmasa, o cəzalandırılaraq ölkədən qovulmalıdır və bununla da hökmdar dövlətin dini təməllərinin zəiflədilməsinin qarşısını alar, ölkəsini bu cür günahkar bəndələrdən təmizləmiş olar. Hökmdar çalışmalıdır ki, İslamın qüdrətini ucaltsın, sərhədyanı istehkamlar tikdirib, ordu ilə təmin etsin, peyğəmbərin dövründəki həyat tərzi yenidən bərqərar olsun. Yalnız bundan sonra o, öz rəiyyətinin hörmətini qazanıb, Allahın gözündə ucala bilər. Belə hökmdar dostlarının yanında daha yüksək mövqe qazanar, düşmənləri ondan qorxar. Və o, bilməlidir ki, Allaha itaət, möminlik hökmdarın birbaşa əxlaqı ilə bağlı məsələlərdir.

Və şah öz rəiyyətinin bütün işlərinə nəzarət etməlidir. O, bu işlərin sayına, çoxluğuna, rəiyyətin aşağı və ya yuxarı mənsəb sahibi olmalarına fərq qoymamalıdır. O çalışmalıdır ki, daha sonra məzəmmət ediləcək heç bir işlə məşğul olmasın. Hökmdar dindarlara hörmət etməli, yaxşı əməlləri mükafatlandırmalı, pis əməlləri isə qadağan etməlidir. O, pis əməl edənləri cəzalandırmalı və tez-tez günah işlədənlərin müdafiəçisi olmalıdır. Bundan örnək götürən insanlar pis işlərdən uzaq olub, yaxşı əməllərə can atacaqlar. Və əgər hökmdar pis işlərlə məşğul olan insanlara qarşı ümumi siyasət yürüdüb onları cəzalandırmasa, ölkədəki bütün işlər uğursuzluğa düçar olacaqdır.

Və aqillər deyiblər ki, rəiyyətin əməli, xasiyyəti hökmdarın əməli və xasiyyətindən asılıdır. Çünki sadə insanlar əxlaqsız hökmdarların yolunu tez tuturlar. Əyanlar da hökmdarlardan çox şey öyrənirlər. Məgər tarixdən bilmirsən ki, öməyidlər sülaləsindən olan Valid ibn Əbdülmalik dövründə insanlar kənd təsərrüfatı və tikinti ilə Süleyman ibn Əbdülmalik dövründə yeməkxanaların tikilməsi və bəzədilməsi, qarınqulu虫luq, bihumdarlıq və keflə məşğul idilər. Ömər ibn Əbdüləziz dövründə isə əksinə, vaxtlarını ibadət və oruc tutmaqla keçirirdilər. Məhəmməd ibn Əli ibn Fədl demişdir: «Mən öz gözümlə görməsəydim, inanmazdım ki, əyanların həyat tərzi onların hökmdarlarının əxlaqına uyğundur. Lakin daha

sonra müşahidə etdim ki, Valid ibn Əbdülmalik dövründə insanlar üzümlüklər, bağların salınması, sarayların, evlərin tikilməsi ilə məşğul idilərsə, onun qardaşı Süleymanın dövründə yalnız yeyib-içib, kef çəkirdilər. O vaxtlar insanların bir-birinə daha çox verdiyi sual – «bu gün nə bişirmisən?» idi. Lakin Ömər ibn Əbdüləziz dövründə isə gördüm ki, insanlar vaxtlarını Allaha ibadətlə, Quran oxumaqla, xeyir işlər görüb kasıblara kömək etməklə keçirirlər». Və bil ki, bütün dövrlərdə rəiyyət öz hökmdarını nümunə kimi qəbul edir, ona oxşamağa və hər şeydə onu yamsılamağa çalışır. Onlar hətta öz arzu və istəklərini də hökmdardan örnək olaraq qururlar. Bu barədə belə bir əhvalat var.

**Əhvalat**

Belə nəql olunur ki, ədalətli Ənuşirəvanın hakimiyyəti dövründə bir nəfər yeni aldığı torpaq sahəsində xəzinə tapır. O, torpağı ona satanın yanına gedərək hadisəni bildirir. Satan deyir: «Mən torpağı sənə satmışam. Oradan çıxan hər şey, o xəzinə də sənindir. Təbrik edirəm». Alıcı isə deyir: «Mənə başqasının əmlakı lazım deyil». Bu mübahisəni çözmək üçün onlar ədalətli hökmdar Ənuşirəvanın yanına getməli olurlar. Bu hadisədən xeyli məmnun qalan Ənuşirəvan soruşur: «Sizin övladınız var?» Onlardan biri: «Mənim oğlum var», digəri isə:«Mənim qızım»,- deyir. Bunu eşidən Ənuşirəvan belə bir təklif edir: «Mən istəyirəm ki, siz övladlarınızı evləndirib, qohum olasınız. Belə olsa, bu xəzinə sizin hər ikinizin olar. Və siz onu övladlarınızın ehtiyaclarına da xərcləyə bilərsiniz?!» Bu təklif onların hər ikisini razı salır və onlar hökmdarın istəyini yerinə yetirirlər. Əgər onlar ədalətsiz hökmdarın dövründə yaşasaydılar, yəqin ki, belə deyərdilər: «Xəzinə mənimdir». Lakin onlar bilirdilər ki, hökmdarları ədalətlidir və ona doğru olanı deməklə, ədaləti tapmaq olar. Və aqillər deyiblər ki: «Hökmdarı bazara bənzətmək olar. Bazarda isə tələbat olan mal satılır. Tələbatı olmayan mal isə əldə qalır». Və o iki şəxs sultanın haqq-ədaləti, dürüstlüyü yüksək qiymətləndirdiyini bildikləri üçün xəzinəni – bu malı onun yanına aparmışdılar.

Və bu zəmanədə rəhbərlərimizin hər bir əməli, hökmdarların dediyi hər bir söz bizə göndərilən və layiq olduğumuz bir cəzadır. Necə ki biz haram, ədalətsizlik edib, xəyanətə yol vermirik, eləcə də hökmdarlarımız ədalətsiz, özbaşına, zalım və qəddar olurlar. «Siz necəsinizsə, rəhbərləriniz də elədir». Bu hədisdə in-

sanlarla rəhbərlərin əməllərinin bir-biri ilə bağlı olduğu bir daha təsdiqlənir.

Bir ölkədə ki tikinti gedir, əhali şad, firəvan və təhlükəsiz yaşayır, bu, hökmdarın ağlının və rəiyyətə olan münasibətin ifadəsidir. Aqillər düz buyurmuşlar ki, insanlar öz zamanlarında daha çox hökmdarlarına bənzəyirlər. Bir hədisdə deyilir: «İnsanlar öz hökmdarlarının dininə sitayiş edirlər».

Və Ənuşirəvanın dövründə, onun apardığı ədalətli siyasət nəticəsində yerdə bir xəml[14] qızıl da olsaydı, onu öz sahibindən başqa, heç kəs götürməzdi.

Bir gün Ənuşirəvanın vəziri Yunan ona deyir: «Pis insanların yolunu tutma, yoxsa, əyanların səni tərk edər, hakimiyyətin zəifləyər. Ölkə tar-mar olub kasıblaşar və adın hər yerdə bədnam çəkilər». Və Ənuşirəvan öz canişinlərinə belə bir fərman göndərir: «Əgər eşitsəm ki, haradasa əkilməmiş torpaq qalıb, həmin bölgənin canişinini işdən azad edəcəyəm».

Ölkənin müflisləşməsi iki səbəbdən baş verə bilər; birinci səbəb – hökmdarın bacarıqsızlığı, ikinci isə – onun qəddarlığıdır. Qədim dövrlərdə hökmdarlar bir-birinin qarşısında ölkələrindəki tikinti ilə qürurlanır və hər biri digərinin əyanlarının mehribanlığına qibtə edirdi.

**Əhvalat**

Hindistan hökmdarı Ənuşirəvana elçi göndərərək bildirir: «Mən hökmdarlığa səndən daha çox layiq olduğum üçün ölkən mənə vergi verməlidir». Ənuşirəvan əmr edir ki, elçiyə gecələmək üçün yer verilsin. Səhər isə o, ölkənin bütün tanınmış və dövlətli insanlarını sarayda toplayaraq elçini yanına çağırtdırıb deyir: «İndi isə bizim cavabımızı dinlə». Daha sonra onun əmri ilə ortalığa bir sandıq gətirilir. Ənuşirəvan bu sandığın içindən balaca bir sandıq, onun içindən isə kiçik bir yerqulağı[15] cıxarıb, elçidən soruşur: «Sizin ölkədə bu ot bitir?». O cavab verir: «Bəli, bizdə bundan çoxdur». Ənuşirəvan deyir: «Hökmdarına de ki, qoy o, öz ölkəsini abadlaşdırsın, çünki çox bərbad vəziyyətdədir. Yalnız bundan sonra o, inkişaf etmiş ölkəyə hökmranlıq etmək fikrinə düşə bilər. Çünki mənim bütün torpaqlarımı gəzsən, bir dənə də yerqulağı

[14] Xəml – ölçü (çəki) vahidi, 249 kq-ya bərabər
[15] Yerqulağı - alaq bitkisi

tapmazsan. Və əgər mən eşitsəm ki, haradasa bir dənə yerqulağı bitir, o bölgənin canişinini işdən uzaqlaşdıraram».

Və hər bir şah özündən əvvəlki hökmdarların davranışlarını öyrənməli, xeyirxah əməllərini davam etdirməli, onların tövsiyə və məsləhətləri yazılmış kitabları oxumalıdır. Çünki onlar daha çox yaşamış, daha təcrübəli və daha ehtiyatlı olmuşlar. Və onlar xeyiri şərdən ayırmağı bacarmış, agah və pünhan biliklərə malik imişlər. Və Ənuşirəvan da xasiyyətcə xeyirxah olmasına baxmayaraq, yenə də özündən əvvəlki şahların həyatı haqqında kitablar oxuyur, əhvalatları dinləyir və onların yolunu tutmağa çalışırdı. İndiki hakimlərin isə buna daha da çox ehtiyacları var.

**Əhvalat**

Bir gün ədalətli Ənuşirəvan məsləhətçisi Yunandan soruşur: «Mən istəyirəm ki, sən mənə əvvəlki hökmdarların həyat tərzindən danışasan». Vəzir soruşur: «Sən necə istəyirsən, mən onları üç qat, iki qat, yoxsa bir qat tərifləyim?». O cavab verir: «Üç qat». Vəzir deyir: «Mən onların heç bir işində və əməlində yalan tapmadım. Mən onların nədənsə bixəbər olduqlarını da görmədim. Mən onlardan kiminsə qəddarlıq etdiyini də eşitməmişəm». Ənuşirəvan deyir: «İndi isə iki qat təriflə». O cavab verir: «Onlar həmişə xeyir iş görmüş və şər əməldən uzaq olmuşlar». Ədalətli şah deyir: «İndi isə tərif üçün, sadəcə, bir səbəb söylə». Və o deyir: «Onların özlərinə olan ciddiyyət və hakimiyyətləri başqalarına olandan daha artıq idi».

Və Ənuşirəvan bir qədəh gətirilməsini əmr edərək deyir: «Bu qədəhə bizdən sonra gəlib, bizim taxtımıza və tacımıza sahib olanları görmək xoşbəxtliyi verilib. Və onlar bizləri biz özümüzdən əvvəlkiləri xatırladığımız kimi yad edəcəklər». Ən bədbəxt insan o kəsdir ki, öz hakimiyyətinə aldanaraq, bu dünyada necə yaşamağı bilmədən ömür sürür. O dünyada isə əbədi peşimançılıq və əzablarla qarşılaşır. Əvvəlki şahların məqsədi isə bu dünyanı daha da mütərəqqi etmək, əsrlər boyu yaşayacaq xoş xatirələr yaratmaq olmuşdur. Aşağıdakı əhvalat da bu haqdadır.

**Əhvalat**

Ənuşirəvanın Baxizar adlı üzümlüyü var idi.

Bir gün orada Bizans imperatoru Yafur, Hindistan hökmdarı

və Ənuşirəvan toplaşırlar. Onların hər biri bir hikmətamiz söz söyləyir. Qeysər deyir: «Bu dünyada hökmdar üçün yaxşı işlər görüb, daha sonra xeyirxahlıqla xatırlanmaqdan yaxşı nə ola bilər ki. Belə hökmdar öldükdən sonra isə onun haqqında deyəcəklər: «Nə üçün biz də onun kimi olmamışıq?». Bu zaman Ənuşirəvan deyir: «Gəlin biz xoş əməl düşünüb, yaxşı iş görək!»

Qeysər əlavə edir: «Xoş əməl haqda düşünən xeyirxah işlər görür, xeyirxah iş görən isə arzularına yetişmiş olur». Yafur əlavə edir: «Allah bizi sonradan xəcalət çəkəcəyimiz fikirlərdən uzaq etsin. Elə fikirlərdən ki onu hətta dilə gətirsək, xəcalət çəkərik». Qeysər Ənuşirəvandan soruşur: «Sən daha çox nəyi sevirsən?». Və o cavab verir: «Arzusunu yerinə yetirməyimi istəyən birisinin xahişini yerinə yetirməyi». Və Qeysər deyir: «Mən çalışıram ki, qorxu içində yaşamamaq üçün günah iş görməyim».

Ey İslamın böyük hökmdarı, bax, gör onların öz əyanlarına münasibəti necə olub? Sən mütləq o hökmdarların gördüyü işlər, onlar haqqında yazılanlar, onların qələmə aldıqları bilgilər, ədalətlilikləri, gözəl xasiyyətləri haqqında məlumatlı olmalısan. Axirət gününə kimi yaddaşlarda yaşayacaq təriflərinə diqqət etməlisən. Ömər ibn əl-Xəttab elə ədalətli hökmdar olub ki, hətta öz oğlunu da məhkəməyə vermiş və o, ölümlə cəzalandırılmışdı. O, öz canişinlərini xidmətə göndərərkən deyirdi: «Minəcəyiniz atın, gəzdirəcəyiniz silahın pulunu maaşınızdan ödəyin və müsəlmanların xəzinəsinə əl uzatmayın».

Əbdürrəhman ibn Auf belə nəql edirdi: «Bir gecə möminlərin hökmdarı Ömər ibn əl-Xəttab (Allah ondan razı olsun) məni yanına çağırtdırıb dedi: «Şəhər qapılarının yanında bir karvan dayanıb. Və mən qorxuram ki, gecə onlar yatarkən soyulsunlar». Və mən hökmdarla karvanın yanına getdim. Biz ora çatarkən o, mənə: «Sən yat», – deyib, özü isə bütün gecəni karvanın keşiyində dayandı».

Xəlifə Ömər (Allah ondan razı olsun) deyirdi: «Mən müsəlmanların ehtiyacları ilə yaxından tanış olmaq üçün bütün ölkəni gəzməliyəm. Çünki eləri var ki, zəif olduqlarından yanıma gəlib istəklərini mənə çatdıra bilmirlər. Və mən bir də ona görə ölkəni səyahət etməliyəm ki, canişinlərə nəzarət edib onların işləri ilə də tanış olum». Və bu, Ömərin bütün xeyirxah işlərinin ən mübarəki idi.

**Əhvalat**

Zeyd ibn Əslam belə nəql edirdi: «Bir gecə gördüm ki, Ömər ibn əl-Xəttab keşikçilərlə birlikdə ərazini təftiş edir. Mən ona yaxınlaşıb xahiş etdim: «İcazə ver, səni müşayiət edim». O razılıq verdi. Biz şəhərin kənarına çıxdıqda uzaqda bir ocaq görüb düşündük ki, yəqin, orada yolçular dayanacaq salıblar. Biz atəşə yaxınlaşdıqda orada bir dul qadın və ağlayan üç uşaq gördük. Qadın atəşə qazan asıb deyirdi: «Allahım, mənə və Ömərə qarşı ədalətli ol. Ondan mənə məxsus olanı geri qaytar. Çünki o, tox, biz isə acıq». Bunu eşidən Ömər ona yaxınlaşıb salamlaşdıqdan sonra soruşdu: «İcazə verirsən sənə yaxınlaşım». O cavab verdi: «Əgər Allahın adı ilə və xeyir əməllisənsə, buyur». Onlara yaxınlaşan Ömər hal-əhval tutduqdan sonra uşaqlar barədə soruşdu. O cavab verdi: «Mən bu uşaqlarla uzaqdan gəlirəm. Çox yorğun və acıq. Uşaqlar elə acdır ki, heç yata da bilmirlər». Ömər yenə soruşdu: «Bəs qazandakı nədir?» O cavab verdi: «Mən ora su töküb uşaqları aldatmışam ki, bəlkə, yuxuya getdilər». Və Zeyd ibn Əslan danışırdı ki, möminlərin hökmdarı şəhərə qayıdıb un dükanından bir kisə un, qəssabdan isə yekə bir tikə yağlı ət alıb çiyninə ataraq qadınla uşaqların yanına qayıtdı. Mən ona dedim: «Ey möminlərin hökmdarı, ver, sənin yerinə mən daşıyım. O, belə cavab verdi: «Əgər bu dünyada bunları sən mənim əvəzimə daşısan, bəs axirət günü mənim günahlarımı kim daşıyacaq? Və mənimlə o qadının etdiyi qarğış arasında kim duracaq?» Və o azmadan qadının yanına getdi. Qadın ona təşəkkür edərək dedi: «Allah əvəzini xeyirlə versin». Daha sonra Ömər bir parça ət, bir qədər unu qazana ataraq ocaq qaladı. Xörək bişənə kimi ocaq sönməsin deyə, o, tez-tez ocağı üfürür və oradan qalxan küllər onun gözəl üzünə qonurdu. Yemək bişdikdən sonra isə o, uşaqları və qadını yedirtdi. Və Ömər qadına belə dedi: «Ey qadın, Ömərə qarğış etmə, çünki o, sizlərdən bixəbər idi».

Və möminlərin hökmdarı adını ilk dəfə Ömər ibn əl-Xəttab alıb. Çünki Əbu Bəkri (Allah ondan razı olsun) Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, canişini (xəlifə) kimi çağırırdılar. Hakimiyyət Ömərin əlinə keçdikdə isə ona: «Ey Allahın peyğəmbərinin canişini!», – deyə müraciət edirdilər. Bu müraciət çox vaxt apardığından o buyurmuşdur: «Ey möminlər, mənə «hökmdar» deyərək müraciət edin. Çünki mən sizin hökmdarını-

zam. Və siz mənə «möminlərin hökmdarı» deyib müraciət etsəniz bu elə Ömər ibn əl-Xəttab deməkdir».

**Əhvalat**

Xəzinədardan soruşublar: «Ömər ibn Əbdüləziz xəzinə pulundan istifadə edirdi?». O cavab verib: «Lap əvvəllər onun yemək almağa pulu olmayanda bir qədər götürürdü. Pulu olduqdan sonra isə geri qaytardı. Bir dəfə o xütbə oxuyub dedi: «Camaat! Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, sağlığında biz ona gələn vəhylər vasitəsilə insanların daxili və xarici, pis və yaxşı xüsusiyyətlərini bilirdik. İndi isə biz onların üzünə baxırıq. Və onların içində nə olduğunu yalnız Allah bilir. Və mən öz əyanlarımla birlikdə söz verirəm ki, haqsız heç nə götürmədiyimiz kimi, haqsız da heç nə verməyəcəyik.

Və əgər sən hökmdarın şan-şöhrətinin, özündən sonrakı ləyaqətli adının onun ədalətli və əməlisalehliyi ilə bilavasitə bağlı olduğunu bilmək istəyirsənsə, Ömər ibn Əbdüləziz haqqındakı əhvalatı dinlə. Nə öməyyilər, nə də mərvlər sülaləsindən onun kimi tərifli hökmdar çıxmamış, heç kəsə dualar edilməmiş, yüksək hörmətə sahib olmamışdır. Çünki o, ədalətli, ürəyində Allah xofu yaşadan geniş qəlbli və xoş xasiyyətli bir insan idi.

**Əhvalat**

Ömər ibn Əbdüləzizin hakimiyyəti dövründə dəhşətli aclıq olur. Onun yanına ərəb tayfalarından elçilər gələrək, aralarından birini danışığa göndərirlər. O deyir: «Ey möminlərin hökmdarı! Biz sənin yanına böyük ehtiyacdan gəlmişik. Acından hətta dərimiz də quruyub. Ümidimiz xəzinəyədir. Bu pullar ya Allaha, ya onun bəndələrinə, ya da sənə məxsusdur. Əgər Allahındırsa, onun buna ehtiyacı yoxdur. Əgər onun bəndələrinindirsə, onu bizə ver. Yox, əgər sənindirsə, onu bizə sədəqə kimi ver. Axı Allah sədəqə verənləri mükafatlandırır». Ömər hönkür-hönkür ağlayaraq deyir: «Bəli, bu pullar sən dediyin kimi, sədəqə üçündür». O əmr edir ki, xəzinə hesabına onlara kömək etsinlər.

Bədəvi çıxıb gedərkən Ömər ona deyir: «Ey xeyirxah insan! İnsanların xahişini və sözlərini mənə çatdırdığın kimi, mənim xahişimi və sözümü Qadir Allaha yetir». Üzünü göyə tutan bədəvi: «Allahım, Sənə yalvarıram ki, Ömər sənin bəndələrinlə davrandığı kimi, sən də ona əvəzini ver»,- deyib duasını bitirməmiş aləmi

bulud tutur, leysan yağır. Birdən yağışla birlikdə yerə bir dolu parçası düşüb parçalanır. Onun içindən bu sözlər yazılmış bir kağız çıxır: «Bu, Qadir Allahın ona işarəsidir ki, Ömər ibn Əbdüləziz Cəhənnəmə düşməyəcək».

**Əhvalat**

Belə nəql edirlər ki, bir gecə Ömər ibn Əbdüləziz lampa işığında öz əyanlarının məlumatlarını və xahişlərini oxuyurmuş. Bu zaman qulluqçusu gələrək, Ömərin ev işi ilə bağlı ona nəsə deməyə başlayır. Ömər isə ona deyir: «Lampanı söndür, sonra danış. Çünki onun qətranı müsəlmanların xəzinəsindəndir. Və bunu yalnız müsəlmanlar üçün işlətmək olar».

Sultanların ədalətli və ehtiyatlıları məhz belə olur. Növbəti əhvalat da buna həsr olunub.

**Əhvalat**

Ömər ibn Əbdüləzizin üç qızı var idi. Ərəfat bayramında onlar atalarına deyirlər: «Sabah bayramdır. Sənin əyanlarının arvadları və qızları bizə deyirlər ki, siz möminlərin hökmdarının qızısınız, amma həmişə geyindiyiniz bu libasdan başqa heç nəyiniz yoxdur. Və qızlar hönkür-hönkür ağladıqda atalarının qəlbi sıxılır. O, xəzinəyə nəzarət edən qulluqçusunu yanına çağıraraq əmr edir: «Müsəlmanların xəzinəsindən mənim aylıq əmək haqqımı əvvəldən ver». Qulluqçu cavabında deyir: «Ey möminlərin hökmdarı, sən müsəlmanların xəzinəsindən əmək haqqını əvvəlcədən götürmək istəyirsən. Əgər sən bilirsənsə ki, bu ayı yaşayacaqsan, onda götür». Özünü itirən Ömər: «Bu, sənin ən yaxşı sözlərindir, qoy Allah səndən razı olsun», – deyir. Qızlarına isə belə buyurur: «İstəklərinizə hakim olun, bunsuz heç kəs Cənnətə düşə bilməz».

Hökmdarlar belə ədalətli olanda yaxınları və qulluqçuları da ondan yaxşı örnək alırlar. Əsl ədalət isə heç kəsin tanımadığı biri ilə ən hörmətli adam arasında onların var-dövlətinə fərq qoymadan ən ağır məhkəmədə də dürüst olmaqdır. Onsuz da axirətdə qiymətli daş-qaşla gil eyni dəyərdə olacaq. Və əgər bir fağır insan hökmdarından şikayət etsə, bu zaman hökmdar öz fəxri yerindən durub, Allahın qanunlarına əməl etməli, həqiqətin gözünə dik baxmalı və bu insanı incitmədən onun xahişini yerinə yetirməlidir. Allah-təala belə buyurmuşdur: *«Həqiqətən, Allah ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara (haqqını) verməyi (kasıb qohum-əqrəbaya şəriətin vacib bildiyi tərzdə əl tutmağı) buyurar» (Quran, 16:90).*

Və bunun mahiyyəti odur ki, əgər hökmdarın kimdənsə bir xahişi, istəyi varsa, bunu çəkinmədən bildirsin. Belə olduqda hökmdar həmin adama yaxınlıq etmiş və öz əyanlarına örnək göstərmiş olar, axirət günü isə əyanlarının günahlarına görə ondan haqq-hesab çəkilməz. Və bir hədisdə Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Hər bir çoban qoyunlarına görə, hər bir hökmdar isə əyanlarına görə cavab verəcəkdir. Bu, belədir, belə də olacaq».

**Əhvalat**

Belə nəql olunur ki, Xorasan əmiri Əhməd ibn İsmayıl öz ordusu ilə Mərvə girir. Və onun carçıları hər addımbaşı car çəkirlər ki, ordu dinc əhaliyə dəyməyəcəkdir. Lakin əsgərlərdən biri kiminsə bostanından qarpız götürüb yeyir. Əhali əmirə şikayət edir. Günahkar əsgəri qarşısına gətirdən əmir ondan soruşur: «Sənə qidalanmaq üçün pul verilir?». O cavab verir: «Bəli». İsmayıl yenə soruşur: «Bəs sən carçını eşitməmisən?». O cavab verir: «Eşitmişəm». Əmir yenə soruşur: «Bəs nə üçün mənim rəiyyətimi incitmisən?». O, cavabında deyir: «Mən səhv etmişəm». İsmayıl: «Mən sənin səhvinə görə Cəhənnəmə düşə bilmərəm», - deyərək onun əlinin kəsilməsi əmrini verir.

**Əhvalat**

«Hökmdarların tərcümeyi-halı» kitabında yazılır ki, İsmayıl əs-Samani Hindistan şəhəri Muliyanəyə (Multana) səfər edir. Və hər dəfə Qundur şəhərinə çatarkən onun carçıları car çəkirlər ki, şah sarayın qapılarını açıb, keşikçiləri götürtdürüb. Kimin xahişi, şikayəti var, gəlib xalının qırağında dayanaraq, ona şəxsən müraciət edib, evlərinə rahat qayıda bilərlər. O, rəqibləri bir hakim kimi mühakimə edir, şikayətlər bitdikdən sonra isə ayağa qalxaraq, salavat çevirib göylərə müraciət edirdi: «Allahım, sən mənim zəhmətimi görürsən. Sən mənim məqsədimi və mənim üçün pünhan olanları bilənsən. Lakin mən çox mətləbləri bilmirəm; sənin hansı bəndəni incitdiyimi, ədalətsiz rəftar etdiyimi bilmirəm. Mən də onlar kimiyəm, bilmədiklərimi mənə bağışla».

Və onun niyyəti pak, qəlbi təmiz, əməlləri mübarək olduğu üçün şöhrəti artdı. Və onun ordusu yaxşı silahlanmış 100 min zirehli atlıya qədər çoxaldı.

Və özü kimi, qurduğu məhkəmələr də ədalətli olduğundan Qadir Allah ona Əmr ibn-Leysi əsir verərək Xorasanı qazandırdı.

Zindanda olan Əmr ibn-Leys ona bu sözlərin çatdırılmasını xahiş edir: «Mənim Xorasanda çoxlu xəzinəm və dövlətim qalıb. Məni azad et və hər şeyi özünə götür». Bunu eşidən İsmayıl gülərək deyir: «Əmr ibn-Leys hələ də mənimlə çox ədalətsizdir. O, törətdiyi cinayətləri, haqsızlıqları, günahları öz üzərimə götürməyimi istəyir. Ona çatdırın ki, pulu mənə lazım deyil». Sonra İsmayıl onu zindandan azad edərək Bağdada səfir göndərir. Burada isə o, möminlərin hökmdarı tərəfindən qiymətli hədiyyələr və yüksək ehtiramla qarşılanır.

Və İsmayıl Xorasanda qayğısız və uğurlu bir şahlıq ömrü sürmüşdür. Onun şahlığı Səmanilər dövlətinin bir hissəsi olaraq, 130 il mövcud olmuşdur. Lakin hakimiyyət nəslin daha sonrakı nümayəndələrinin əlinə keçdikdə ədalətsizliklər edilmiş, insanlar incidilmiş və buna görə də ölkə iflasa sürüklənmişdir.

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Hökmdarın bir günlük ədaləti 70 illik ibadətdən yaxşıdır». Və o əleyhissəlam demişdir: «Onun incidilənə olan ədaləti zəkasının paklığındandır». Və o əleyhissəlam yenə buyurub: «Zülm qılıncını çəkən kəs bəla qılıncı ilə vuruşacaqdır, kədər isə onun yol yoldaşı olacaq». Şair bu haqda belə deyib:

Əgər haqsızlıq yerinə ədalət alsan,
Yer üzündən şənlik çəkilər.
İnsanlara onlardan eşitmək istədiyini de
Və əgər yaşamaq istəyirsənsə, öldürmə.

Bir gün Davud peyğəmbər görür ki, göydən yanan daş düşür. O soruşur: «Allahım, bu nədir?» Və Allahdan vəhy gəlir: «Ey Davud, bu, mənim tiranların evlərinə göndərdiyim bəladır».

**Əhvalat**

Ənuşirəvan taxta çıxarkən onun müdrik köməkçisi Yunan ona belə bir namə göndərir: «Ey sultan, bil ki, üç cür idarə üsulu var; sən öz rəiyyətinə ədalətli olub onlardan ədalət gözləmirsən – bu, çox yüksək ləyaqət və ali məqamdır. Və ya ədalətli olduğun kimi, özünə də qarşı ədalət gözləyirsən – bu, orta məqamdır. Ədalətsiz ola-ola ədalət gözləmək isə haqsızlıq və ən aşağı məqamdır». Ey hökmdar, bu üç məqama diqqət edib onlardan birini seç. Mən bilirəm ki, sən birincini seçəcəksən. Necə ki, şair deyib:

Hökmdar o kəsdir ki, insanlarla
Vicdanlı rəftar edib
Özünə qarşı ədalət gözləmir.
Və insanlarla ədalətsiz olan
Ləyaqətsiz hökmdardır.

**Öyüd və nəsihət**

Şəbih ibn Şəbih xəlifə əl-Mehdinin yanına gələrək deyir: «Ey möminlərin hökmdarı! Qadir Allahın sənə bəxş etdiyi inamından və dövlətindən əyanlarına da pay ver». Əl-Mehdi soruşur: «Əyanlara nə verim?». O cavab verir: «Ədalət, əgər ki, onlar səndən qorxmadan rahat yatsalar, sən də qəbir evində rahat yatarsan. Ey möminlərin hökmdarı, elə yaşa ki, sanki sənin üçün axşamdan sonra səhər, səhərdən sonra axşam yoxdur. Unutma ki, ədalətə ədalət, zülmə isə zülmlə mükafatlandırılacaqsan. Özünə xeyir işlərlə bəzək vur, yoxsa Qiyamət günü heç kim sənə öz zinətini borc verməyəcəkdir». Şair demişkən:

Allaha itaətlə, ibadətlə
Özünə bəzək vur.
Yoxsa bunları Qiyamət günü
Heç kəsdən borc ala bilməyəcəksən.

Bizans imperatoru ədalətli Xosrov Ənuşirəvana namə göndərərək yazır: «Hakimiyyəti uzadan nədir?». O, cavab olaraq bunları yazır: «Mən bilmədiyim bir şeyin əmrini vermərəm, əmr verdikdə isə onu sona çatdırıram; əmrlərimi qorxudanmı və ya kiminsə xahişi ilə yarımçıq qoymadığım kimi də, əmrimdən qətiyyən heç nəyi dəyişmirəm».

**Əhvalat**

Belə nəql edirlər ki, karvandan geri qalan bir zəvvar səhraya düşür. O, köhnə bir komaya rast gələrək, orada tənha yaşayan qoca qarıdan yemək istəyir. Qadın cavab verir: «Filan dərəyə gedib istədiyin qədər ilan topla, qızardım». Adam deyir: «Mən ilan tuta bilmirəm». Qarı cavab verir: «Mən səninlə ova gedərəm». Onlar qarının iti ilə bərabər ova gedib kifayət qədər ilan tuturlar. Komaya qayıtdıqdan sonra qarı ilanları qızardır. Kişi isə acından

ölməmək üçün onu yeyir. O, su istədikdə isə qarı deyir: «Yaxınlıqda bulaq var, get iç». Kişi gedib görür ki, su şordur. Amma naəlac qalıb suyu içir. Sonra o, qarıdan soruşur: «Mən heyranam ki, sən burada niyə yaşayıb və necə qidalanırsan?». Qarı ondan soruşur: «Bəs sizin torpaqlar necədir?». O cavab verir: «Bizim geniş evlərimiz, sərin bulaqlarımız, dadlı yeməklərimiz, meyvələrimiz, yağlı ətimiz və digər nemətlərimiz var». Qarı deyir: «Mən bütün bunları eşitmişəm. Mən hətta eşitmişəm ki, sizin hökmdar hər bir səhvinizə görə evlərinizi, əmlakınızı əlinizdən alıb, sizi bayırda qoyur». Kişi cavabında deyir: «Bəzən belə olur». Qarı deyir: «Əgər sizin ləziz yeməkləriniz və gözəl həyatınız haqsızlıqla zəhərə dönürsə, bizim qidamız həyatımız sakit keçdiyi üçün şərbətə çevrilir. Məgər eşitməmisən ki, İslamı qəbul etdikdən sonra ən gözəl şəfqət düzgün siyasət yürüdən ədalətli hökmdarın hakimiyyəti altında rahat və sağlam yaşamaqdır?».

Sultan həm siyasətçi, həm də ədalətli olmalıdır. Çünki o, Allahın bu dünyadakı canişinidir. Və o, hər kəsin qəlbinə qorxu saçmalıdır. Hətta onu uzaqdan görənlər də bu qorxudan dəhşətə gəlməlidirlər. Bizim zəmanənin hökmdarı ən incə siyasət yürütməli, böyük təsir gücünə malik olmalıdır, çünki müasir insanlar əvvəlki dövrün insanlarına oxşamırlar. Bizim zəmanə abırsızlıq, həyasızlıq və zalımlıq zəmanəsidir. Və əgər belə insanların əhatəsində olan sultan zəiflik göstərsə və ya güclü siyasətçi olmasa, heç şübhəsiz ki, bu, ölkənin müflisləşməsinə, dinin, imanın, sülhün, əmin-amanlığın çökməsinə səbəb olacaqdır.

Bu haqda belə bir atalar sözü də var: «Əyanların bir il bir-birinə zalımlığındansa, hökmdarın 100 il zülmü yaxşıdır». Əgər əyanlar bir-birinə zalım kəsilərsə, Allah-təala onlara zalım rəhbər göndərər. Bu haqda belə bir əhvalat da var.

**Əhvalat**

Günlərin bir günü əl-Həccac ibn Yusif əs-Sakifi içində bu sözlər yazılmış bir namə alır: «Allahdan qorx! İnsanlara bu qədər zülm etmə». Gözəl natiq olan Həccac minbərə çıxaraq deyir: «İnsanlar! Allah məni sizə əməllərinizi görərək rəhbər qoyub. Və əgər mən ölsəm, sizin bu haram əməllərinizə görə Allah mənim yerimə, mənim kimi bir başqasını göndərəcək. Allahın mənim kimi hökmdarları çoxdur. Bu haqda şair belə demişdir:

Hər əlin üstündə Allahın əli vardır.
Bu dünyada bütün əzab çəkənlər
Bir-birinə zülm edən qəddarlardır.

**Hikmət**

Bəzorqmehrdən soruşurlar: «Ən ləyaqətli hökmdar hansı hökmdardır?». O cavab verir: «O kəs ki, günahsızlar ondan qorxmur, günahkarlar dəhşətə gəlir». Öz siyasəti olmayan hökmdarın əyanları arasında hörməti olmur. İnsanlar da ona qarşı sədaqətli olmayıb vaxt ötdükdə onu pis sözlərlə xatırlayacaqlar. Məgər sən görmürsən ki, hər hansı bir vilayətin adi vətəndaşı hökmdar olduqdan sonra əyan və rəiyyət ilə incə siyasətlə rəftar edərək onlara özünün yüksək vəzifə sahibi olmasını, hakimiyyətini nümayiş etdirməyə çalışır? Əks təqdirdə, aşağı təbəqədən çıxdığı üçün lazım olan hörmət və izzəti görməyəcəkdir.

**Bu fəsildə də çox qəribə əhvalat var:**

Əbu Süfyan ibn əl-Harisin cahilliyi dövründə dünyaya gəlmiş bir oğlu var idi. Atası ondan imtina edib: «Mənim oğlum yoxdur!», – dediyi üçün onu Ziyad ibn Əbixi[16] deyə çağırırdılar. Müaviyə bunu eşitdikdən sonra Ziyadı özünə yaxınlaşdıraraq, qardaşlığa qəbul edib İraqa hökmdar göndərir. Ziyad İraqa gəlib görür ki, oranın əhalisi əsasən yolunu azmışlar və oğrulardır. O, məscidə gedib minbərə qalxaraq, moizə oxuduqdan sonra deyir: «Allaha and içirəm ki, axşam namazından sonra kim evindən bayıra çıxsa, onun başını bədənindən ayıracağam. Qoy bunu eşidən eşitməyənə xəbər versin». Sonra o, carçıya əmr edir ki, bu xəbəri üç gün car çəksin.

Dördüncü gecə Ziyad küçəyə çıxıb atla şəhəri dolaşmağa başlayır. Birdən o, qoyunu ilə birlikdə dayanmış bir bədəvini görüb ondan soruşur: «Burada nə edirsən?». O cavab verir: «Bura axşam gəlib çatdığım üçün qalmağa yer tapmadım. Səhər açılanda qoyunu satıb, çıxıb gedəcəyəm». Ziyad ona: «Mən bilirəm ki, sən düz danışırsan. Amma mən səni buraxsam, söz gəzəcək ki, Ziyad dediyin etmir. Onda isə siyasətim uğursuzluğa düçar olub, hakimiyyətim zəifləyəcək. Burada durmaqdansa, Cənnətə getməyin yaxşıdır», – deyərək boynunu vurur. O, yoluna davam edib qarşı-

---

[16] Yəni «öz atasının oğlu» deməkdir. Müaviyə onu qardaşlığa qəbul etdikdən sonra ibn Abu Sufyan deyə çağırıblar.

sına çıxan hər kəsin boynunu vururdu. Səhər isə o, vurulmuş 1500 başı qapısının qarşısına topladı və bundan sonra heç kəs cürət edib axşam namazından sonra bayıra çıxmırdı.

Cümə günü o, yenə minbərə çıxaraq deyir: «Ey insanlar, əmr edirəm ki, bu gündən sonra heç kəs qapısını bağlamasın, sizdən nəsə oğurlasalar mən ödəyərəm». Qorxudan hamı bu əmrə də itaət edir. Səhər açıldıqda onun yanına gələn sərraf deyir: «Axşam mənim 400 dinarımı oğurlayıblar. Ziyad ondan soruşur: «Sən düz dediyinə and içə bilərsən?». O: «Bəli», – dedikdən sonra Ziyad məcbur edir ki, sərraf 400 dinarın oğurlandığını andla təsdiq etsin. Ziyad ona 400 dinar ödəyərək deyir: «Bu işi gizli saxla, heç kəsə demə». Növbəti beşinci gün insanlar məscidə namaza gəldikdə, Ziyad minbərə qalxaraq deyir: «Bilin ki, sərrafın dükanından 400 dinar pulu oğurlanıb. Əgər siz bunu kimin etdiyini desəniz, biz ona oğurlanmış pullarını geri qaytara biləcəyik. Əgər deməsəniz, mən əmr edəcəyəm ki, məsciddən heç kimi buraxmayıb, hamını öldürsünlər». Oradakılar oğurluqda kimdən şübhələndiklərini bildirdilər. Oğru oğurladığı qızılı qaytardıqdan sonra Ziyad onun çarmıxlanmasını əmr etdi.

Sonra o, Bəsrənin hansı ərazisinin daha təhlükəli olduğunu soruşduqda ona bildirdilər ki, bu, əl-Azad tayfasının yaşadığı bölgədir. O əmr etdi ki, gecə heç kəs görmədən yola bir paltar atsınlar; bu paltar atıldığı yerdə bir neçə gün qaldı və heç kəs onu götürməyə cürət etmədi.

Və bunu görən onun yaxınları dedilər: «Həqiqətən də, bu çox müdrik siyasətdir. Əfsuslar olsun ki, sən 1500 müsəlmana qıydın». O cavab verdi: «Mən onları üç gün əvvəl xəbərdar etsəm də, məni dinləmədilər. Və onların başına gələn öz əməllərinin nəticəsidir».

**Hikmət**

Aristoteldən[17] soruşurlar: «Allahdan başqa, kiminsə hökmdar adlanması düzdürmü?» O cavab verir: «Kim ki ağıl, ədalət, səxavət, səbr, mərhəmət və bu kimi gözəl xüsusiyyətlərə malikdir, onlar adlandırıla bilərlər, çünki hökmdarlar İlahi Kölgəyə, qəlbin təmizliyinə, dərin zəkaya, dövlətin qədimliyinə və nəsillərinin nəcibliyinə görə hökmdar olurlar».

---

[17] Ərəb tələffüzündə Aristotel Əristu Qalis (b.c.ə. 384-322) kimi ifadə olunur. Qədim yunan filosofu olmuşdur. Bir müddət gənc Makedoniyalı İskəndərin müəllimi olub.

Və onların «Fərabərzi» adlandırdıqlarının mənası İlahi Kölgə olub, bu formada təzahür edir. Ağıl, bilik, onun dəqiqliyi, zəka, hadisələri əvvəldən görmə bacarığı, fərasət, fağıra qarşı ədalətlilik, rəiyyətə məhəbbət, liderlik, dözümlülük, nəzakət, idarə və mühakimə etmə qabiliyyəti, şahların həyatına aid və tarixi yazılara maraq, bir çox şahların özündən əvvəlkilərdən örnək olaraq, etdikləri işlərin öyrənilməsi, çünki bu dünya keçmişə qovuşan və yalnız əməllərinə görə insanlar tərəfindən xatırlanan ulu əcdadlarımızın nə vaxtsa hökmranlıq etdikləri ölkələrin bir qalığıdır. Həm o dünyanın, həm də bu dünyanın özünə görə xəzinəsi vardır. Əgər bu dünyanın xəzinəsi yaxşı ad və özündən sonra xoş xatirədirsə, o dünyanın xəzinəsi yaxşı əməllər və onlara görə verilən mükafatlardır.

**Hikmət**

İskəndər Aristoteldən soruşub: «Hakim üçün ən vacib nədir: cəsarət, yoxsa ədalət?»

Aristotel cavab verib: «Daha yaxşı olar ki, hökmdarın ədaləti cəsarətə ehtiyac duymasın».

**Hikmət**

Sokrat[18] deyib: «Dünya ədalət üzərində bərqərar olub, lakin haqsızlıq gələndə o, öz möhkəmliyini və sarsılmazlığını itirir».

**Hikmət**

Bir dəfn mərasimində İskəndərin sərkərdələrindən biri ona deyir: «Allah-təala sənə böyük şahlıq, çoxlu sayda qadın və övlad qismət etmişdir ki, nəslinin böyüklüyünə görə ölümündən sonra xatırlanasan». İskəndər ona belə cavab verir: «İnsanları ölümündən sonra övladlarının sayına görə yox, xoş əməllərinə görə xatırlayırlar. Və dünyanın bütün kişilərini fəth etmiş birinin qadınlara görə xatırlanması haqsızlıq olardı».

**Hikmət**

Şah vaxtının çoxunu onu işindən yayındıran nərdə, şahmata, top oyunlarına, şərab içməyə, ova sərf etməməlidir. Hər məşğuliyyətin öz vaxtı var və onu vaxtında etməsən, qələbə məğlubiyyətə, sevinc kədərə çevriləcəkdir. Əvvəlki hökmdarlar günü dörd his-

---

[18] Sokrat (b.e.ə.469-399-cu illər) – məşhur qədim yunan filosofu.

səyə bölürdülər: Allaha ibadət vaxtı, şikayətlərin ədalətli baxılması, xalqı idarə etmək, dövlət işlərini həyata keçirmək, əmr və fərmanlar vermək, səfir göndərmək, namələr yazmaq, ayinləri icra etmək üçün alim və aqil insanlarla ünsiyyət vaxtı. Üçüncü, yemək yemək, yatmaq, dünya nemətlərini toplamaq, şənlənmək vaxtıdır. Və dördüncü isə ov etmək, top qovmaq, at çapmaq və bu kimi işlərlə məşğul olmaq vaxtıdır.

**Əhvalat**

Bir dəfə İskəndər bir yüksək vəzifə sahibinin vəzifəsini kiçildir. Bir müddət sonra İskəndər ondan soruşur: «İşin xoşuna gəlir?» O: «Allah sənin ömrünü uzatsın!» – deyərək əsas məsələnin bütün işlərdə nəcib davranış, pis işlərdən uzaq olmaq, ədaləti bərqərar etmək və ölçünü gözləmək olduğunu bildirir. Bu cavab İskəndərin xoşuna gəlir və onu əvvəlki vəzifəsinə qaytarır.

Deyilənə görə, hökmdar Bəhramgur öz gününü iki bərabər hissəyə bölmüşdü; birinci hissədə o, dövlət işləri ilə məşğul olur, ikinci hissədə isə dincəlirdi. Və deyilənə görə, elə bir gün olmayıb ki, o, vaxtını yalnız dövlət işlərinə sərf etsin.

Ədalətli Ənuşirəvan öz əyanlarına əmr etmişdi ki, onlar hətta ən ucqar yaşayış məskənlərinə də qalxıb insanların həyat tərzi ilə maraqlansınlar. Və onlar bacasından tüstü çıxmayan hər bir evə gedib, onun sahibindən hal-əhval tutur, çətinlikdə olduqlarını öyrəndikdə isə bunu Ənuşirəvana bildirirdilər. O isə öz növbəsində əlindən gələn köməyi əsirgəmirdi.

Və hökmdar icazə verməməlidir ki, əyanları ixtiyarları çatmadan rəiyyətdən nəsə götürsünlər.

**Əhvalat**

Belə nəql olunur ki, ədalətli Ənuşirəvanın bir bölgəyə hökmdar təyin etdiyi canişinlərindən biri ona tələb olunandan üç min dirhəm çox vergi toplayaraq göndərir. Ənuşirəvan isə onu canişinlikdən azad edərək, toplanmış əlavə pulu sahiblərinə qaytarmağı əmr edir.

Və rəiyyətdən zorla nəsə götürüb, özünə varidat toplayan hökmdar qoyduğu təməlin möhkəmlənməsini gözləmədən onun üzərində divar ucaldan və bir qədər sonra təməli də, divarı da uçulan insanı xatırladır. Və hər bir hökmdar öz rəiyyətindən həm aldığında, həm verdiyində müəyyən ölçüyə əməl etməlidir. Bu hər iki

əməlin müəyyən sərhədləri olmalıdır ki, bu haqda növbəti əhvalatda danışılır.

**Əhvalat**

Belə nəql olunur ki, xəlifə əl-Məmun dörd vilayətə yeni canişinlər təyin edir. Onlardan birini Xorasan hakimi təyin edərək, 3000 dinar maaş kəsir. Xuzistana, Misirə və Ərməniyyəyə göndərilən canişinlərə də eyni məbləğdə maaş müəyyən edir. Sonra o, qazini yanına çağırtdıraraq soruşur: «Ey ləyaqətli dehqan, bir de görüm, şahlardan kim mənim qədər səxavətli olub? Eşitdiyimə görə, onların verdiyi mükafat və ənam dörd min dirhəmdən yuxarı olmayıb»[19]. Baş hakim ona belə cavab verir: «Qadir Allah özü möminlərin hökmdarının ömrünü uzun etsin! O şahlarda sizdə olmayan üç şey olub: birincisi, onlar rəiyyətdən alıb-verdiklərində ölçünü gözləyirdilər. İkinci, onlar mümkün olan yerdən alır, lazım olana verirdilər. Üçüncüsü, onlardan cinayətkarlardan başqa, heç kəs qorxmurdu». Xəlifə: «Sən düz deyirsən», – deyərək daha onu sorğu-suala tutmadı.

Və buna görədir ki, əl-Məmun Xosrovun qəbrini açdıranda görüb ki, Xosrovun nə bədəni, nə də paltarı heç bir dəyişikliyə uğramadan ilkin vəziyyətində qalıb. Onun barmağında hər tərəfi qaşlarla, çox nadir yaqutla bəzədilmiş bir üzük var idi. Yaqutun üzərində bu sözlər yazılmışdı: «Ən təvazökar olan ən səxavətli, ən səxavətli isə ən qüdrətlidir». Əl-Məmun Xosrovun üzərinə qızıl paltar örtməyi əmr edir. Lakin onun yanında olan xidmətçisi Xosrovun barmağındakı üzüyü oğurlayır. Bunu eşidən əl-Məmun üzüyün qaytarılmasını, oğrunun isə öldürülməsini əmr edir: «O, məni az qala biabır edib adıma söz çıxaracaqdı ki, əl-Məmun oğrudur, Xosrovun qəbrini açıb, barmağındakı üzüyü çıxarıb».

**Əhvalat**

Bir dəfə İskəndər səfərə çıxmazdan əvvəl müdriklərdən soruşur: «Mənə elə öyüd verin ki, əyanlarımı daha yaxşı idarə edib, əməllərimi kamilləşdirim». Müdriklərdən ən qocamanı ona belə deyir: «Ey hökmdar! Nə sevgini, nə də kini qəlbinə yaxın burax-

---

[19] Dehqan – qədim İranın aristokrat təbəqəsi. İran müsəlmanlar tərəfindən zəbt olunduqdan sonra dehqanlar hakim təbəqəyə daxil edilmişdilər. Onları Orta Asiya kəndliləri olan dehqanlarla səhv salmaq düz deyil.

ma. Çünki qəlbin adına uyğun xüsusiyyəti vardır[20]. Və o, dəyişkən olduğu üçün qəlb adlandırılır. Ağılla hərəkət edib, onu özünə dost və məsləhətçi bil. Diqqətli ol, məsləhətçilərinlə məsləhətləşmədən əmr vermə. Ədalət və qərəzsizlik lazım olan yerdə rəğbət və meyllilikdən uzaq ol. Və əgər buna əməl etsən, zəngin olacaq və var-dövlətini istədiyin kimi istifadə edəcəksən».

Hökmdar ciddi və səbirli olmalıdır. Və yüngültəbiətlilik, tələsgənlik kimi xüsusiyyətlərdən çəkinməlidir. Aqillər deyiblər: «Üç şey çox iyrəncdir və üç vəziyyətdə onlar daha iyrənc olur: hökmdar çılğın, alim tamahkar və dövlətli xəsis olanda».

**Əhvalat**

Ədalətli Xosrov Ənuşirəvana məsləhətçisi Yunan belə bir məsləhət vermişdir: «Ey hökmdar, ağılı, ədaləti, səbir və təvazökarlığı heç vaxt özündən uzaq etmə. Hökmdar ciddi, səbirli olub, yüngültəbiətlilik, özündən razılıq və xəbislikdən uzaq olmalıdır. Bil ki, səndən əvvəlki hökmdarlar bu dünyadan köçüb, səndən sonrakılar isə hələ gəlməyib. Və çalış ki, bu dünyanın bütün hökmdarları və onların əyanları səni böyük məhəbbətlə sevib, yoxluğundan həsrət çəksinlər».

**Əhvalat**

Belə nəql edirlər ki, günlərin bir günü Ənuşirəvan səyahətə çıxır. Onun yolu barlı-bərəkətli bacalardan, çiçəklənən üzümlüklərdən keçirdi. O, atdan enərək, diz üstə çöküb, Allahına şükürlər edir. Ayağa qalxanda isə yanındakılara deyir: «Bərəkət hökmdarın ədalətindən və onun niyyətinin təmizliyindən asılıdır. Bizim xoş niyyətimizi mükafatlandıran Allaha şükürlər olsun!»

Allah isə onu tez-tez sınağa çəkirdi. Növbəti əhvalat bu haqdadır.

**Əhvalat**

Belə nəql olunur ki, bir gün Ənuşirəvan ova çıxır. Və mühafizəçilərindən ayrı düşür. Bərk susamış hökmdar yaxınlıqdakı kəndə gedir və bir evin qapısını döyərək su istəyir.

Qapıya çıxan bir qız evə keçərək bir ədəd şəkər qamışından onun üçün şirə çəkir. Sonra bu şirəni su ilə qarışdırıb Ənuşirəvana

---

[20] Ərəb dilində «ürək» (qəlb) və «dəyişkənlik» (təqəllub) sözləri eyni kökdən yaranıb.

təqdim edir. Təqdim edilən qədəhdə toz, şirənin içində isə çör-çöp olduğundan Ənuşirəvan onu yavaş-yavaş içir və daha sonra qıza deyir: «Çox dadlı içkidir! Lakin onun içində bir qədər çör-çöp var idi". Qız belə deyir: «Onları mən özüm ora atmışam. Çünki gördüm ki, çox susamısan və əgər qədəhdə o çör-çöp olmasaydı, sən suyu bir qurtuma içərdin. Bu isə ziyandır». Qızın ağlına heyran qalan Ənuşirəvan soruşur: «Bu içkini neçə qamışdan düzəltmişdin?» Qız cavab verir: «Bir qamışdan». Bundan təəccüblənən Ənuşirəvan özlüyündə qərar verir ki, qayıdan kimi bu ərazidən yığılan vergini qaldırsın.

Bir müddət sonra o, yenə də həmin kəndə gələrək artıq xeyli böyümüş qızın evinin qapısını döyüb, yenə də su istəyir. Qız onu tanıyaraq suyu bir qədər gec gətirir. Və onu tələsdirən Ənuşirəvan deyir: «Niyə belə gecikirsən?» Qız cavab verir: «Çünki bir qamışdan sənə lazım olan qədər şirə çıxmadı, üç qamış götürdüm, amma bu da yetmədi». Ənuşirəvan soruşur: «Bunun səbəbi nədir?» Qız cavab verir: «Bunun səbəbi sənin bizə olan niyyətinin dəyişməsidir. Belə deyilib ki: «Əgər hökmdarın öz rəiyyətinə qarşı niyyəti pisliyə dəyişsə, insanların xeyir-bərəkəti çəkilər». Qızın sözləri Ənuşirəvanı həm təəccübləndirdi, həm də güldürdü. O, qıza bildirdi ki, buraların vergisini artırmağı düşünürdü. Və qızın hazırcavablığı və zəkası qarşısında heyran qalan hökmdar çox keçmədən onu aldı.

**Hikmət**

Belə deyirlər ki, insanların ən dürüstləri – peyğəmbərlər, hökmdarlar və divanələrdir. Və belə deyilib: «Sərxoşluq ağlın başdan çıxmasıdır. Lakin divanə sərxoşdan çəkinir. Çünki divanənin sərxoşluğu hiss olunmur. Ağıllının sərxoşluğu hiss olunur». Və lənət olsun o kəsə ki, laqeydlik sərxoşluğuna qərq olub. Şair demişkən:

Şərabdan tez sərxoş olan
Ayılarkən utanmamalıdır.
Sərxoş hökmdar isə
Ayılanda şahlığını tapa bilməz.

Və çox az-az hökmdar var ki, şahlıq meyi onu sərxoş etməsin, ətrafında dürüst insanlar və sadiq dostlar toplasın. Hökmdarın hakimiyyət sərxoşluğuna tutulmasının əsas əlaməti budur: fağır və kasıb

birisini nazir qoyduqdan sonra ondan ikiəlli yapışır. Bu adam dövlətləndikdən sonra isə onu işdən çıxarıb yerinə başqasını təyin edir. Bu, ona bənzəyir ki, balaca bir uşağı böyüdüb həddi-buluğa çatdırasan, onun üçün yararlı olduqda isə vurub öldürəsən. Belə fikir var ki, hökmdar üçün dörd əməl vacibdir; şərəfsiz insanları hakimiyyətdən uzaqlaşdırmaq, ölkəni inkişaf etdirmək üçün ağıllı insanları ətrafında toplamaq, ağsaqqalları, təcrübəli və aqil insanları dinləmək və səhv addımları mümkün qədər az etməklə ölkənin qüdrətini artırmaq. Ömər ibn Əbdüləziz hakimiyyətə gələndə əl-Həsən əl-Bəsriyə bu məzmunda bir məktub yazır: «Mən istərdim sənin dostun olum». Əl-Həsən əl-Bəsri cavab məktubunda yazır: «Bu dünya nemətlərini arzulayan sənə yaxşı məsləhət verməz, Axirət həyatını arzulayan isə sənin yanında olub köməyini əsirgəməz».

Hökmdar layiq olmayan birini nəinki nazir, hətta adi vəzifəyə də təyin etməməlidir. Və əgər hökmdar belə bir səhv addım atsa, onun işləri çətinləşəcək, hakimiyyəti və dövləti zəifləyəcək, eyni zamanda hər yerdə tənə ilə qarşılaşacaqdır. Şair demişkən:

Evin yıxılması təməlindən başlayır.
Əgər şah layiqsiz insanları
Məsləhətçi təyin etsə,
Onlar hakimiyyəti əxlaqsıza ötürəcəklər.

Hökmdara qulluq edən isə bu şeirdə şairin vəsf etdiyi kimi olmalıdır:

Hökmdara qulluq edirsənsə,
Ən bahalı libasları geyib,
Allahın qəzəbindən qorx,
Hökmdarın yanına kor girib, lal çıx.

Və əgər kimsə hökmdarla çox sərbəst və sadə şəkildə davranırsa, bu, hökmdarın özünə qarşı olan hörmətsizliyidir. Hökmdarın xidmətində duran heç kəs, hətta onun oğlu da şahla belə davranmamalıdır:

Əgər sultanın oğlusansa da,
Onun xidmətində dur, razı sal
Və əgər başının salamat qalmasını istəyirsənsə,

Ondan qorx!
Və şahı ilə sərbəst rəftar edən insan

İnsanların içində yaşayan ilan ovsunçusuna və yaxud həyatını hər an təhlükədə qoyaraq, timsahlarla çayda yaşayan birinə bənzəyir.

**Hikmət**

Belə deyilir: «Vay o insanların halına ki, sultanla yaxın münasibət qurublar. Belələrinin bundan sonra dostuna, qohumuna, övladına, qulluqçusuna qarşı yaxın münasibəti və hörməti olmur. Onlar yalnız ağıllı və ya cəsur insanlarla münasibət qururlar ki, yeri gəldikdə onlardan istifadə etsinlər. Məqsədlərinə çatdıqdan sonra isə bütün əlaqələri kəsirlər. Və belələri adətən ikiüzlü olur; onlar öz böyük günahlarını kiçik qüsur, başqalarının kiçik səhvlərini isə böyük günah sayırlar. Süfyan əs-Sauri demişdir: «Hökmdara nə dostluq, nə də qulluq et. Çünki o, səni yaxın buraxıb qəbul edir, onun əksinə getdikdə məhv edir». Və icazə olmadan kiminsə hökmdarın istirahət guşəsinə girməsi qadağandır.

**Əhvalat**

Belə nəql olunur ki, 13 yaşlı ibn Şəhriyar qadağan olunmuş vaxtda atasının otağına girir. Bunu görən Şəhriyar əmr edir ki, qapıdakı keşikçi 30 şallaqla cəzalandırılsın və dərhal şəhərindən qovulsun. Onun əvəzinə yeni bir keşikçi təyin edilir. Bir müddət sonra Yəzdəgir yenə də atasının yanına keçmək istəyir.

Özündən əvvəlkinin nə üçün qovulduğunu bilən yeni keşikçi onun qarşısını kəsərək deyir: «Baxmaram ki, şahın oğlusan, bir də səni burada görsəm, 60 şallaq vurduraram. 30-nu qovulan keşikçiyə görə, 30-nu isə hökmdarı bir də narahat etməyəsən deyə. Mən sənə görə işdən qovula bilmərəm».

Şah üçün daha düzgün olar ki, özü şəxsən müharibə etməsin və öz tərəfini qorumağa çalışsın. Çünki çoxlarının həyatı, rəiyyətin güzəranı birbaşa şahın həyatı ilə bağlıdır. Həmçinin o nə özü, nə də insanları düşünülməmiş əməllər etməməli və etdiyi işlərdə qətiyyən zəiflik göstərməməlidir. Və hər gecə öz yatağına başqasını qoyub, özü isə başqa yerdə yatmalıdır ki, düşmən ona xətər yetirmək istəsə, onun yerində başqasını görsün. Bu haqda belə bir əhvalat var.

**Əhvalat**

Belə nəql olunur ki, Bəhramgur tərəfindən məğlubiyyətə uğradılan Xosrov ibn Abraviz döyüş meydanından qaçdıqdan sonra deyib: «Mənim qaçmağım utancverici olsa da, bununla mən minlərlə döyüşçümü xilas etmişəm. Çünki əgər mən ölsəydim, minlərlə əsgərim də məndən sonra məhv ola bilərdi». Bu sözlər bir daha sübut edir ki, biz bərbad bir zamanda yaşayırıq. Bu zəmanənin insanları isə çox müxtəlifdirlər; burada həm yaxşı, həm də pislik var. Hökmdarlar isə dünyəvi işlərlə məşğul olub var-dövlət yığırlar. Və pis insanları nə görməmək, nə də onlara dözmək mümkün deyil. Bir ərəb atalar sözündə deyilir: «Qul şallaqla, azad insan işarə ilə başa düşür». Bu atalar sözü kimə bel bağlayıb etibar edilə biləcəyi haqqındadır.

Vaxt var idi ki, Ömər ibn əl-Xəttabın (Allah ondan razı olsun) xəzinəsində daşıya biləcəyi bircə kisə pul olmasına baxmayaraq, bütün dünyanı müdafiə edib rəiyyətini işə sövq edə bilirdi. Bunun əsas səbəbi isə o dövrki zəmanədə, vaxtlarını əsasən dövlət işlərinə sərf edən əyanlardadır. İndiki zəmanədə isə əgər əyanlardan bu cür işləmək tələb olunsa, onlar buna dözməz və eyibləri üzə çıxmış olar. O dövrün hökmdarları böyük nüfuza malik olmaqla bərabər incə siyasət yürüdür və çalışırdılar ki, hər kəs öz işi ilə məşğul olub, bir-birilə sülh və əmin-amanlıq şəraitində yaşasın. İndi isə bununla bağlı bir əhvalat nəql edəcəyik ki, onu oxuyan və yaxud dinləyənlər bundan faydalanmış olsunlar.

Möminlərin hökmdarı Əli ibn Əbu Talibdən soruşdular: «Bu insanlara verilən öyüd-nəsihət nə üçün nəticəsiz qalır?» O, cavabında bir hədisdən sitat gətirərək bildirdi ki, ölüm ayağında olan Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, üç barmağını qaldıraraq buyurmuşdur: «Məndən o insanların vəziyyətini soruşmayın».

Onun silahdaşlarından bəziləri belə şərh etdilər ki, o, üç aya, bəzilərinin fikrincə, üç ilə, digərlərinin fikrincə, 30 ilə, bir başqalarının fikrincə isə 300 ilə işarə etmişdir. Yəni o, demək istəmişdir: «Məndən 300 il sonra gələcək o insanların halını soruşmayın». Və əgər Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, özü «məndən onların vəziyyətini soruşmayın», – deyibsə, belə insanlara verilən öyüd-nəsihətin səmərəsindən danışmaq əhəmiyyətsiz bir şeydir.

Ona bu sualı verdilər və o cavab verdi: «Əvvəllər insanlar yatırdı, alimlər ayıq qalırdı. İndi isə alimlər yatıb, insanlar isə ölüblər. Və yatmışın ölüyə müraciətinin nə faydası var?

Bizim zəmanədə bütün insanlar ölü, onların niyyət və əməlləri isə haramdır. Və əgər ki, belə bir zəmanədə hökmdar insanlar üzərində nüfuzunu və hakimiyyətini itirsə, onları itaəti altında saxlaya bilməyəcək və insanlar əxlaqsızlığa sürüklənəcəklər».

Və Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Hər şeyin gücü və hökmdarın xoşbəxtliyi dinin ən yüksək zirvəsi olan haqq-ədalətdə toplanmışdır. Rəiyyətin xoşbəxtliyi, təhlükəsizliyi və firavanlığı onunla yaradılır. O, bütün işlərin ölçü vahididir».

Qüdrətli və Böyük Yaradan buyurmuşdur: *«Kitabı və mizantərəzini haqq olaraq nazil edən Allahdır» (Quran, 42:17).*

Kimin ki qəlbində haqq-ədalətə yer var, evi mömin və aqil insanların toplandığı məkandır, düşüncələri alim və ləyaqətli insanların fikirlərinə uyğundur, ağıllı insanlarla ünsiyyət qurub, zəkalı insanlarla məsləhətləşir, o, hakimiyyətə və yüksək mövqeyə daha çox layiq olan şəxsdir. Şair demişkən:

Onun əli səxavətinin,
Qəlbi ləyaqətinin
Saxlandığı yerdir.
Evinin qapısı ədalətə,
Ehtiyacı olanlara hər zaman açıqdır.

Əl-Həsən əl-Bəsri demişdir: «Dinə yüksək dəyər verən hər bir hökmdar bununla rəiyyətinin qəlbinə xoş amal aşılamış və böyük işlər yarada bilmişdir. Və insanlar çalışırlar ki, Qadir Allahı dərk edən insanla yaxın olsunlar». Şair demişkən:

Allahı dərk edən insan üçün
Bu dünyada hər şey Onun haqqında bir bilgidir.
Bu bilgiləri əxz etməyə birinci layiq olan hər kəs
Ən xoşbəxt insandır.

**Hikmət**

Bəzorqmehr deyib: «Hökmdar öz bağına qulluq edən bağban qədər qısqanc olmalıdır. Çünki əgər bağban görsə ki, onun əkdiyi

reyhanların arasında bir alaq otu cücərib, o, reyhanlara mane olmasın deyə, bu otu kökündən qoparıb atır».

**Hikmət**

Platon[21] demişdir: «Düşmənlərini məğlub etmək istəyən hökmdar ruhən güclü, susmağı bacaran, əməli işə və sözə keçməzdən əvvəl fikirləşən, ölkəsini düşünən, nəcib qəlbli, əyanlarının hörmətini qazanan, bütün işlərdə mülayim, özündən əvvəlki şahlar və onların əməlləri haqqında məlumatlı, qəbul etdiyi qərar və işlərdə cəsur, dinində dönməz olmalıdır».

Və bu xüsusiyyətlərə malik olan hər bir hökmdar düşmənlərinin gözündə böyüyəcək və onu suçlamaq istəyən insanlar heç bir bəhanə tapmayacaqlar.

Və əgər hökmdar güc və qüdrətinin Qadir Allahdan gəldiyinə inanırsa, o, bu hökmdara ən güclü düşmənlər üzərində qələbə qazanmağa kömək edər. Və o, Allahın buyurduğu kimi qələbə qazanacaqdır: *« Neçə dəfə olub ki, az bir dəstə Allahın izni ilə böyük bir dəstəyə qalib gəlib. Allah səbir edənlərlədir!» (Quran, 2:249).*

**Hikmət**

Sokrat demişdir: «Uzun müddət hakimiyyət sürən hökmdarın əlamətləri bunlardır: İnam və zəka onun qəlbindədir. Və onun əyanları ona sevgi ilə münasibət bəsləyirlər. O, ağıllı olmalıdır ki, ağıllı insanlarla da ünsiyyət yarada bilsin. Və o, elmi sevməlidir ki, alimlərdən dərs alsın. Onun xidmətləri çoxsaylı, sarayı isə möhtəşəm olmalıdır ki, ləyaqətli insanlar onu vəsf etsinlər. Və bu sarayda aqil, zəkalı ərlər toplanmalıdır ki, buradan ətrafa maarif işığı yayılsın. Və o, başqalarının işində qüsur axtaranları hakimiyyətdən uzaqlaşdırmalıdır. Və bu xüsusiyyətləri daşımayan hökmdarın şahlığı xoşbəxt olmayacaq, onun məhvi tezləşəcəkdir. Belə hökmdarın yaxınları və dostları isə elə onun əli ilə məhv ediləcəklər. Çünki qətl düşüncəsizlikdən doğur». Bu haqda şair belə demişdir:

Zarafatda zəifsənsə, zarafat etmə.
Şahın qəzəbinə tuş gəlməməkçün
Onun gözlərinə nəzər yetirmə.

---

[21] Platon, ərəb tələffüzündə Əflatun (b.c.ə. 427-347), qədim yunan filosofu.

Və şahın ölkəsi haqda mübahisə etmə,
Çalış hirsli vaxtında ondan uzaq ol.
Yoxsa onun hirsinin qurbanı olarsan.
Məhv olsan, şah buna görə cəza çəkməyəcək,
Eşitmişəm ki, şahı sərxoşluq yaman tez tutur.

**Göstəriş və hikmət**

Müaviyə əl-Əhnəf ibn Qeysdən soruşur: «Ey Əbu Yəhya, zəmanə necə olur?» O cavab verir: «Ey möminlərin hökmdarı, zəmanə – sənsən. Sən yaxşı olsan, o da yaxşı olacaq». Və Əhnəf ibn Qeys demişdir: «Bu dünya ədalətlə çiçəklənib, zülmlə dağılır. Ədalətin işığı parlaq olub, meyvələri uzaqdan görünür».

Və Fudayl ibn İyyad demişdir: «Əgər mən əmin olsaydım ki, dualarım cavabsız qalmayacaq, ədalətli sultandan başqa, heç kəs üçün dua etməzdim. Çünki sultan bəndələrin səadəti, ölkənin zinəti deməkdir. Məhəmməd peyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, hədislərindən birində deyilir: «Ədalətli olanlar Qiyamət günü mirvaridən ucaldılan dağlara yüksəldiləcəklər».

**Əhvalat**

Bir dəfə İskəndər bir oğrunun çarmıxa çəkilməsi əmrini verir. Oğru deyir: «Ey hökmdar, həqiqətən də, mən oğurluq etmişəm. Hərçənd ki, ürəyim bunu istəmirdi». İskəndər cavab verir: «Eybi yoxdur, indi də ürəyin istəmədən çarmıxa çəkilərsən».

Və sultan ədalətli və diqqətli olmalıdır ki, verdiyi əmrləri onun vəziri, qapıçısı, canişini tərəfindən icra edilsin. Çünki hökmdarın diqqətsizliyi və laqeydsizliyi bir sıra siyasi səhvlərə və dəyərli vaxt itkisinə səbəb ola bilir. Və o, bütün imkanlarını səfərbər edib çalışmalıdır ki, belə hallar baş verməsin. Növbəti əhvalat bu haqdadır.

**Əhvalat**

Kəstaşib şahın Rast Rüşn[22] adlı vəziri var idi. Şah hər zaman belə fikirləşirdi ki, bu cür mübarək adın daşıyıcısı olan adam pis iş tutmaz. Bu səbəbdən o, vəziri haqqında gəzən söz-söhbətlərə nəinki inanır, hətta onun işlərinə nəzarət də etmirdi. Bir gün Rast Rüşn hökmdara dedi: «Sizin əyanlarınıza qarşı olan həddən ziyadə

---

[22] «Rast» (fars) – «doğru, həqiqi, dürüst», «Rüşn» (fars) «parlaq, işıq saçan» deməkdir. «Rast Rüşt» – dürüst iş, doğru əməl deməkdir.

ədalətinizdəndir ki, onlar korlanıblar. Nahaq deməmişlər ki, ədalətli hökmdarın əyanları ədalətsiz olur. Biz onları ağır cəzalandırmalı, lazım gəlsə, qovmalı və yalnız yaxşılarını qulluqda saxlamalıyıq».

Bundan istifadə edən Rast Rüşn əyanları cəzalandırmamaq üçün onlardan rüşvət almağa başladı. Bunun nəticəsində onların vəziyyəti pisləşdi, dövlət işləri zəiflədi, xəzinə isə boşalmağa başladı.

Və bir gün gözlənilmədən düşmən Kəstaşıbin üzərinə qoşun çəkdi. Xəzinəni yoxlayan Kəstaşıbə aydın oldu ki, ordunu gücləndirmək üçün dövlətin pulu yoxdur. O, atını minərək pərişan halda səhrada dolaşmağa başladı. Birdən o, kiçik bir daxma və burada otlayan qoyun sürüsü gördü. Daxmaya yaxınlaşan şahı bir gənc mehribanlıqla qarşıladı. Və yoldan gəldiyi üçün ona yemək təklif etdi. Bu an şahın diqqətini çarmıxlanmış bir it çəkdi və şah oğlana belə dedi: «Mən çörək yeyənə kimi sən bu iti nə üçün çarmıxladığını mənə izah edərsən». Və gənc oğlan olanları belə nəql etdi: «Bil ki, bu it mənim qoyunlarımı çox sədaqətlə qoruyurdu. Lakin bir gün o, bir dişi canavara rast gəlir və onun hiyləsinə uyaraq vaxtını bu canavarla kefdə keçirməyə başlayır. Canavar isə bir-bir mənim qoyunlarımı onun gözləri qarşısında oğurlayırdı. Otlaq sahibi gəlib məndən torpaq pulu tələb etdikdə isə gördüm ki, qoyunlarım əskik gəlir. Birdən itin gözü qarşısında qoyunumu sakitcə oğurlayıb aparan canavarı gördüm. Elə onda başa düşdüm ki, qoyunlarımın azalmasının əsas səbəbi bu itin mənə olan xəyanətidir. Məhz buna görə mən onu çarmıxa çəkmişəm».

Bu əhvalatdan dərs götürən Kəstaşib öz-özünə belə düşündü: «Bizim rəiyyətimiz – bizim qoyunlarımızdır və biz onların vəziyyətini şəxsən öyrənməliyik». O, geri qayıtdıqdan sonra dövlət işləri ilə bağlı aparılan bütün yazıları, qeydləri şəxsən yoxlamağa başladı. Bu zaman ona aydın oldu ki, bütün bunların arxasında Rast Rüşn durur. Və bu an onun yadına belə bir atalar sözü düşdü: «Kim ki, pis insanın xoş adına aldanıb, deməli heç nəsiz qalıb. Və əmlaka görə xəyanət edənin vicdanı olmur». Daha sonra Kəstəşab vəzirini çarmıxa çəkdirdi. Bu əhvalat «Bədirkarnamə»də vəsf olunub və orada bu sözlər var:

Mən sənin adına aldanmaram,
Sən bu adla hiylə edib mənfəət
Qazanmaq istədin.
Kim ki dövlət qazanmaq üçün

Adını tələ kimi işlədir,
Xəyanət və yalanına görə
Vicdansız adlanır.

**Əhvalat**

Belə nəql olunur ki, Əmr ibn Leysin Əbu Cəfər ibn Zaydaveyx adlı bir qohumu olub. Əmr mömin olduğu üçün ona yüksək rəğbət göstərilərək hər il Heratdan[23] mal yüklənmiş qırmızı yunlu yüz dəvə göndərilirdi. Əmr hər hədiyyədən bir ədəd Əbu Cəfərə göndərərək belə deyirdi: «Qoy o, evində bunu saxlamağa yer tapsın». Bir gün Əmr ibn Leyvə dedilər ki, Əbu Cəfər bir qulu 20 dəfə şallaqlayaraq çox ağır döyüb. Əmr göstəriş verir ki, Əbu Cəfəri hüzuruna gətirsinlər. O, saraydakı bütün qılıncları Əbu Cəfərin qarşısına düzdürərək deyir: «Əbu Cəfər, bunların içindən ən yaxşılarını və qiymətlilərini seç». Ən yaxşı qılıncları seçməyə başlayan Əbu Cəfər onlardan yüzünü kənara qoyur. Əmr deyir: «İndi isə ən yaxşı ikisini seç». Əbu Cəfər bu dəfə 100 qılıncdan ən yaxşı ikisini seçir. Əmr ibn Leys ona deyir: «Əbu Cəfər, indi isə bu iki qılıncı bir qına qoy». Əbu Cəfər təəccüblənərək: «Ey möminlərin hökmdarı, iki qılıncı bir qına necə qoymaq olar»,- deyir. Əmr ibn Leys belə cavab verir: «Bəs bir ölkəni iki hökmdar necə idarə edə bilər?». Və öz günahını başa düşən Əbu Cəfər onun qarşısında düz çöküb, torpağı öpərək əfv diləyir. Əmr ibn Leys ona belə deyir: «Əgər mən səninlə qohum olmasaydım, evinə elə hədiyyələr göndərməzdim. Bu dəfə bağışlandın, çalış bir də belə səhv etmə».

**Hikmət**

Əzdəşir demişdir: «Əgər şah öz yaxınlarını ağıllandırıb, haqsızlıqdan uzaq edə bilmirsə, bütöv bir xalqı haqqa necə dəvət edəcək?» Qadir Allah buyurub: *«Öncə, ən yaxın qohumlarını qorxut!» (Quran 26: 214).*

Və ərəblər belə deyir: «Rəiyyət üçün ən çətin şey hökmdarla görüşmək yollarını tapmaqdır». Əgər hökmdarla rəiyyət arasında birbaşa əlaqə olsa, əyanlar rəiyyəti incitməkdən çəkinər, rəiyyət isə bir-birinə qarşı haqsızlıq etməkdən qorxar. Şah heç nəyin qayğısını çəkmədən rahat həyat sürmək istəsə, əyanlar qanunsuzluğa yol verib ölkəni pis idarə edəcəklər. Şah isə yaşadığı qayğısız həyatın acı qayğılarını sonra çəkəcək.

---

[23] Bağları, bağçaları və su ehtiyatları ilə məşhur olan Xorasan şəhəri

**Əhvalat**

Belə nəql olunur ki, Əzdəşir elə diqqətli və məlumatlı idi ki, yanına gələn insanlara gecə nə ilə məşğul olduqlarını tam təfsilatı ilə danışa bilirdi. Məsələn, o, hətta bilirdi ki, filankəs gecəni hansı arvadı ilə keçirib. Onu dinləyənlər isə belə düşünürdülər ki, bunları hökmdara mələklər xəbər verir. Sultan Mahmud ibn Sabuq-Teqin də belə xüsusiyyətə malik idi.

**Hikmət**

Aristotel demişdir: «Ən yaxşı hökmdar qartal kimi uzaqgörən hökmdardır. Onun əhatəsində olan insanlar da qartal baxışlı olmalıdırlar». O, demək istəyib ki, uzaqgörən, dövlət işlərində diqqətli və ehtiyatlı olan hökmdarın ətrafı da güclü olur. Belə olduqda isə işlər yolunda gedir, ölkənin və əhalisinin vəziyyəti yaxşılaşır.

**Hikmət**

İskəndər deyirdi: «Ən yaxşı hökmdar pis vərdişləri yaxşı ilə, ən pis hökmdar isə yaxşı vərdişləri pis ilə əvəz edən hökmdardır».

**Hikmət**

Abraviz demişdir: «Hökmdar bu üç əməl sahiblərini əfv etməməlidir: onu yamanlayanı, onun qadağasını pozanı və onun sirrini açanı». Sufyan əs-Sayri (Allah ondan razı olsun) demişdir: «Ən yaxşı hökmdar alimlərlə ünsiyyətdə olmuş hökmdardır». Və deyilir ki, hər şeyə bəzək vuran insandır, insan isə biliklə bəzənir və ləyaqətini daha da artırır.

Hökmdar üçün ağıl və bilikdən yaxşı heç nə ola bilməz. Çünki bilikdə əzəmətin, ağılda isə xoşbəxtliyin sirri saxlanılır. Bilikli və ağıllı insanlar on iki xüsusiyyətə malik olurlar: xeyirxahlıq, alicənablıq, Allah xofu, dürüstlük, təvazökarlıq, mərhəmət, tərbiyə, doğruluq, etibarlılıq, səbir, mehribanlıq, işi yarıtmaq və hökmdarlara məxsus bütün digər müsbət keyfiyyətlər.

Hökmdarda mərhəmətlə xeyirxahlıq, cəsarətlə səbirlilik, çalışqanlıqla ağalıq kimi hisslərlə bərabər, ağıl, bilik və fəaliyyət bacarığı olmalıdır. Bu xüsusiyyətlərə malik insan hakimiyyətə gəlsə, o, arzuladığı hər şeyi həyata keçirə bilər.

**Əhvalat**

Abdulla ibn Tahir yazır ki, Kirman, Sicistan, Fars və Xuzistana[24] hökmranlıq edən, qüdrəti və şöhrəti hər gün artaraq adı

---

[24] Xilafətin İran əyalətlərinin adı.

aləmə yayılan Yaqub ibn Leys İraqa da hökmdarlıq etmək fikrinə düşür. Xəlifə əl-Mütamid ona belə bir məktub yazır: «Sən əvvəllər dəmir tökən fəhlə olmusan. Bəs ölkələri idarə etməyi harada öyrəndin?» Yaqub ona belə cavab göndərir: «Mənə dövlət verən Allah onları idarə etməyi də öyrədib».

Belə bir kəlam var: «Biliksiz ən qüdrətli insan da əvvəl-axır hörmətsizliklə qarşılaşacaqdır. Və Allahdan buyrulmamış bir işi görən ən kamil bəndə də sonda peşiman olacaqdır».

**Hikmət**

Bir gün Abdulla ibn Tahir atasına deyir: «Bu dövlət hələ nə qədər bizə və sülaləmizə məxsus olacaqdır?» O cavab verir: «O vaxta kimi ki, haqq və ədalət xalısı bu sarayı bəzəyir».

**Hikmət**

Bir gün xəlifə əl-Məmun şikayət və ərizələrə baxırdı. O, vəziri Fədi ibn Səhlə şikayət məktublarından birini verərək deyir: «Bu şikayətə elə indi bax, çünki ulduzların hərəkəti çox sürətli olduğundan hər saatın öz hökmü var».

Və biz deyirik ki, ağıllı, ləyaqətli və diqqətli hökmdarlar hakimiyyətlərini dərk etmək, əzilənlərlə ədalətli davranmaq, ehtiyacı olanlara kömək etmək, kainatın daim dəyişildiyini və heç bir dövlətin bu dəyişiklikdən kənarda qalmadığını anlamaları üçün belə əhvalatları diqqətlə öyrənməlidirlər.

Və o, bilməlidir ki, göylərin hökmünü nə ordu, nə də çoxlu pul və ya var-dövlətlə dəyişmək olmaz.

**Əhvalat**

Əməvilər sülaləsindən sonuncu hakim olan Mərvan 300000-lik ordusunu baxışdan keçirərkən vəziri ona deyir: «Həqiqətən də, bu, ən qüdrətli ordudur». Mərvan ona belə deyir: «Sus, vədə gələndə heç say da kömək etmir. Və əgər göylərdən hökm gəlsə, ən böyük ordu da heç olacaqdır. Bu dünya kimə sədaqətli olub ki, bizə də sadiq olsun».

**Hikmət**

Əbu əl-Həsən əl-Əxvazi demişdir: «Bu dünya heç kimə sadiq deyil. O dünyanın ehtiyatını bu dünyada gör. Və nə o dünya üçün, nə də bu dünya üçün tamamlanmamış iş buraxma».

Və deyilir ki, Yaqub ibn Leysin ölümündən əvvəl yazdığı və qəbri üzərində həkk olunmasını əmr etdiyi belə bir şeir olub:

Qəbirdəki insanlar
Sanki bu dünyadan zövq almayıblar,
Sərin su içib, duru və quru
Xörəklər dadmayıblar.
Onların qapısını gəlişi çox əzablı olan ölüm döydü.
Ey qəbrimi ziyarət edən,
Bundan dərs götür!
Və mən kasıb bir İraq
Hökmdarı olmamışam.
Məndən salam olsun
Tez axan bu dünyaya
Və onun bütün gözəlliklərinə.
Elə bil ki, Yaqub bu dünya ziyafətində
İştirak etməmişdir.

**Sual və cavab**

Hakimiyyətini itirmiş hökmdardan soruşublar: «Hansı səbəbdən hakimiyyət səndən üz döndərdi və sən də dövlətindən məhrum oldun?». O cavab verib: «Buna səbəb hakimiyyətə olan tamahım, yalnız öz bilik və düşüncələrimə əsaslanmağım, məsləhətə qulaq asmayıb böyük işləri kiçik insanlara həvalə etməyim, lazım olan an biclik və hiyləgərlikdən uzaq olmağım, ani qərarlar qəbul edilməli anda ləng tərpənməyim, insanlar çətinliyə düşəndə onlara kömək etməməyim olmuşdur».

**Hikmət**

Hakimiyyətini itirən hökmdardan soruşublar: «Pislərin ən pisi kimdir?». O cavab verib: «Öz şəxsi arzularına çatmaq üçün xəyanət edən satqın elçilər. Və dövlətin yıxılmasının əsas səbəbkarı onlardır». Elçilər haqqında Azdəmir də belə demişdir: «Onlar çox qanlar tökmüş, çox orduları məğlub etmiş, çox hörmətli və ləyaqətli insanları ləkələmiş, çox andlara naxələf çıxmış, çox razılaşmaları pozmuş və yenə də var-dövlətdən doymamışlar!» Və fars hökmdarları yalnız sınanmış dürüst insanları elçi təyin edirdilər.

**Hikmət**

Belə deyilir ki, fars şahları elçilərin ardınca casus göndərirdilər ki, o, elçinin bütün eşitdiklərini, gördüklərini və dediyini qeydə alsın. Elçi geri qayıtdıqdan sonra isə onun verdiyi məlumatlar casusun qeydləri ilə tutuşdurulurdu. Və əgər o, düz danışırdısa, bu dəfə onu düşmən ölkəyə elçi göndərirdilər.

**Əhvalat**

İskəndər fars şahı Dara ibn Daraya[25] elçi göndərir. Və bir müddət sonra geri qayıdan elçi Daranın cavabını ona çatdırarkən bir söz İskəndərə şübhəli gəlir. İskəndər elçidən Daranın doğrudanmı belə bir söz dediyini soruşanda, o: «Ey hökmdar, mən bu sözü öz qulaqlarımla eşitmişəm», – cavabını verir. İskəndər yeni bir məktub yazdıraraq bu sözləri də ora əlavə etdirib Daraya göndərir.

Məktubu oxuyan Dara bu sözləri bıçaqla pozaraq İskəndərə belə bir cavab yazır: «Həqiqətən, dövlət hökmdarın xoş niyyətinə və ədalətliliyinə əsaslanır; hökmdarın sağlam idrakı isə onun sadiq elçilərinin dürüstlüyünə əsaslanır. Çünki elçi hökmdarın dili ilə danışır. Onun qulağı ilə eşidir. İndi isə mən məktubdakı bu sözləri ona görə bıçaqla pozdum ki, onları deməmişəm və sənin elçinin dilini kəsməyə imkanım yoxdur».

Elçi geri qayıdıb İskəndərə Daranın cavabını çatdırdıqda o, birinci dəfə göndərilmiş elçini çağırtdıraraq üstünə qışqırır: «Ar olsun sənə ki, hökmdarın demədiyi sözlə onu ləkələmək istəmisən». Lakin elçi dediyindən dönmür: «Doğru deyirəm, o, məni təhqir edərək alçaldıb». Və İskəndər deyir: «Ay Allah! Biz səni ora göndərmişik ki, sən öz işlərini düzəldib, bizimkini korlayasan?» Sonra o, elçinin dilini qoparmağı əmr edir.

Hökmdar xüsusən aclıq və böhranlıq dövründə əyanlarına yardım etməlidir. Bu yardım şahın xəzinəsindən qida və pul ilə ödənilməli və şah çətin vəziyyət keçirən əyanların rəiyyəti sıxışdırmasına imkan verməməlidir. Əks təqdirdə, əhali ölkəni tərk edəcək, bu isə hökmdarın nüfuzunun və ölkə gəlirlərinin azalmasına səbəb olacaqdır. Bu hal yalnız qiymətlərin qalxmasından qazanan tacirlər üçün əlverişlidir. Hökmdar isə insanların tənə və lənəti ilə qarşılanacaqdır. Məhz buna görə də əvvəlki hökmdarlar əyanlarının qeydinə qalır, onlara öz xəzinələrindən pul ayırırdılar.

---

[25] Dariy- ərəbcə **Dara ibn** Dara, c.ə. 332-ci ildə taxta çıxmış qədim İran şahı, Makcdoniyalı İskəndər tərəfindən məğlub cdilmişdir.

**Əhvalat**

Belə bir adət var idi ki, Novruz[26] və Mehrqan[27] bayramlarında fars şahları rəiyyəti qəbul edib, onların şikayətlərinə şəxsən baxırdılar. Bu haqda məlumat bir neçə gün öncədən bütün ölkəyə əyan edilirdi. Şikayəti və xahişi olanlar əvvəlcədən hazırlıq görürdülər; hər kəs öz işi ilə bağlı dəlillər düşünür, sübutlar hazırlayırdı. Əgər kimsə birisini incitmişdirsə, məsələ şaha çatmasın deyə, əvvəlcədən üzrxahlıq edərdi. Qəbul günü carçı sarayın qapısında dayanıb bəyan edərdi ki, hər kim digərinin içəri keçməsinə bilərəkdən mane olsa, boynu vurulacaqdır.

Daha sonra şikayətlərə bir-bir baxılırdı. Adəti üzrə şahın sağında baş kahin əyləşirdi. Və əgər kimsə şahdan şikayət etmiş olsaydı, bu zaman şah baş kahinin qarşısında diz çökərək deyirdi: «Əvvəlcə bizim hər ikimizə qarşı ədalətli ol. Heç kəsə rəğbət göstərmə, tərəf tutma, çünki əgər Allah-təala öz bəndələrinə xoşbəxt tale qismət edibsə, onlara ən yaxşı hökmdarlardan birini rəhbər göndərəcəkdir. Və əgər O, bəndələrinə bu hökmdarın Onun üçün nə dərəcədə əhəmiyyətli olduğunu göstərmək istəsə, sənə demək imkanı vermədiyi bir çox sözləri onun deməsinə icazə verəcəkdir».

Daha sonra baş kahin şahdan olan şikayətin düzgün baxılmasına şəxsən nəzarət edirdi. Və əgər şikayətçi kifayət qədər əsaslandırılmış sübut və dəlillər gətirirdisə, o zaman şikayət tam təmin edilməli idi. Bunun əksi olduqda isə hökmdarı və dövləti ləkələmək istədiyi üçün şikayətçi ağır şəkildə cəzalandırılırdı. Şikayətlər bitdikdən sonra şah taxtında əyləşib tacı başına qoyaraq rəiyyət və əyanlarına deyirdi: «Mən ədalətli olmağa çalışdım, siz də bir-birinizə qarşı ədalətli olun. Və əgər kiminsə incitdiyi biri varsa, onun könlünü alın». Şah hətta ona təsir edə bilən yaxınları ilə də həmin gün görüşmürdü ki, hər şey ədalətli olsun, heç kəs ona hansısa məsələdə təsir göstərməsin.

Və bu adətə Sasanilər sülaləsinin bütün işlərinə xəyanət edən günahkar Yəzdəgirə qədər əməl olunub. O, insanları incidən, haqlarını tapdayan, çox ləyaqətsiz hökmdar kimi tanınırdı. Bir gün onun sarayına gözəllikdə tayı-bərabəri olmayan bir at daxil olur. Bütün hərbiçilərin cəhdinə baxmayaraq, heç kəs atı tuta bilmir. Birdən at Yəzdəgirə yaxınlaşaraq sakitcə onun yanında durur. Və Yəzdəgir deyir: «Bu at Qadir Allahın mənə olan hədiyyəsidir.

---

[26] «Novruz»- (fars) İranda yazın ilk günlərində qeyd edilən yeni il.
[27] «Mehrakon»- (fars) payızın əvvəli, ay təqvimi ilə 7-ci aydır.

Heç kəs ona yaxın gəlməsin". Daha sonra o, atın başını, belini tumarlamağa başlayıb, yəhər gətirilməsini əmr edir. At yenə də sakit durur. Onu öz əli ilə yəhərləyən hökmdar yəhərin möhkəmliyini yoxlayarkən birdən at onu təpiklə vurub öldürür.

At necə gəlmişdisə, elə də gedir. Və heç kəs onun hara getdiyini görə bilmir. Və insanlar deyirdilər: «Həqiqətən, bu, Yəzdəgiri öldürərək bizi zülmdən qurtarmaq üçün Allah tərəfindən göndərilmiş bir mələk idi".

**Əhvalat**

Qazi Əbu Yusif belə nəql edirdi: «Günlərin bir günü mənim yanıma – məhkəməyə Yəhya ibn Xalid əl-Barmaki və onun rəqibi olan bir atəşpərəst mühakimə üçün gəldilər.Şikayət edən atəşpərəst məsələ ilə bağlı Yəhyanın şahid göstərməsini tələb etdi. Yəhyanın şahidi olmadığından mən onu and içməyə məcbur etdim. And içən Yəhya bununla öz rəqibini də razı sala bildi. Və mən İslamın şərəfi naminə tərəfkeşlik göstərməyib, Yəhya ilə bu atəşpərəst arasındakı mühakiməyə qərar verdim. Mən ona görə tərəf tutmadım ki, bunun hesabını daha sonra Qadir Allaha vermək məcburiyyətində qalmayım».

Cəmiyyətdə yüksək vəzifə sahibləri özlərindən aşağı təbəqənin insanlarını qətiyyən incitməməli və onlar da öz növbələrində Allahın əmrlərinə itaət edərək, hökmdarına qarşı çıxmamalıdırlar. Qadir Allah buyurmuşdur: *«Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar sahiblərinə itaət edin» (Quran, 4:59).* Allahın vəzifə və səlahiyyət sahibi edib ucaltdığı insanlara bəndələr Allaha (şükürlər olsun Ona!) və Peyğəmbərə, ona Allahın xeyir-duası və salamı olsun, sitayiş etdikləri kimi itaət edib ondan qorxmalıdırlar. Bunun əvəzində hökmdar xeyirxah olmalı, Allahına sitayiş etməli və bütün işlərini Onun xeyir-duasını almaq üçün haqq-ədalət üzərində qurub məzlumların müdafiəçisi olmalıdır. Və deyilmişdir: «Məzlumların lənətindən və Allahı yalnız göz yaşı olanların qəlbini sındırmaqdan qorx! Çünki heç kəs səni incidilmiş insanın lənətindən müdafiə edə bilməz. Onun Qadir Allaha etdiyi dualar isə cavabsız qalmayacaq. Xüsusən dan yeri söküləndə və gecə səssizliyində edilmiş dualar». Şair demişkən:

Xeyirxahlıq mümkün olan yerdə
Tələsmə zülm edəsən.

Yoxsa bunun nəticəsi –
Günah, qorxu və əzabdır.
Sən yatarkən sənin incitdiyin
Yatmayıb səni lənətləyəcəkdir.

Və Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Məni dörd nəfər bütpərəstin ölümü çox məyus etmişdir; Ənuşirəvanın ölümü – o, çox ədalətli idi, Hatəm ət-Tainin ölümü – o, çox səxavətli idi, İmr əl Qeysin ölümü – o, gözəl şair idi və Əbu Talibin ölümü – o, çox xeyirxah idi».

**II Fəsil**

# MƏSLƏHƏTÇİLƏRİN SİYASƏTİ VƏ ONLARIN HƏYAT TƏRZİ HAQQINDA

Bil ki, hökmdarın şan-şöhrətinin artması onun ağıllı, bacarıqlı və ədalətli məsləhətçisi olmasından çox asılıdır. Heç bir hökmdar təkbaşına, məsləhətçisiz ölkə idarə edə bilməz. Yalnız öz fikirlərinə əsaslanıb qərar verənlər başqalarının gözündə alçalırlar. Məgər bilmirsən ki, insanlar arasında tutduğu əlçatmaz mövqeyə, gözəl natiqlik qabiliyyətinə baxmayaraq, Allah-təala Məhəmməd Peyğəmbərə, ona Allahın xeyir-duası və salamı olsun, tərəfkeşləri və aqil insanlar ilə məsləhətləşməyi vacib buyurmuşdur. Və deyib ki: *«İş barəsində onlarla məsləhətləş» (Quran, 3:159)*. Başqa bir yerdə isə o bildirib ki, Musa belə demişdir: *«Öz ailəmdən mənə bir vəzir ver - qardaşım Harunu. Onunla arxamı möhkəmləndir. Onu işimə ortaq et» (Quran, 20:29-32).*

Əgər peyğəmbərlər məsləhətçisiz keçinə bilməyiblərsə, adi insanların onlara daha çox ehtiyacı var.

Əzdəşir ibn Babəkdən soruşurlar: «Hökmdar üçün ən yaxşı dost kimdir?». O cavab verir: «Ağıllı, mərhəmətli, dürüst və əməlisaleh məsləhətçi. Belə insanın məsləhəti ilə hökmdar qərarlar qəbul edə və qəlbinin dərinliklərində saxladığı fikirləri onunla bölüşə bilər. Və hökmdar məsləhətçilərlə münasibətdə üç qanuna mütləq əməl etməlidir. Birinci, əgər o, məsləhətçidə qüsur və ya səhlənkarlıq görsə, tərəddüd etmədən cəzalandırılmalıdır. İkinci, əgər məsləhətçi yaxşı var-dövlət toplayıbsa, hökmdar onun varidatına göz dikməməli və xidmətində saxlamalıdır. Üçüncü, əgər məsləhətçiyə müxtəlif məsələlərlə bağlı yanaşırlarsa, onun da xahişləri ləngidilmədən yerinə yetirilməlidir».

Və hökmdar öz məsləhətçisinə bu üç şeyi qadağan etməməlidir: məsləhətçi onu istədiyi vaxt qəbul etməli, onu ləkələməyə yönəlmiş sözlərə inanmamalı və heç bir sirrini məsləhətçidən gizlətməməlidir. Çünki yaxşı məsləhətçi hökmdarın sirrini gizli saxlamaqla bərabər, dövlətin işlərini, vilayətlərin və xəzinənin inkişafını idarə edir. O – ölkənin yaraşığıdır. Məsləhətçi iş barəsində həm da-

nışmalı, həm də lazım gəldikdə verdiyi sualların cavabını dinləməlidir. Onun simasında hökmdarın xoşbəxtliyi və düşmənlərin qorxusu birləşir. O, hər kəsdən daha çox hörmətə, ehtirama layiqdir. Xosrov Ənuşirəvan öz oğluna demişdir: «Vəzirinə hörmət et, çünki o, səndə sənə yaraşmayan nəsə görərsə, bunu sənə bildirəcəkdir».

Və məsləhətçi xeyrə yaxın olub, şərdən uzaq qaçmalıdır. Və əgər hökmdar ağıllı, insanlara qarşı mərhəmətlidirsə, məsləhətçi bu yolda ona arxa-dayaq olmalıdır. Yox, əgər hökmdar qəddar, insanlara qarşı zalımdırsa, məsləhətçi onu bu yoldan çəkindirməyə çalışmalıdır.

Və bil ki, hökmdarın hakimiyyətdə qalma müddəti məsləhətçidən, bu dünyanın əmin-amanlığı, qayda-qanunu isə hökmdardan asılıdır. Və buna görə də məsləhətçi bilməlidir ki, o, hökmdarın ehtiyacı olduğu birinci adamdır. Və ölkə işlərində onu həqiqətdən başqa, heç nə düşündürməməlidir.

Hökmdar Bəhramgurdan soruşublar: «Hökmdarın şad və firavan hakimiyyət sürməsi üçün neçə əshabəyə ehtiyacı vardır?». O cavab verib: «Yeddi dosta: dürüst məsləhətçiyə ki, hökmdara məlum olmayanları onun üçün faş edib, işləri irəli apara bilsin; yaxşı ata ki, lazım gəldikdə onu xilas edə bilsin; iti qılınca; yaxşı əsləhaya; ləl-cəvahirata, mirvari kimi çəkisi az, dəyəri yüksək olan var-dövlətə; ürəyə xoş gələn, dərd-səri unutduran yaxşı arvad və bacarıqlı aşbaza.

**Hikmət**

Şah Əzdəşir deyirdi ki, hər bir şahın dörd insana ehtiyacı var: etibarlı məsləhətçiyə, savadlı mirzəyə, rəhmli qapı keşikçisinə və ibrətli kef yoldaşına. Əgər həmin insanları tapsa, onları qorumalıdır. Çünki əgər məsləhətçi etibarlı insan olsa, o, hər vəchlə çalışacaq ki, hakimiyyət mümkün qədər uzun müddətə hökmdarın əlində qalsın. Savadlı mirzə hökmdarın ağlının və ciddiyyətinin göstəricisi sayılır. Əgər qapı keşikçisi rəhmli insandırsa, xalq içində də qarışıqlıq olmaz. Və əgər kef yoldaşı ibrətli insandırsa, bu, işlərin dürüstlüyünə və sahmanına işarədir.

**Hikmət**

Ənuşirəvan dövrünün baş kahini demişdir: «Şübhəsiz ki, sadiq, hər zaman kömək etməyə hazır olan dostlarsız dövləti saxlamaq qeyri-mümkündür. Lakin əgər hökmdarın ürəyində Allah

xofu yoxdursa, ən yaxşı dost da ona kömək edə bilməz. Çünki əvvəlcə kök sağlam olmalıdır ki, budaqlar da canlı olsun. Və hökmdarın Allah xofunun dürüstlük və ədalətinin mahiyyəti ondadır ki, o, hər işdə dürüst olsun. Haqqı sözlərinin və əməllərinin əsası kimi yaşatsın. Və onun yaxınları və əyanları da haqq-ədaləti işlərinin əsası kimi qəbul etsinlər.

«Və hökmdar qəti olaraq Allaha inanmalı, öz gücünü, qüdrətini, düşmənləri üzərində qazandığı qələbələri Allahın iradəsi kimi qəbul etməlidir. O, özü haqqında yüksək fikirdə olmamalıdır». Əks təqdirdə, əgər o, özü haqqında yüksək fikirdə olsa, bu əhvalatda deyildiyi kimi məhv ola bilər.

**Əhvalat**

Belə nəql olunur ki, Süleyman şah günlərin birində taxtda oturarkən külək onu taxt qarışıq göyə qaldırır. O, yuxarıdan aşağı öz dövlətinə, hakimiyyəti altında olan insanlara və cinlərə baxaraq özünü öyməyə başlayır. Bu an taxt titrəyir. Süleyman az qalır ki, taxtdan aşsın. Süleyman deyir: «Düz dur!» və dilə gələn taxt belə cavab verir: «Əvvəlcə özün düz ol ki, sonra da biz düz olaq». Bu barədə Allah-təala belə buyurmuşdur: *«Hər hansı tayfa öz tövrünü (nəfsində olanları) dəyişmədikcə (pozmadıqca), Allah da onun tövrünü (onda olanları, onun əhvalını) dəyişməz» (Quran, 13:11).*

Və məsləhətçi ağıllı, savadlı, ləyaqətli bir müəllim olmalıdır. İnsanlar təcrübə ilə əldə etdiklərini müəllimləri vasitəsilə mənimsəyirlər. Və məsləhətçi dövlətin yaraşığı olmalı, əməlisalehliyi ilə seçilməli və adı heç bir pis işlə ləkələnməməlidir. Onun adının tərifə çəkilməsi, həyat tərzinin nümunə kimi göstərilməsi üçün bunlara əməl etməsi vacibdir: hər cür çətin vəziyyətdən çıxmaq bacarığı, ehtiyatlılıq; gizli işlərin sirləri qalmaması, açılması üçün elm, bilik, lazım gəldiyi an qorxaqlıq göstərməyərək ən qəti addım atmaq üçün cəsarətli olmaq; hamı ilə dürüst davranmaq üçün düzgün olmaq; qəbir evinə qədər sirri saxlaya bilmək. Azdəşir ibn Babək demişdir: «Məsləhətçi səbirli, cəsur, səxavətli, gözəl natiq, məlahətli, ciddi olmalı, susmaq lazım gələndə susmağı, danışmaq lazım gələndə danışmağı bacarmalıdır. Və bununla bərabər, məsləhətçi dindar olmalı, qəlbinin haramla ləkələnməməsi, təmiz saxlanması üçün haqq yolunu tutmalıdır.

Və o, təcrübəli olmalıdır ki, çətin məsələlərin həllində hökmdara kömək etsin. Uzaqgörən olmalıdır ki, atılan addımların nəticə-

sini əvvəlcədən duya bilsin, mümkün qədər də zəmanəsinin eybəcərliklərindən uzaq qaçmalıdır. Və hökmdarını sevib ona qarşı hörmət saxlayan hər bir məsləhətçinin çoxlu düşməni olacaq. Onlar sayca dostlardan da çox olacaqlar. Lakin hökmdar onun məsləhətçisini şərləmək istəyənlərə qulaq asmamalıdır. Və məsləhətçi özü nümunəvi həyat tərzi keçirməklə bərabər, yolunu azmış hökmdarını da haqq yoluna çəkməlidir. Lakin bunu çox yumşaq şəkildə, hökmdarı əsəbiləşdirmədən etməlidir. Əks təqdirdə, əsəbiləşmiş hökmdar əvvəlkindən daha pis ola bilər. Buna sübut kimi qüdrətli Allahın Musa ilə Harunu Fironun yanına göndərərkən buyurduqlarını göstərmək olar: *«Onunla yumşaq danışın, bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud (Rəbbindən) qorxsun» (Quran, 20:44).*

Və əgər Qadir Allah öz peyğəmbərinə düşməni ilə mülayim rəftar etməyi buyurmuşdursa, adi insanların bu həlimliyə daha çox ehtiyacı var. Və əgər hökmdar öz sözlərində bir qədər kobudluğa yol verirsə, məsləhətçi bundan incik düşüb qəlbində kin bəsləməməlidir. Çünki hökmdarın qüdrəti ona söz azadlığı verir ki, düşündüyünü istədiyi kimi deyə bilsin. Və əgər məsləhətçi hökmdarını sözlərində düzgün, əməlində mülayim olaraq görmək istəyirsə, özü bu yolun yolçusu olmalı, yalnız daha sonra onun da bu yola gəlməsi üçün kömək göstərməlidir. Məsləhətçinin işi gördüyü yaxşı işlərin hesabatını hökmdara çatdırmaqla məhdudlaşmamalıdır.

Aqillər belə deyiblər: «Bir kimsəyə yaxşılıq etdikdən sonra özünü ona tərifləmək, onu danlayaraq qınamaqdan daha pisdir. Məsləhətçi və hökmdara yaxın olan digərləri də bilməlidirlər ki, onların etdikləri bütün yaxşılıqlar Allahın xeyir-duası və hökmdarın izni ilə həyata keçirilir. Ölkəyə gələn ziyan isə iki şeydən qida alır: birinci – imanı zəif məsləhətçi, ikinci isə hökmdarın pis niyyəti».

Ənuşirəvan demişdir: «Ən pis məsləhətçi müharibə, itki və ölümdən çəkinmək mümkün olduğu zaman hökmdarı müharibəyə ruhlandıran məsləhətçidir. Çünki müharibədə əziz və qiymətli insanlar həlak olur, xəzinə isə boşalır». Və o, belə də buyurmuşdur: «Səfeh məsləhətçisi olan hökmdar yağış yağdırmayıb, torpağı bərəkətləndirməyən bir buluda bənzəyir».

Aristotelin kitabında belə sözlər vardır: «Çətin bir məsələni hərb və güclə həll etməyindənsə, başqasının bunu sülhlə həll etməsi daha yaxşıdır».

Aqil insanlar belə məsləhət edirlər: «İlanı öz əlinlə yox, başqasının əli ilə tut». Məsləhətçilər qərəzliliyin müharibəyə keçməsinə

imkan verməməlidirlər. Onlar ehtiyac olduqda bir-birinə göndərdikləri namələrlə «müharibə» aparmalıdırlar. Lakin əgər bu hiyləgərlik də nəticə verməsə, ədavət qanlı toqquşmaya keçməsin deyə, qiymətli hədiyyələr və pul işə düşməlidir. Və əgər ki, müharibə qaçılmaz olsa, məsləhətçi məğlub olmuş ordunun əsgərlərini əfv etməli və onları cəzalandırmağa tələsməməlidir. Çünki dirini öldürə bilərsən, ölünü isə dirildə bilməzsən. Və həmçinin kişi 40 yaşında yetkinləşir. Və yalnız 100-dən biri hökmdarın ordusunda qulluğa yararlı olur. Və əgər əsgərlərdən kimsə əsir düşürsə, məsləhətçi onun azad edilməsi üçün əlindən gələni əsirgəməməlidir ki, bunu görən digər əsgərlər ürəkli olub, döyüşə çəkinmədən getsinlər.

Və vəzir ordunun vəziyyətinə şəxsən nəzarət etməli, hər döyüşçüyə layiq olduğu qayğını göstərməli, aralarında ən layiqlilərini silahla rəftara cəlb etməlidir. O, döyüşçülərlə çox mülayim və kübarcasına danışmalı və onların suallarına hörmətlə cavab verməlidir. Çünki əvvəlki dönəmlər qiyam qaldırmış döyüşçülər çox məsləhətçiləri qətlə yetirmişdilər.

Hökmdarın xoşbəxtliyi, taleyin onun üzünə gülməsi məhz Allah tərəfindən bəxş edilən məsləhətçi və müəllimdə biruzə verilir. Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Allah hökmdara yaxşılıq etmək istədikdə ona səmimi, dürüst və xeyirxah bir məsləhətçi göndərir ki, nəyi isə unutsa, xatırlatsın və lazım gəldikdə kömək əlini uzatsın”.

Bu kitabın müəllifi deyir ki, adı həmd olmuş Allah öz qüdrətini hər zaman və hər an nümayiş etdirir. Və o, öz qullarının içindən hökmdarları, məsləhətçiləri, böyük alimləri bu dünyanı daha da mükəmməlləşdirmək üçün seçmişdir.

Zəmanənin möcüzələrindən biri kimi öz səxavəti, böyüklüyü və xeyirxahlığı ilə dünyada tayı-bərabəri olmayan Bərmakilər sülaləsini göstərmək olar. Bu sülalənin insanları bir çox dövlət vəzifələrini tuturdular. Lakin onların nəsil şəcərəsi kəsildikdən sonra dövlət işləri zəiflədi. Sultanın böyüklüyü və əzəməti öz əvvəlki gücünü itirdi. Bu, Qüdrətli və Rəhmli Allahın izni ilə Səlcuqilər sülaləsinin hakimiyyətdə təmsil olunmasına qədər davam etdi. Bir çox layiq insanların məsləhətçi və daha yüksək vəzifə tutmasından sonra ölkə işləri yoluna düşdü; layiqli, elmli insanlar, tanınmış və adi əcnəbi səyahətçilər, ümumiyyətlə, hər kəs onların rəhmi, xeyirxahlığı ilə əhatə olundu. Biz bunu ona görə nəql etdik ki, bu kitabı oxuyan ədalətin və ədalətsizliyin fərqini bilsin.

Bazərcəmşir demişdir: «Bu dünyada mexaniki heç nəyi müqayisə etmək olmaz. Çünki, məsələn, insanın mahiyyəti başqalarının mahiyyətindən müqayisəolunmaz dərəcədə yüksəkdədir. Və şübhəsiz, insan dünyanın bəzəyidir. Və Ulu Yaradanın əməllərində səhv axtarmaq olmaz. O, hər kəsə layiq olduğu qədər xoşbəxtlik verir».

Və hökmdarın məsləhətçiləri, ölkəni idarə edənlər göstərdiyimiz kimi olmalı, əcdadların adət-ənənələrinə əməl edərək, onların yolunu tutmalıdırlar. Onlar rəiyyətdən pulun vaxtında toplanmasına nəzarət etməli, yığılan verginin dəyərini bilməlidirlər. Eyni zamanda rəiyyətdən onların imkanlarına uyğun vergi yığdırmalıdırlar. Və onlar vergi yığarkən sərçə vuran ovçu yox, durna ovuna çıxmış ovçu olmalıdırlar. Və onlar kimsə öldükdən sonra varis olub var-dövlət qazanmaq arzusu ilə yaşamamalıdırlar. Və əyanların və ətrafdakı insanların ürəklərini onlara qarşı etdikləri xeyirxahlıq və verilən imtiyazlarla fəth etməlidirlər. Və onlar bilməlidirlər ki, cəmiyyətdəki yüksək mövqeləri, rahat həyatları, firavanlıqları birbaşa əyanları ilə bağlıdır. Və əgər qadir Allahın istəyi və razılığı olsa, qoy onların bu dünyadakı adları xeyirlə anılsın. Axirətdə isə rəhmlə qarşılansınlar.

III Fəsil

# MİRZƏLƏR VƏ SAVADLI İNSANLAR HAQQINDA

Alimlər deyiblər ki, qələmdən dəyərli heç nə yoxdur. Çünki onunla keçmişi qaytarmaq mümkündür. Qələmin dəyərini və onun yüksək məqamını şərtləndirən amillərdən biri də odur ki, qadir Allah özü qələmə and içir. Və qüdrətli yaradan belə demişdir: *«Nun! And olsun qələmə və (mələklərin) yazdıqlarına!» (Quran, 68:1).*

Qadir Allah deyir: *«Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir. O Rəbbin ki qələmlə yazmağı öyrətdi» (Quran, 96:3-4).*

Və Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Qüdrətli Allahın ən birinci yaratdığı qələmdir ki, Qiyamət gününə qədər olduğu kimi qalacaqdır.

Abdulla ibn Abbas (Allah ondan razı olsun) Yusif peyğəmbər (ona salam olsun) haqqında ayəni – *«Məni məmləkətin xəzinələrinə məmur təyin et, çünki mən onları qorumağı bilirəm» (Quran, 12:55)* – şərh edərək demişdir ki, onun mənası budur: «Məni məmləkət xəzinəsini qorumağa təhkim et. Çünki mən oxumağı və hesablamağı bacarıram. Qələm isə nitq yaradır». İbn Mütaaz deyirdi: «Qələm – başlanğıc, ağıl – mahiyyət, qələm – zərgər, məktub isə onun peşəsidir».

Müdrik Cəlinus[28] demişdir:

«Qələm – sözün dərmanıdır». Pliney deyirdi: «Qələm – böyük sirr yazandır». İsgəndər isə demişdir: «Bu dünya iki şeyin hakimiyyəti altındadır: qılınc və qələmin. Qılınc isə qələmin hakimiyyətindədir".

Qələm savadlı insanların səviyyəsinin, onların elm xəzinəsinin təzahürüdür. Və məhz qələmlə yazılanlar vasitəsilə yaxın və ya uzaqda olmasına baxmayaraq, insanların düşüncələri ilə tanış oluruq. Və insanın çox təcrübəli olmasına baxmayaraq, onun zehni kitablara müraciət etməyənə qədər kamilləşməyəcəkdir. Çünki hər bir insanın ömrü müəyyən dövrü əhatə edir və ona verilən bu

---

[28] Qalen, ərəb tələffüzündə Calinus (e.ə.129-199) – qədim Roma həkimi, tibbə aid traktatların müəllifi

müddət ərzində əvvəlcədən müəyyən edilmiş həcmdə təcrübə toplayıb, onu qəlbində saxlaya bilər. Qələm və qılınc hər şeyi idarə edir və onlarsız bu dünya mövcud olmazdı.

O ki qaldı mirzələrə, onlar böyük insanlara faydalı xidmət etməli, bunun üçün isə peşələrinə lazım olandan artıq məlumata malik olmamalıdırlar.

Müdriklər və əvvəlki hökmdarlar belə deyirdilər: «Mirzə on bacarığa malik olmalıdır: yerin altındakı suyun yaxınlığını və uzaqlığını müəyyən etməyi bacarmalı, arxların çəkilməsi elminə yiyələnməli, gündüzün və axşamın yerdəyişmə, qışda və yayda azalıb-çoxalma, günəşin, ayın və ulduzların hərəkət qanunlarını bilməli, tikinti üçün hesablamalar aparmaq səriştəsi olmalı, kənd təsərrüfatı üçün faydalı bilgiləri öyrənməli, tibbdən, dərmanların təsirindən anlayışlı olmalı, şimal və cənub küləklərini müəyyən etməli və nəzm haqqında elmi bilməlidir.

Və bununla bərabər, mirzə şən, münasibətdə səmimi olmalı, qələmi itiliyə və hazır vəziyyətə gətirməyi bacarmalıdır. Və o, qəlbindəki hər şeyi qələmin ucu ilə əks etdirməyi bacarmalı və özünü qələmin hakimiyyəti altına düşməkdən qorumalıdır.

Və mirzə hansı hərflərin ayrı, hansıların isə bitişik yazılmasını bilməlidir. Və o, hər bir hərf üzərində diqqətlə işləyərək, aydın və təmiz yazmalıdır. Belə nəql edirlər ki, möminlərin hökmdarı Ömər ibn əl-Xəttabın (Allah ondan razı olsun) canişinlərindən biri Əmr ibn əl-Asuya məktub yazarkən «Bismi-llahi-ərrahmani-r-rəhim» ifadəsində «s» hərfini oxunmaz şəkildə qələmə alır. Ömər onu yanına çağırtdıraraq deyir: «Əvvəlcə «s» hərfini düzəlt, ondan sonra vəzifənə dön».

Və mirzə ilk öncə qələmi düzgün itiləməyi bacarmalıdır. Çünki qələm iti olmasa, yazı gözəl və aydın oxunan alınmaz. Növbəti əhvalat bu haqdadır. .

**Əhvalat**

Rey şahənşahının on məsləhətçisi var idi və onlardan biri əs-Sahib İsmayil ibn İbad idi. Bir dəfə bütün məsləhətçilər qərara gəlirlər ki, onu alçaldaraq, lağa qoysunlar. Onlar belə söz yayırlar ki, guya əs-Sahib qələmini itiləyə bilmir. Bunu eşidən şahənşah onların hamısını toplayır. Əs-Sahib onlara deyir: «Siz özünüzdə olan, lakin məndə olmayan hansı yüksək xüsusiyyətə maliksiniz ki, mənim haqqımda şahənşahın yanında söz deməyə cürət etmisiniz?

Doğrudur, mənim atam məni nazir olmağa öyrədib, xarratlığa yox. Və mənim ən az bildiyim, qələmi necə itiləməkdir. Lakin sizin aranızda elə birisi varmı ki, ucu qırıq qələmlə böyük bir kitab yaza bilsin?» Həqiqətən, digər məsləhətçilərin bunu edə bilmədiyini görən şahənşah deyir: «Elə isə sən yaz». Əs-Sahib bir qələm götürərək onun ucunu qırır və elə bu qələmlə də bir səhifə yazı yazır. Bunu görən digərləri onun üstünlüyünü və yüksək əxlaq sahibi olmasını etiraf edirlər.

Ən yaxşı qələmlər düz, sarı rəngli və artması yumşaq olanlardır. Ucu sağa əyilmiş qələmlər ərəb, fars və ivrit, ucu sola əyilmişlər isə dori dilində yazmaq üçün daha çox uyğundur. Ən yaxşı qələm haqqında Yəhya ibn Xalid əl-Bərməki Xalid ibn Leysə göndərdiyi məktubunda belə deyirdi: «Sənə iti, nə bərk, nə də yumşaq, lakin ortası nazik bir qələm göndərirəm».

Qələmi yonan bıçaq da iti olmalıdır. Bu qələm durna dimdiyinə bənzəməli və sağ tərəfə əyilməlidir. Və qələm qəddəyən də mütləq bərk olmalıdır. Qələm yüngül borucuqda iran üzlüyündə saxlanmalı, ağız isə parlaq və düz olmalıdır. Mirzə hər bir hərf üzərində xüsusi işləməlidir. Hər üç hərfdən bir qələm mürəkkəbə batırılmalıdır. Qələm üç hərfdən tez mürəkkəbə batırılsa, yazı kobud alınar. Hərflər bir-birinə uyğun gəlməlidir ki, bu da yalnız ağıllı, təcrübəli və barmaqları buna vərdiş etmiş xəttatın işidir.

Möminlərin hökmdarı Əli ibn Əbu Talibin (Allah ondan razı olsun) mirzəsi olan Abdulla ibn Rəfi demişdir: «Mən məktub yazanda möminlərin hökmdarı mənə buyurdu: «Abdulla, cəlfanı[29] bir az da uzun et, sətirlər arasında olanı böyüt, hərflər arasında olanı isə birləşdir».

Çox bacarıqlı mirzə olan Abdulla ibn Cibilla öz şagirdlərinə deyirdi: «Qoy qələmləriniz «bəhriyyə»[30] olsun. Əgər belə olmasa, çalışın ki, qələmləriniz latun və bürüncdən olsun. Qələmin gövdəsinin artıq hissələrini kəsin ki, sizə mane olmasın. Möhürsüz məktub göndərməyin. Çünki vacib şəxsdən göndərilən məktubun yeganə işarəsi, sübutu onun möhürüdür".

Və Abdulla ibn Abbas (Allah ondan razı olsun) – *«Mənə çox qiymətli bir məktub göndərildi» (Quran, 27: 29)* ayəsini şərh edərək «qiymətli» sözünü möhürlənmiş kimi yazmışdır. Bir dəfə farslara məktub yazılanda Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-

---

[29] Cəlfa – qələmin yazan hissəsi
[30] Nilin mənbəyində bitən qamış

duası və salamı olsun, deyir: «Onlar möhürsüz heç bir məktubu qəbul etmirlər». Və o, bu məktubu qaşında – «Allahın Rəsulu Məhəmməd» sözləri yazılmış üzüyü ilə möhürləmişdir.

Səhr ibn Ömərdən məlum olur ki, Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, Həbəşistan imperatoru Nequsa məktub yazdıqdan sonra onu torpağa atmış, yalnız ondan sonra göndərmişdir. Və heç də qəribə deyil ki, Nequs bu məktubdan sonra islamı qəbul etdi. Lakin o, Xosrov Ənuşirəvana yazdığı məktubu yerə atmadan göndərdiyi üçün o da islamı qəbul etmədi. Və Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Məktublarınızı toza batırın, çünki yer bərəkət gətirir». Və «Məktublarınız uğurlu olsun deyə, onu toza batırın».

Mirzə yazdığı məktubu bükməzdən öncə onu bir daha oxumalı, səhv tapdıqda onu düzəltməlidir. O, az sözlə çox mənaya çalışmalı, eyni sözün təkrarına mümkün qədər yol verməməli, sözü az işlətməli, ağır sözlərdən imtina etməlidir.

Və məktub qaydası haqqında daha çox söz demək olar, lakin kitab çox da böyük olmasın deyə, biz bununla məhdudlaşırıq. Belə deyirlər ki, ən yaxşı nitq qısa, böyük, hədəfi vuran və insanı üzməyəndir.

IV Fəsil

# HÖKMDARLARIN MƏRAMLARININ BÖYÜKLÜYÜ HAQQINDA

Möminlərin hökmdarı Ömər ibn əl-Xəttab (Allah ondan razı olsun) demişdir: «Bütün qüvvəni səfərbər et ki, daim fəaliyyətdə olasan. Çünki insanı fəaliyyətsizlik qədər pis alçaldan heç nə görməmişəm». Əmr ibn əl-As isə demişdir: «İnsan öz yerini özü müəyyən edir; əgər o, özünə hörmət qoyursa, onun yeri yüksəlir, özünü alçaldırsa, mövqeyi də çox alçaq olur».

Və fəaliyyətin mənası insanın özünü ucaltmasındadır. Çünki şəxsi ləyaqətin dərki böyük insanlara məxsus keyfiyyətdir; onlar öz qiymətlərini bilib, özlərinə hörmət edirlər. İnsanın özünə hörməti isə əxlaqsız insanlarla münasibətdən imtina etməsi, ona yaraşmayan işlərdən, qınana biləcək əməllərdən uzaq olmasıdır. Fəaliyyət və şəxsi ləyaqət hissi hökmdarlara məxsus olmalıdır. Çünki Allah onları bu keyfiyyətlərlə təmin etmişdir. Onun məsləhətçiləri və ətrafındakılar isə hökmdarlardan öyüd almalıdırlar. Növbəti əhvalat da bu barədədir.

**Əhvalat**

Xəlifə Əbu Davanik əl-Mənsur bir nəfərin 500 dirhəmlə mükafatlandırılmasını əmr edir. Və Əhməd ibn əl-Xatib deyir: «Hökmdara mindən az rəqəmə müraciət etmək yaxşı deyil».

Bir dəfə Harun ər-Rəşid bir hüzür mərasimində görür ki, onun əsgərlərindən birinin atı tələf oldu. Və o, deyir: «Ona 500 dirhəm verilsin» Yəhya ibn Xalid nəzəri ilə hökmdarın səhv etdiyini başa salır.

O, atdan düşdükdə isə ər-Rəşid ondan soruşur: «Mənim səhvim nə idi ki, baxışınla bildirmək istəyirdin».

O cavab verir: «Hökmdarın dilindən mindən az rəqəm çıxmamalıdır». Ər-Rəşid yenə soruşur: «Bəs əgər elə bir vəziyyət olsa, məsələn, indiki kimi, min və yaxud mindən artıq vermək olmaz, onda nə etməli?». O cavab verir: «Əmr et ki, onda at versinlər. Və ona da at veriləcək. Sən isə heç nədən utanmayacaqsan».

Və məhz bu səbəbə görə əl-Məmun öz oğlunu taxtdan uzaqlaşdırdı. Bu da ona görə baş verib ki, əl-Məmun oğlu əl-Abbasın otağının yanından keçərkən onun qulluqçusuna dediyi bu sözləri eşitmişdir: «Qala qapısının yanında dadlı paxlava görmüşəm, ürəyim onu istəyir. Yarım dirhəm pul götür, get bir az al». Onu yanına çağırtdıran əl-Məmun deyir: «Sən indidən bilirsən ki, dirhəmin yarısı olur. Sən nə taxta, nə də ölkə hökmdarlığına layiq deyilsən. Və səndən nə uğur, nə də firəvanlıq gözləmək olar, rədd ol buradan!»

**Hikmət**

«Vəsiyyətnamə»də deyilir ki, Əzdəşir oğluna demişdir: «Oğlum, əgər sən oğlanlarından kiməsə nəsə hədiyyə etmək istəsən, çalış onun dəyəri bir vilayətdən, kənddən, şəhərdən və ya qəsəbədən alınan verginin məbləğindən az olmasın ki, hədiyyə etdiyin adamın bütün ehtiyaclarını ödəyə bilsin. Bu ona görədir ki, onun nəinki özü, hətta övladları və gələcək nəsli ehtiyac içində yaşamasınlar. Və çalış ki, ticarətlə məşğul olmayasan. Çünki ticarət hökmdarın ləyaqətini alçaldan fəaliyyət növüdür».

**Əhvalat**

Belə nəql olunur ki, Xarəzm hökmdarı Saburun vəziri bir gün ona belə bir məktub yazır: «Mən dənizlə gələn tacirlərdən yüz min dirhəm vergi əvəzinə, özləri ilə gətirdikləri mirvari və digər daş-qaşlardan götürmüşəm. İndi isə bir tacir gəlib bunları bizdən daha yüksək qiymətə almaq istəyir. Mən sizin göstərişinizi gözləyirəm». İbn-Sabur cavabında ona yazır: «Ticarətlə qazanılmış yüz min və yüz min dəfə yüzminlər bizim üçün vacib deyil; əgər biz ticarətlə məşğul olsaq, ölkəni kim idarə edər. Ey axmaq, bir də bu cür səhv söz demə, pulumuza ticarətlə qazanılmış,nə bir dirhəm, nə də bir qara qəpik qat. Çünki bu, hökmdarın ləyaqətini, adını alçaldıb, mövqeyini eybəcərləşdirir, onun həm sağlığında, həm də ölümündən sonra şöhrətinə ləkə vurur».

**Əhvalat**

Belə nəql olunur ki, əmir Ömər ibn Həmzə xəlifə Əbu Davanik əl-Mənsurun çağırdığı toplantıda iştirak edirdi. Bu toplantıda xəlifə şikayətləri dinləyirdi. Birdən şikayətçilərdən biri ayağa qalxıb dedi: «Ey möminlərin hökmdarı, məni incidiblər». O soruşdu: «Kim səni incidib?». Şikayətçi cavab verdi: «Ömər ibn Həmzə. O,

mənim kəndimi, əmlakımı və bütün mülkiyyətimi əlimdən alıb». Əl-Mənsur Ömərə əmr etdi ki, ayağa qalxaraq rəqibi ilə yanaşı durub bu məsələyə aydınlıq gətirsin. Və bu zaman Ömər belə dedi: «Ey möminlərin hökmdarı, əgər bu kəndlər ona məxsusdursa, mən heç bir mübahisəyə girmək istəmirəm. Yox, əgər mənə məxsusdursa, ona bağışlayıram. Çünki mən onunla yanaşı durub onun səviyyəsinə enmək istəmirəm. Və sizin – möminlərin hökmdarının mənə layiq gördüyü bu yüksək mövqeni nə kəndə, nə də başqa bir şeyə dəyişmək istəmirəm». Toplantıda iştirak edən bütün tanınmış insanlar onun bu hərəkətinin nəcibliyinə, ürəyinin genişliyinə heyran oldular.

Fəallıq və güclü istək bir-birinə oxşar anlayışlar olsa da, buradan hər bir insana özünəməxsus bir pay düşür; kimsə cəsarətli olur, başqa biri səxavətli, üçüncüsü qonaqpərvər, digəri bilikli, başqa birisi imanlı və nəfsinə hakim, bir başqası dindar, bu dünya nemətlərindən əl üzüb o dünya nemətləri üçün çalışan, bəziləri də var-dövlət toplamağa həvəsli... İstər səxavətlilik, var-dövlət sərf etmək və ya bəxşişlər vermək isə aşağıdakı əhvalatda göstərildiyi kimi olmalıdır.

**Əhvalat**

Belə nəql olunur ki, Yəhya ibn Xalid əl-Bərməki xəlifənin sarayından evinə atla gedərkən qapısının ağzında bir nəfərin oturduğunu görür. Yəhya ona yaxınlaşarkən ayağa qalxıb salamlaşdıqdan sonra deyir: «Ey əbu Əli, sənin malik olduğuna mənim ehtiyacım var. Allahın adı ilə sənə yalvarıram». Yəhya əmr edir ki, bu adama onun evində yer ayırsınlar, ona ən yaxşı yeməkləri və hər gün də 1000 dirhəm versinlər. Bu minvalla bir ay keçir. Bir ay sonra onun 30.000 dirhəm pulu var idi. Və o, pulları götürüb, evi tərk edir. Yəhya bunu eşitdikdə belə deyir: «And olsun Allaha ki, əgər o, ömrü boyu mənim evimdə qalsaydı, bir gün də olsun qonaqpərvərliyimdən və səxavətimdən əskik etməzdim».

**Əhvalat**

Cəfər ibn Musa əl-Hadinin gözəllikdə, ud çalıb, mahnı oxumaqda tayı-bərabəri olmayan Bədr əl-Kubra adlı kənizi var idi. Bu haqda eşidən Məhəmməd ibn Zübeydə əl-Amin Cəfərdən bu kənizi ona satmasını xahiş edir. Cəfər isə belə cavab verir: «Sən bilirsən ki, mən kəniz satmır, qul alveri etmirəm. Və əgər o, mənim evimin yaraşığı olmasaydı, düşünmədən onu sənə göndərərdim».

Bir neçə gün sonra Məhəmməd ibn Zübeydə onun evinə qonaq gəlir və onlar şərab içirlər. Cəfəri içirdib sərxoş etdikdən sonra o, Bədrini öz evinə qaçırdır. Lakin çox nəcib insan olduğu üçün ona toxunmur. Növbəti gün isə o, Cəfəri öz evinə qonaq dəvət edir. Cəfər gəldikdə ona şərab təklif edir və pərdə arxasında oturmuş kənizə çalıb-oxumağı əmr edir. Məsələdən hali olan Cəfər nəcib insan olduğu üçün özünü qətiyyən sındırmadan ona heç nə demir. Bunu görən Məhəmməd əl-Amin Cəfərin gəldiyi qayığı dirhəmlərlə doldurmağı əmr edir. Və deyirlər ki, qayığa 2000 bədr[31] və ya 20 milyon dirhəm pul qoyulanda qayıqçılar: «Qayıq bu qədər yükü götürə bilməz»,- deyirlər. Daha sonra Məhəmməd əl-Amin bu var-dövlətin Cəfərin evinə aparılmasını əmr edir.

Bax, böyük insanların əməlləri belə olur.

Aqillərdən birindən soruşublar: «Kim daha çox nailiyyət əldə etmiş adam sayılır?». O cavab verib: «Məqsədi daha ali, daha bilikli, təqlid zehinli və dünyəvi qayğılara qərq olmayanı». Və ondan yenə soruşublar: «Bəs taleyin uğursuzluğundan, ehtiyacdan qurtulmaq üçün kimə müraciət etməli?» O, belə cavab verib: «Hökmdarlara, böyük adamlara, ümumiyyətlə, o kəslərə ki, geniş ürəyi və ali məqsədləri var». Və belə deyilib ki, ya dəryaya, ya da şaha qonşu ol».

**Əhvalat**

Səid ibn Səlim əl-Bəhili belə nəql edir: «Harun ər-Rəşid dövründə mən çətin vəziyyətə düşmüşdüm: çoxlu borcum vardı və qaytara bilmirdim. Evimin qabağında borclular dayanır, arxamca gəzirdilər. Çıxış üçün yol düşünərkən bir gün Abdulla ibn Malik əl-Xəzainin yanına getdim və yol göstərməyini xahiş etdim. Və Abdulla dedi: «Səni bu bəladan, qayğı və borcdan yalnız Bərməkilər qurtara bilər».

Mən soruşdum: «Axı onların özündən razılığına, lovğalığına kim tab gətirə bilər?». O cavab verdi: «İşin düzələnə qədər yola ver».

Yəhya ibn Xalidin oğlanları – Fədl və Cəfərin yanına gedib, öz əhvalatımı danışıb, borc siyahısını onlara göstərdim. Onlar isə belə dedilər: «Qoy Allah özü sənə kömək olub, lazım olan qədər yetirsin». Mən çox dalğın, üzgün, ürəyi sınmış bir vəziyyətdə Abdulla ibn Malikin yanına qayıdaraq, onların mənə dediyini ona çatdırdım. O isə belə dedi: «Bu gün bizdə qal, görək Qadir Allah nə

[31] 1 bədr – 10 min dirhəm

edir». Mən onlarda bir saat oturmuşdum ki, birdən qulum gələrək belə dedi: «Qapımızın ağzında bir nəfər yüklü qatırlarla dayanıb deyir ki, onu Fədl və Yəhya göndərib». Abdulla dedi: «Allaha dua edirəm ki, bu sənin vəziyyətini düzəldən xəbər olsun, get gör bu, nə məsələdir». Mən ayağa qalxıb, qaçaraq evimizə tərəf getdim və məni orada gözləyən kişi belə bir məzmunda məktub verdi: «Sən bizdən ayrıldıqdan sonra mən xəlifənin yanına gedib, sənin vəziyyətini ona danışdım. O isə mənə əmr etdi ki, müsəlmanların xəzinəsindən sənə bir milyon dirhəm pul ayırım. Bunu gördükdə mən ona dedim ki, bu pullar onun borcuna gedəcək, bəs özü nə ilə yaşasın? Belə olduqda o, əmr etdi ki, əlavə 800 min dirhəm pul ayrılsın. Bunlarla bərabər, mən sənə öz pulumdan bir milyon dirhəm də göndərirəm. İndi sənin vəziyyətini yaxşılaşdırmaq üçün 2 milyon 800 min dirhəm pulun var».

**Əhvalat**

Belə nəql olunur ki, Ənuşirəvanın bir kef yoldaşı var idi. Və kef məclisi keçirilən otaqda şərab süzmək üçün bahalı daş-qaşla bəzədilmiş qızıl qədəh saxlanılırdı. Bir dəfə onun dostu bu qədəhi oğurlayır. Lakin Ənuşirəvan bundan xəbər tutur. Saqi qədəhə şərab süzmək istədikdə onu tapmır və məclisə toplaşanlara belə buyurur: «Ey burada iştirak edənlər, biz qiymətli daş-qaşla bəzədilmiş qızıl qədəhi itirmişik. O tapılmayana qədər heç kəs buranı tərk edə bilməz». Ənuşirəvan saqini yanına çağıraraq deyir: «İcazə ver, onlar bayıra çıxsın, onsuz da nə oğru onu qaytaracaq, nə də oğrunu tanıyan onu ələ verəcək».

Harada ki alicənablıq və yüksək, təmiz niyyət var, orada bərəkət və sabitlik də var. Kim ki xeyirxahlıq və səxavətlilikdən uzaqdır, deməк, onun mənəviyyatı boşdur. Mənəviyyatı boş isə nə qədər çalışsa da, öz zəifliyini gizlədə bilməz.

**Əhvalat**

Belə nəql olunur ki, bir gün Harun ər-Rəşidin Bərməkilərdən olan vəzirlərinə münasibəti soyumuşdu. Elə bu vaxt da o, Salehi yanına çağırtdıraraq deyir: «Ey Saleh, əl-Mənsurun yanına gedib, ona bildir ki, bizə on milyon dirhəm borcu var, borcu təcili qaytarsın. Gün batana kimi qaytarmasa, başını kəsib yanıma gətir». Saleh daha sonra belə deyirdi: «Və mən əl-Mənsurun yanına gedib, ər-Rəşidin ismarıcını ona çatdırdım. O isə: «Allaha and olsun

ki, mənim sonum çatıb», – deyərək and içdi ki, onun bütün var-yoxu yüz min dirhəmdən artıq ola bilməz: «Və indi mən 10 milyonu axı haradan tapım?». Saleh davam etdi: «Mən ona dedim: «Nə edəcəyini fikirləş, çünki mən sənə nə vaxt verə bilərəm, nə də xəlifənin əmrindən çıxa bilərəm»». O dedi: «Saleh, sənə yalvarıram, mənə vaxt ver ki, heç olmasa evimə gedib arvadımla, oğlumla, qızımla vidalaşım, vəsiyyətimi yazım». Mən razılaşıb, onların evinə getdim. Əl-Mənsur yaxınları ilə vidalaşarkən yalvarış, ağlamaq mənə də çox təsir etdi. Və mən ona dedim: «Bəlkə sənə Bərməkilər kömək edər? Gəl Yəhya ibn Xalidin yanına gedək». Və biz Yəhya ibn Xalidin yanına getdik. Əl-Mənsur onun qarşısında ağlayıb, sızlayırdı. Vəziyyətdən hali olan Yəhya dinməz oturub, gözlərini yerdən ayırmırdı. Daha sonra o, başını qaldıraraq xəzinədarı yanına çağırıb soruşdu: «Xəzinədə nə qədər dirhəm var?». O cavab verdi: «Beş milyon dirhəm». O, bu pulların gətirilməsini əmr etdikdən sonra oğlu Fədlə atlı göndərərək buyurdu: «Ona de ki, mənə heç zaman ziyana getməyəcək kəndləri almağı təklif ediblər. Qoy əlində olan bütün pulları mənə göndərsin». Və o, ona iki milyon dirhəm göndərdi. Yəhya oğlu Cəfərin yanına göndərdiyi adama isə dedi ki, mənim sözlərimi oğluma çatdır: «Bizim əlimizə bir iş düşüb və bunun üçün bir qədər dirhəm gərəkdir». Yəhya dedi: «Biz doqquz milyon dirhəm yığa bildik».

Əl-Mənsur dedi: «Ey mənim hökmdarım, sənin ətəyindən yapışmışam və bilirəm ki, bu pullar – sənin səxavətindir, səndən xahiş edirəm mənə borcumun qalan hissəsini də verməyə kömək edəsən». Yəhya ağlayıb, nəzərlərini yerə dikərək nökərinə dedi: «Möminlərin hökmdarı bizim kənizimiz Danairə böyük, qiymətli bir daş-qaş bağışlayıb, get onun yanına və de ki, o daş-qaşı mənə göndərsin. Nökər gedib, o daş-qaşı gətirdi. Yəhya dedi: «Mən bu daş-qaşı tacirlərdən iki yüz min dinara möminlərin hökmdarı üçün almışdım. O isə bu daş-qaşı Danair adlı ud çalan kənizə bağışlayıb. Və əgər möminlərin hökmdarı bu daşı görsə, onu tanıyacaq. İndi isə əl-Mənsurun xilas olması üçün lazım olan məbləğ toplanmışdır. Və hökmdara de ki, əl-Mənsuru bizə bağışlasın». Saleh davam etdi: «Mən pulu və daşı ər-Rəşidə apararkən yolda əl-Mənsurun dediyi bu misraları eşidərək, onun nə qədər alçaq, vicdansız, pis bir insan olduğuna əmin oldum. Bu misralar belə idi:

«Sən məni mənə olan bağlılığına görə yox,
Ovçunun oxundan qorxduğun üçün azad edirdin».

Saleh daha sonra davam etdi: «Mən ona əsəbiləşib dedim: «Yer üzündə Bərməkilər qədər yaxşı, sənin qədər pis insan yoxdur. Məhz onlar öz pulları ilə səni azad etdirib, ölümdən qurtardılar, sənə azadlıq bəxş etdilər. Sən isə onlara təşəkkür etmədin. Nəcib insana layiq olan yox, alçaqlara layiq olan söz dedin»». Daha sonra mən Harun ər-Rəşidin yanına gedərək, baş vermişləri bir-bir nəql etdim. Harun ər-Rəşid Yəhyanın səxavətli, geniş ürəkli olmasından heyrətə gəldi. Daha sonra o, Yəhyaya qiymətli daşı qaytartdıraraq belə dedi: «Bizim vaxtı ikən hədiyyə etdiyimizi bizə geri vermək düzgün deyil».

Saleh Yəhya ibn Xalidin yanına qayıtdıqdan sonra əl-Mənsurun alçaqlığı haqqında məlumat verir. Yəhya isə ona belə deyir: «Əgər bir insanı kasıblıq əzib pərişan edibsə və o, yalnız bu vəziyyətdən çıxmaq haqqında düşünürsə, onun dediklərini ürəkdən deyilənlər kimi qəbul etmə. Yəhyanın bu vəziyyətdə də əl-Mənsurun tərəfini saxlayıb, ona kömək etmək istədiyini görən Saleh ağlayaraq deyir: «Bu dünyaya nə bundan əvvəl sənin kimi adam gəlib, nə də səndən sonra sənə bənzər birisi bu dünyaya gələcək. Çox heyf ki, günlərin bir günü ölüm sənin kimi xeyirxah bir insanı torpaq altına aparacaq!»

**Əhvalat**

Belə nəql olunur ki, Yəhya ibn Xalid əl-Bərmaki ilə Abdulla ibn Malik əl-Xəzai arasında açıq şəkildə təzahür etdirmədikləri gizli bir nifaq vardı. Bu nifaqın səbəbi isə Harun ər-Rəşidin Abdullanı daha çox istəməsi idi. Yəhya və onun oğlanları isə belə söz yaymışdılar ki, Abdulla hökmdarı cadulayıb. Zaman ötdükcə bu nifaq onların qəlbində daha da böyüyürdü. Bir gün Harun ər-Rəşid Abdullanı Ərməniyyəyə canişin təyin edərək ora göndərir. Elə bu vaxt belə bir hadisə baş verir: İraqın oxumuş, ziyalı və çox tərbiyəli sakinlərindən biri bütün əmlakını əlindən çıxararaq, kasıb, çox acınacaqlı vəziyyətə düşür. O, Yəhya ibn Xalidin adından Abdulla ibn Malikə saxta məktub düzəldərək Ərməniyyəyə gedir. Abdullanın evinə yaxınlaşaraq məktubu qapıçıya verir. Qapıçı da öz növbəsində naməni Abdullaya çatdırır. Abdulla bir qədər oxuyandan sonra başa düşür ki, məktub saxtadır. Bu iraqlını yanına çağırtdıran Abdulla ona belə deyir: «Sən, yəqin, çox ağır vəziyyətə düşmüsən ki, mənim yanıma saxta məktubla gəlmisən. Narahat olma, biz sənə kömək edərik». O isə cavabında belə deyir: «Allah əmirin ömrün uzun etsin. Əgər mənim gəlişim sənin üçün çətinlik-

lər yaradıbsa, bunu elə açıq şəkildə də etiraf edə bilərsən. Allahın yaratdığı dünya çox genişdir. Lakin mənim sənə verdiyim namə saxta deyil, həqiqidir. Abdulla deyir: «Mən səninlə belə rəftar edəcəyəm; Bağdaddakı etibar etdiyim birinə məktub yazıb, sənin namənin saxta olub-olmamasını öyrənməsini buyuracağam. Əgər o, həqiqidirsə, sənə vilayətimin yarısını və ya onun əvəzinə, yüz min dirhəm, çox sayda at, dəvə, geyim verəcəyəm. Yox, əgər o saxtadırsa, əmr edəcəyəm ki, sənə 200 şallaq vurub, daha sonra saqqalını qırxsınlar». Sonra Abdulla əmr edir ki, qonağa yer ayırıb, istədiyi qulluğu göstərsinlər və belə bir məzmunda məktub yazaraq Bağdada göndərir: «Mənim yanıma Yəhya ibn Xaliddən namə çatdırmış bir nəfər gəlib. Mən bu namənin həqiqiliyinə şübhə edirəm. Sən bu məsələni aydınlaşdırıb, mənə cavab göndər».

Abdullanın göndərdiyi məktub etibar edilmiş adama çatan kimi, o, atını minib Yəhya ibn-Xalidin evinə gedir və onu yaxınlarının əhatəsində görüb, məktubu verir. Yəhya məktubu oxuyub, ona belə deyir: «Sabah gəl ki, mən sənə cavab verə bilim». Üzünü yaxınlarına tutub, onlardan soruşur: «Mənim adımdan mənim düşmənimə namə göndərən adama nə etmək lazımdır?». Yaxınlarından biri öz məsləhətini verdikdə digərləri də müxtəlif cəza növlərini və işgəncələri saymağa başladılar. Lakin Yəhya onlara belə deyir: «Siz səhv edirsiniz, sizin təklifləriniz alçaq təbiətliliyinizdəndir, sizin hamınızın Abdullanın möminlərin hökmdarı ilə yaxın münasibətindən xəbərdarsınız. Və bilirsiniz ki, bizim aramızda nifaq var. İndi isə Allah bu insanı bizi barışdırmaq üçün bir vasitə kimi göndərmişdir ki, onun köməyi ilə bu iyirmi illik nifaqa son qoyulsun. Mən bu insanın ümidini doğrultmalı və Abdullanın onu yaxşı qəbul etməsi üçün bir məktub yazmalıyam». Onun yaxınları bunu eşidən kimi, onun nəcibliyi və çox ali maraqlarına heyran olub, onun üçün dualar oxudular. Daha sonra o, kağız, mürəkkəb və digər ləvazimatlar gətizdirib, öz əli ilə Abdullaya məktub yazdı:

«Mərhəmətli və rəhmli Allahın adı ilə!

Sənin məktubun – Allah sənin ömrünü uzun etsin – mənə çatdı və mən onu oxudum. Mən sənin dürüstlüyünə çox sevindim. Axı sən elə fikirləşirdin ki, bu nəcib insan mənim adımdan saxta məktub yazmışdır. Lakin bu, sən fikirləşdiyin kimi deyil. O məktubu mən yazaraq onun vasitəsilə sənə göndərmişəm. Mən sənin səxavət və alicənablığına inanıram. İnanıram ki, sən bu insana qayğı ilə yanaşıb, onu öz rəhm və səxavətindən uzaq etməyəcək-

sən. Və ona edəcəyin hər bir əmələ görə mən sənə təşəkkür edirəm».

Sonra o, namədə ünvanı yazaraq möhürləyib, inandığı birisinə verdi. O isə məktubu Abdullaya göndərdi. Abdulla məktubu oxuyub, çox şad oldu. Və həmin iraqlını yanına çağıraraq soruşdu: «Mənim sənə təklif etdiyim iki şeydən nəyi istəyirsən?». O cavab verdi: «Bəxşiş mənim üçün daha məqbuldur». Abdulla ona iki yüz min dirhəm, beşi bəzəkli yəhərlə, beşi isə qulu olmaqla on at, içi paltarla dolu iyirmi sandıq, on atlı qul və çox sayda qiymətli daş-qaş verilməsini əmr etdi. Sonra Abdulla etibarlı bir nəfərlə onu Bağdada yola saldı. Qohumlarına baş çəkdikdən sonra o, Yəhya ibn-Xalidin qapısına gedərək içəri buraxılmasını xahiş etdi. Qapıçı Yəhyaya dedi: «Mənim ağam, qapının ağzında çoxlu qulu olan, yaxşı geyinmiş bir hörmətli adam dayanıb». Ona içəri daxil olmağa icazə verildi. O, Yəhyanın qarşısında baş əyərək, torpağı öpdü. Yəhya dedi: «Mən səni tanımıram». O cavab verdi: «Mən o kəsəm ki, zəmanənin qəddarlığı və taleyin xəyanəti ilə ölmüşdüm. Sən isə məni yenidən həyata qaytardın. Mən o kəsəm ki, sənin adından Abdulla ibn Malikə saxta məktub aparmışdım». Yəhya dedi: «O, səninlə necə rəftar etdi və nə bağışladı?». O cavab verdi: «Sənin rəhmin, himayən, qayğı və hörmətinin nəticəsində o, məni bəxşişlərə qərq edərək dövlətli etdi. Mən bütün bəxşişləri sənin ixtiyarına vermək üçün qapının ağzına gətirmişəm». Yəhya ona dedi: «Sənin mənə etdiyin mənim sənə etdiyimdən daha artıqdır. İndi mən sənin qarşında borcluyam. Çünki sən mənimlə o hörmətli insan arasındakı ədavəti dostluğa çevirdin. Bunun da səbəbkarı sənsən. Və mən sənə o, sənə verdiyi qədər ənam verirəm». Sonra o, bu kişiyə Abdullanın verdiyi qədər bəxşiş verilməsini əmr etdi.

Biz bu hadisəni ona görə verdik ki, oxucu bilsin ki, əgər insanın niyyəti alidirsə, o heç vaxt arada qalmaz. Necə ki, bu kişi arada qalmadı. Əgər o, alçaq təbiətli olub, alçaq işlərlə məşğul olsaydı, elə insanların da ən mənfurlarına rast gələrdi. Lakin onun niyyəti ali olduğu üçün çəkinmədən risqə gedərək alicənab təbiətli, nəcabətli birinə müraciət etdi. Və bunun da nəticəsində istədiyini əldə edə bildi.

Bu iki nəcib və səxavətli hökmdara, onların niyyətinin aliliyinə, bu məktub sahibinə olan münasibətlərinə diqqət et! Və məhz comərdliklərindəndir ki, onlar onu cəzalandırıb əzab vermədilər.

Və onların rəhmi ilə istədiyini əldə edib, dövrünün qəddarlıq və kasıblığından, bədbəxtçiliyindən qurtararaq evə çoxlu bəxşiş, ənam və ləyaqətlə döndü.

**Əhvalat**

Belə nəql olunur ki, Əməvilərə və Haşimilərə xidmətdə olan iki qul bir-birinin qarşısında özlərini tərifləyirdilər. Onlardan hər biri belə deyirdi: «Mənim ağalarım səninkilərdən daha səxavətlidir». Qullardan biri dedi: «Gəl gedib yoxlayaq». Əməvilərin qulu ağalarından birinin yanına gedərək, onlara ehtiyacından, əziyyətindən və kasıbçılığından şikayət etdi. O, həmin qula on min dirhəm pul verdi. Sonra o, digər ağasına da müraciət etdikdə on min dirhəm də buradan aldı. Bu minvalla o, on nəfərdən yüz min dirhəm topladı. Sonra qul o biri qula dedi: «İndi isə gəl sən get Haşimilərin səxavətini sına».

Haşimilərin qulu əl-Hüseyn ibn Əlinin (Allah ondan razı olsun) yanına gedərək, ağır vəziyyətindən, kasıbçılığından şikayət etdi. Qul sözünü qurtarmamış əl-Hüseyn ibn Əli ona yüz min dirhəm pul verdi. Sonra o, Abdulla ibn Cəfərin yanına gedərək ondan da yüz min dirhəm pul aldı. Abdulla ibn Rabiyə də ona yüz min dirhəm verdi. Və o, üç nəfərdən üç yüz min dirhəm topladı.

Bu pullarla o, Əməvilərin qulunun yanına gedərək ona dedi: «Şübhəsiz ki, sənin ağaların səxavəti mənim ağalarımdan öyrəniblər. İndi isə gəl onları pullarını geri qaytarmaqla bir daha sınayaq. Əməvilərin qulu ağalarının yanına gedərək dedi: «Mənim bu dirhəmlərə artıq ehtiyacım qalmayıb. Çünki Allah-təala başqa bir üsulla mənə kömək edib. Və mən onları sizə geri qaytarıram». Və onlardan hər biri öz dirhəmini geri götürdü.

Haşimilərin qulu da pulları götürərək, öz ağalarının yanına gedib dedi: «Mən başqa bir üsulla öz vəziyyətimi düzəldib kasıbçılıqdan qurtardım. Sizdən götürdüyüm pulları geri qaytarıram». Onlar isə belə cavab verdi: «Biz bir dəfə verdiyimizi bir daha geri almırıq. Və bəxşişlərimizi öz dövlətimizə yenidən qatmırıq. Əgər sənin onlara ehtiyacın yoxdursa, sədəqə kimi payla».

**Hikmət**

Müdriklərdən biri demişdir: «Böyük insanların hörmət hissi onların mərdliyindən və xoş xasiyyətliliklərindən irəli gəlir. İnsanlara qarşı ikrah hissi isə alçaqlıqdan və xasiyyətin eybəcərliklərin-

dən irəli gəlir. Və məqsədsiz fəaliyyət yüngültəbiətlilik, əzmli fəaliyyət isə dözüm, nəzakət, gözəllik və incəlik deməkdir. Çünki əgər bir insanın məqsədi varsa, lakin əzmkarlıq göstərmirsə, işlərinin pisləşməsindən başqa, heç nəyə nail olmayacaq. Çünki məqsəd ali, əzmkarlıq isə böyük olmalıdır. Bir nəfərin dediyi kimi: «Söhbət – həmsöhbətin ağlına, iş isə gücə görə olmalıdır».

**Əhvalat**

Əbdüləziz ibn Mərvan Misirin canişini idi. Bir gün atla gedərkən o, bir nəfərin oğlunu necə çağırdığını eşidir: «Ey Əbdüləziz!». Bunu eşidən əmir ona öz adaşının böyüdülməsinə xərclənməsi üçün on min dirhəm verilməsini əmr edir. Bu hadisə bütün ölkəyə yayıldıqdan sonra ölkədə doğulan bütün oğlan uşaqlarına Əbdüləziz adı verməyə başlayırlar.

Bunun əksinə olan bir hadisə də var: Xorasanın böyük əmirlərindən olan əl-Hacib Daş Buxara yaxınlığından keçərkən bir nəfərin öz qulunu Daş adı ilə çağırdığını eşidir və onların əmlakını müsadirə etdirir, özlərini də qətlə yetirərək deyir: «Siz mənim adıma çox sayğısız yanaşmısınız».

Və indi mərhəmətli Qureyşilər tərəfindən dirhəmlərə qərq edilən o qulun əhvalatı ilə bu əhvalatın fərqinə bax.[32]

Bu mövzu ətrafında çox danışmaq olar. Lakin biz bununla məhdudlaşdırırıq ki, kitab çox uzun və üzücü olmasın. Sən bilməlisən ki, əzmkarlıq bir qədər gec də olsa, insanı istədiyi məqsədinə çatdırır. Şair demişkən:

Əgər mən sultanın qulluğunda
Pul qazanmaq məqsədi ilə olsaydım da,
Onu boş-boşuna təriflməzdim;
Mən daha yüksək şöhrət arzusundayam.
Və əgər elm axtarışına çıxmasaydım,
Bütün istədiyim sərvətləri toplayardım.

Və hər bir insan arzusu ilə imkanlarını uzlaşdırmalıdır ki, sonra ömrünün qalan hissəsini qəmginlikdə keçirməsin. Başqa bir şair demişkən:

---

[32] Qureyş – Məkkə və onun ətrafında yaşayan qədim ərəb tayfası. Məhəmməd Peyğəmbər (s.ə.) qureyşilərdən idi.

Əgər aza qane olmusansa,
Dövrünün ən bəxtəvərisən.
Əgər həddən artıq çoxun
Arxasınca düşmüsənsə,
Bütün dünyanın neməti də
Səni qane etməz.
Sənin zəhmətinin nə faydası var,
Əgər onlar istədiyini əldə
etməyə xidmət etmirsə…

V Fəsil

# MÜDRİKLİK VƏ MÜDRİKLƏRİN DEDİKLƏRİ BARƏDƏ

Müdriklik – Allahın istədiyi adama bəxş etdiyi vergidir. Sokrat demişdir: «O kəs ki, Allahın ona müdriklik kimi böyük nemətin bəxş etdiyini bilə-bilə acgözlüyündən dünya nemətləri və var-dövlət üçün çalışır, o, sağlamlığını və xoşbəxtliyini narahatçılıq və ağır zəhmətə dəyişən birisinə bənzəyir».

Və həqiqətən, müdrikliyin töhfəsi rahatlıq və yüksək məqam, var-dövlətin töhfəsi isə yorğunluq və bədbəxtçilikdir. İbn əl-Mükəffa demişdir: «Hindistan hökmdarlarının kitabları o qədər çox idi ki, bir yerdən başqa yerə aparılanda filə yüklənirdi. Və bunu görən hökmdarlar müdriklərə bu kitabların sayını azaltmağı əmr etdilər. Və müdriklər bu kitabların sayını dörd sözə qədər azaltdılar; onlardan biri hökmdarlar üçün olan «ədalət» sözü, ikincisi, əyanlar üçün olan «itaət» sözü, üçüncüsü, qəlb üçün olan «nəfsi saxlama» sözü, dördüncü isə insan üçün olan və bədənin istəklərini saxlamağı nəzərdə tutan «nəfsə hakim» sözüdür.

### Hikmət

Müdriklərdən biri demişdir: «İnsanlar dörd cür olur. Bilən və nə bildiyini bilən insan alimdir. Onun ardınca gedin. Bilən, lakin nə bildiyini bilməyən insan unutqandır. Ona tez-tez xatırlatmaq gərəkir. Üçüncü o kəsdir ki, bilmir və nəyi bilmədiyini də bilmir. O nadandır və ondan çəkinin. Və ən nəhayət, bilməyən, lakin bilmədiyini bilən insan: bu, öyrənməyə ehtiyacı olandır. Ona düz yol göstərin».

Aqillərdən birindən soruşublar:

«Ən yaxın nədir?». O cavab verib: «Ölüm anı». Yenə soruşublar: «Bəs, ən uzaq nədir?». O cavab verib: «Ümid».

Müdrik Loğman[33] oğluna demişdir: «İki şey var ki, onları qorusan, qəm çəkməzsən: bu dünyada yaşamaq üçün dirhəm və axirət həyatına olan inam.

---

[33] Quranda adı çəkilən qədim müdrik (31:12-13, 21:16-19).

**Hikmət**

Ənuşirəvan Bəzorqmehrdən soruşub: «Nə üçün dost düşmən ola bilər, amma düşmən dosta çevrilə bilməz?». O cavab verib: «Çünki mövcud olanı dağıtmaq asandır, nəinki dağıdılmışı yenidən yaratmaq. Və bütöv şüşəni sındırmaq asandır, sınmış şüşəni isə toplayıb bütöv etmək çətin». Və o davam edib: «Dərman qəbul etməkdənsə, sağlam olmaq, tövbə etməkdənsə, günahdan uzaq düşmək, qəmi yatırmaqdansa, nəfsə hakim olmaq, qəlbin şıltaqlığına boyun əyib cəhənnəmə düşməkdənsə, imkanlı olmaq daha yaxşıdır».

**Hikmət**

Qədim müdriklərdən bir nəfər bir neçə il ərzində ölkələrə səyahət edərək insanlara altı kəlam öyrədirdi: «Kimin ki savadı yoxdur, nə bu, nə də o biri dünyada yüksəlməyəcək, kimin ki səbri yoxdur, nə dində, nə də dünyəvi işlərdə uğur qazanmayacaq», «Nadana bildiklərindən fayda gəlməz», «Kim ki mömin deyil, Allahın alicənablığından pay görməz», «Səxavətli olmayanın dövləti olmaz», «İnsanlara öyüd-nəsihət verməyənə Allah qarşısında bəraət yoxdur».

**Hikmət**

Bəzorqmehrdən soruşublar: «O, hansı cəlal, əzəmətdir ki, itaətlə bağlıdır?». O cavab verib: «Hökmdara qulluğun əzəməti, ehtiraslı hissinə bağlı olan, əzəmət və mərhəmət hissi ilə bağlı olan əzəmət».

**Hikmət**

Bəzorqmehrdən soruşublar: «Səfehlik nə ilə düzəlir?». O cavab verib: «Yalnız səfehlərə çox iş tapşırıb, ağır işdə işlətməklə ki, boş vaxtları olub başqalarının işinə müdaxilə etməsinlər». Ondan soruşublar: «Bəs alçaq insanlar necə düzəlir?». O cavab verib: «Ləyaqətsizliklərini başa salmaq üçün onlara qarşı olan hörmətsizlik və nifrətlə». Ondan soruşublar: «Bəs nəcib insanları necə cəzalandırmalı?». O cavab verib: «Onların xahişlərinə tərəddüdlə yanaşmaq». Və soruşublar: «Kimi nəcib insan saymaq olar?». O cavab verib: «Kim ki verir və nə verdiyini xatırlamır». Və soruşublar: «Nə üçün insanlar var-dövlət üstündə özlərini məhv edirlər?». O cavab verib: «Çünki onlar elə bilir ki, dünyada var-dövlətdən yaxşı heç nə yoxdur. Lakin onlar bilmirlər ki, var-dövləti lazımi yerə sərf etmək, onu yığıb saxlamaqdan daha yaxşıdır».

Və soruşublar: «Həyatdan dəyərli nədir?». O cavab verib: «İnam, ağıl və bədbəxtçilikdən qurtuluş». Ondan yenə soruşublar: «Biliyin, cəsarətin və səxavətin yaraşığı nədir?». O cavab verib: «Biliyin yaraşığı həqiqət, səxavətin yaraşığı sevinc, cəsarətin yaraşığı isə imkan daxilində rəhm edib bağışlamaqdır».

Vəzir Yunan deyirdi: «Dörd şey ən böyük bədbəxtçilik sayılır: «Böyük ailə, pula ehtiyac, pis qonşu, abırsız və həyasız arvad»».

Və belə qəbul olunub ki, iyirmi beş cür dünyəvi əməl var. Onlardan beşi Allahın qisməti ilə olur: arvad almaq, uşaq, dövlət, mülk sahibi olub ömür yaşamaq; beşi insan tərəfindən zəhmətlə əldə edilir: bilik, xəttatlıq, cəmiyyətdəki zadəgan mövqeyi, Cəhənnəmdən qurtarıb Cənnətə daxil olmaq. Beşi isə təbiətdən gəlir: ləyaqət, insanlarla münasibət yaratmaq bacarığı, təvazökarlıq, alicənablıq və dürüstlük. Beşi vərdişdir: yerimək, yemək, içmək, böyrəkləri və bağırsaqları təmizləmək. Beşi nəsildən keçir: gözəllik, xoşxasiyyət, niyyətin aliliyi, qürur və alçaqlıq.

Və deyirlər ki, ağıllı insanlar üç şeyi unutmamalıdır: bu dünyanın faniliyini, zəmanənin dəyişkənliyini və taleyin sınağını.

Belə deyilir ki, altı şey bütün dünyaya bərabərdir: dadlı yemək, sağlam uşaq, yaxşı dost, rəhmli hökmdar, səlist nitq və mükəmməl ağıl.

**Hikmət**

Ət-Tirmizi əl-Hakim demişdir: «Beş şey bədbəxtlikdir: parlaq günəş altında yanan lampa, şoranlıqda yağan yağış, kor adamın gözəl arvadı, tox adama verilən ləziz yeməklər və qəddar adamın ürəyində Allah kəlamı».

İskəndərdən soruşublar: «Nə üçün sən müəllimini atandan çox qiymətləndirirsən?». Və o cavab verib: «Çünki həyata gəlməyimin səbəbkarı atam, əbədi həyatımın səbəbkarı isə müəllimimdir». Və deyib: «Əgər bir hadisə Allahın əmri ilədirsə və onun həlli qadağandırsa, o işin düzəlməsindən əl çəkən tərifə layiqdir». Və o deyib: «Əgər zəmanə səninlə istədiyin kimi ayaqlaşmırsa, onunla onun istədiyi kimi ayaqlaş». Və insan zəmanənin qulu və zəmanə insanın düşmənidir. Və hər nəfəslə insan bu dünyadan uzaqlaşıb ölümə yaxınlaşır.

**Hikmət**

Bir neçə canişin Bəzorqmehrə belə bir xahişlə müraciət etmişdi: «Bizə müdriklik çeşməsindən bir müdriklik ver ki, bədənimizə və ruhumuza bundan fayda gəlsin. Biz onun üçün çalışaq, bizə ziyan olandan isə uzaqlaşaq». Və o dedi: «Bilin ki, dörd şey gözə işıq gətirib onu yaxşılaşdırır və dördü isə gözlərdəki işığı azaldır. Dörd şey bədəni inkişaf etdirib cavan saxlayır, dördü isə onu zəiflədərək qocaldır. Dörd şey ürəyi sağlam edir, dördü isə öldürür.

Gözə işıq gətirən dörd şey – göyərti, axar su, təmiz torpaq və sevimli insanların üzünə baxmaqdır. Onu zəiflədən isə duzlu yemək, başı isti su ilə yumaq, günəş altında çox qalmaq və düşmənə baxmaq. Bədəni inkişaf etdirib cavan saxlayan dörd şey isə rahat geyim, əqlin bəd düşüncələrdən azad olması, xoş ətir və isti yerdə yatmaqdır. Onu zəiflədən isə xörəyə qurudulmuş ətin vurulması, narahat paltar geymək, ayaq yolunda çox qalmaq və həddən artıq eyş-işrətlə məşğul olmaqdır. Bədəni sağaldan dörd şey – vaxtında xörək yemək, hər şeyin həddini bilmək, ağır işlə məşğul olmamaq və səbəbsiz yerə bədbinliyə düşməməkdir. Bədəni məhv edən dörd şey isə çətin keçilən yolla yerimək, kəhkir atda yol getmək, yorulana qədər yol getmək və qoca qadınlarla eyş-işrət. Ürəyə həyat verən dörd şey isə həyati bilgilər, bilikli müəllim, sadiq yoldaş, sənə hər zaman kömək etməyə hazır olan xoş arvad və dostdur. Onu məhv edən dörd şey isə soyuq, səmum[34] istisi, boğucu tüstü və nəs rəqəmlərdən qorxudur».

Və müdrik Sokrat demişdir: «İnsan beş şey ilə özünü məhv edir: dostlarını aldadaraq, alimlərdən üz döndərərək, özü özünə nifrət edərək, layiq olmayan insanın «mərdliyinə» dözərək və arzu və istəklərinə əməl edərək.

Abokrat[35] demişdir: «Beş şeydən heç vaxt doyulmur: göz – baxışdan, qadın – kişidən, qulaq – xəbərdən, atəş – odundan və alim bilikdən».

**Hikmət**

Müdriklərdən birindən soruşmuşlar: «Bu dünyada ən acı və ən şirin nədir?». O cavab verib: «Ən acı ləyaqətsiz insandan eşidilən kobud söz, ağır borc və kasıblıq. Ən şirin isə uşaq, xoş söz və ehtiyacsızlıq».

---

[34] Şimali Afrikada, Ərəbistan yarımadasının səhralarında isti külək

[35] Qədim yunan təbibi (c.ə.460-370)

Və aqillərdən birindən soruşmuşlar: «Ölüm nədir? Və yuxu nədir?». O cavab verib: «Yuxu yüngül ölüm, ölüm isə dərin yuxudur».

Və aqillərdən birindən soruşmuşlar: «Var-dövlət nədir?». O cavab verib: «Aza qane olub razı qalmaq».

Və ondan soruşmuşlar: «Sevgi nədir?». O cavab verib: «Qəlbin xəstəliyi və qəmginlikdə ölüm».

**Hikmət**

Aristoteldən soruşublar: «Ən etibarlı dost hansıdır? Və ən qayğıkeş dost hansıdır?». O cavab verib: «Nəcib dost etibarlı, köhnə dost isə rəhmlidir».

**Hikmət**

Calinus demişdir: «Unutqanlığın 7 səbəbi var: kobud sözlər dinləmək, xirtdəkdən qan gəlmək, durğun suya sidik buraxmaq, turş qida yemək, ölümün üzünə baxmaq, çox yatmaq və xarabazarlığa tamaşa etmək. Və o, ədviyya kitabında demişdir: «Şübhəsiz ki, yaddaşın zəifləməsinin 7 səbəbi vardır: bəlğəm, bərk gülüş, duzlu və yağlı yemək, həddən artıq eyş-işrət, insanı taqətdən salan yuxusuzluq, bütün soyuq və çiy yeməklər. Çünki onlardan istifadə yaddaşı zəiflədir».

**Hikmət**

Müdrik Əbu əl-Qasim demişdir: «Bu dünyadakı qarışıqlıq üç nəfərdən başlayır: xəbəri gətirəndən, xəbəri dinləmək istəyəndən və xəbəri alandan». Və bu üç nəfər hər zaman məzəmmətlə üzləşir».

Və o demişdir: «Üç şey var ki, başqa bir üç şeylə birləşmir: buyurulan yeməklə arzu olunan, rəhmlə qəzəb və boşboğazlıqla həqiqətdə deyilən».

**Hikmət**

Müdrik Bəzorqmehr öyrədir ki, əgər abdallardan biri olmaq istəyirsənsə, xasiyyətini uşaq xasiyyətinə dəyiş. Ondan soruşublar: «Necə?». O cavab verib: «Uşaqlardakı beş xasiyyət əgər böyüklərdə olsa, onlar abdala çevrilərlər, yəni onlar yaşamaq üçün vəsait axtarmırlar; xəstələndikdə həmd olmuş Yaradana müraciət etmirlər; bir yerdə yeyirlər; dalaşdıqda da bir-birinə qarşı nifrət bəslə-

məyib tez barışmağa çalışırlar; aldatdıqda isə kiçicik hədə ilə qorxur və gözləri yaşla dolur».

**Hikmət**

Vəhb ibn-Münəbbih demişdir: «Torada belə dörd fikir var: əgər alim mömin deyilsə, o, oğruya bənzəyir. Hər bir ağıldan kəm insan heyvana bənzəyir. Öz bədəninə dinclik verməyən dövlətli isə muzdlu fəhləyə bənzəyir. Və dövlətlinin qarşısında onun vardövlətinə görə alçalan kasıb itə bənzəyir».

**Hikmət**

Aqillərdən biri demişdir: «Başçılığın əvvəli mərhəmət, günahın əvvəli tələskənlik, alçalmanın əvvəli isə acgözlükdür».

Ət-Tirmizm əl-Hakim demişdir: «İnsan öz qəlbinin əsiri olmamalı və heç kəsin qabağına keçməməlidir, yəni yaxşının və pisin həddini bilməlidir. Və o yalnız müdrikləri dinləməklə kifayətlənməməli, eyni zamanda müdrikliyi qarşısına məqsəd qoymayanların da sözünə qulaq asmalıdır».

**Hikmət**

Əl-Əhnəf ibn Qeys deyirdi: «Səbirsizin dostu, yalançının etibarı, paxılın rahatlığı, alçağın sevgisi və pis xasiyyətlinin hakimiyyəti olmur.

Zu-r-Riasateyn belə nəql edirdi: «Bir-biri ilə mübahisə edən rəqiblərdən biri İskəndərə şikayət edir. O cavab verir: «Onun haqqında dediyin sözləri mən bu şərtlə dinləyərəm ki, onun da sənin haqqında olan sözlərini ayrılıqda dinləyim. Sən bununla razısan?». Bundan qorxuya düşən adam fikrindən dönür. Bunu görən İskəndər deyir: «Başqalarını suçlamaqdan çəkinin ki, pis insanlara tuş gəlməyəsiniz.

**Hikmət**

Bəzorqmehr demişdir: «Dörd cür uğur var: dini uğur, bədənin uğuru, maddi uğur və ailə uğuru. Dini uğur üç şeydən asılıdır: arzulara uymamaq, şəriətin qanunlarına əməl etmək və heç kimin paxıllığını çəkməmək. Bədənin uğuru da üç şeydən asılıdır: lazım olan miqdarda yemək, az danışmaq və az yatmaq. Maddi rifah da üç şeydən asılıdır: işlərin görülməsində diqqətli olmaq, əmanətə xəyanət etməmək və borc ödəmək, lazım gəldikdə əmlakın bir

hissəsindən də keçmək. Ailənin uğuru da üç şeydən asılıdır: aza qane olmaq, bir-birinə mehriban olmaq və Qadir Allaha ibadətə əməl etmək».

Hatimə əl-Əsamədən soruşublar: «Nə üçün bizdə keçmişdəkilərin malik olduqları yoxdur?». O cavab verib: «Çünki sizin yanınızdan beş şey yan keçib: öyüd verən müəllim, dost, daimi zəhmət, halal qazanc və uğurlu zaman».

Hədislərdə deyilir ki, Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Ey Əli! Üzünü, qulağını və ürəyini mənə çevir. Ud, gizlət, sıxıl, ehtiyatlı və əzmkar ol». Əli soruşub: «Bu sözlərin mənası nədir?». O cavab verib: «Ey Əli, qəzəbini ud, qardaşının qüsurunu gizlət, dar və qaranlıq qəbir üçün sıxıl, ehtiyatlı ol ki, qardaşına qarşı haqsızlıq etməyəsən. Və Allahın dininə əzmkarlıq göstər».

**Hikmət**

Bir nəfər aqildən xahiş edib: «Mənə öyüd ver». O deyib: «Onun məhkəməsini gözlə, onun razılığını axtar və onun cəzasından özünü gözlə».

**Hikmət**

Müdriklərdən birindən soruşublar: «İnsanlarda daha çox nə var?». O cavab verib: «Sözün hərfi mənasında olmayan həddənziyadəlik və qənaətcillik. Hərçənd ki, həddənziyadəliklə ehtiyac yox olmur. Və qul kasıblıqdan başqa, bir şeyi arzulayır – onu heç kəs arzulamır. Çünki bütün insanlar var-dövlətə can atır. Və heç kim qəmginliyi arzulamır. Çünki hamı xoşbəxtliyə can atır. Və heç kəs ölümü arzulamır, çünki hamı həyatı sevir».

Müdrik Əbu əl-Qasim demişdir: «Bəndənin ölümünün iki səbəbi var: sözə baxmamaq və öz fikrinə fanatikcəsinə bağlı olmaq».

O həm də demişdir: «Bəlanın üç səbəbi var: düzgün yola yönəltməyən amillər, səfeh oxucular və paxıl xalq».

Və deyilmişdir: «Xəbisdən dostluq, alçaqdan etibar gözləmə». Əl-Hakim demişdir: «İndi iki şey arzuolunmazdır: borc və kasıblıq» və «dörd qanuna əməl etsən, əsl insanlardan biri olarsan: birincisi, sirrin elə olmalıdır ki, insanlar xəbər tutanda sən qürur duyasan. İkincisi, sənin əməlin elə olmalıdır ki, insanlar sənin kimi etdikdə bundan xeyir görəsən. Üçüncüsü, insanlardan necə münasibət gözləyirsənsə, onlara qarşı da elə münasibət göstər. Dördüncüsü, insanlardan gözlədiyin rəftarı onlara qarşı et».

**Hikmət**

Əl-Hakim demişdir: «Bu üç növ insanlara belə bax: kasıblara yuxarıdan aşağı yox, sadə, dövlətlilərə paxıllıqla yox, ibrətamiz və qadınlara şəhvətlə yox, iltifatla».

**Hikmət**

Vəhb ibn Münəbbih demişdir: «Torada oxumuşam ki, üç cür günah var: özündən razılıq, tamahkarlıq və paxıllıq. Onların da beş mənbəyi var: yeməyin miqdarını bilməmək, həddən ziyadə yatıb bədəni dincəltmək, dünyəvi həyata bağlılıq və insanların tərifi». Və o demişdir: «Və kim bu üç şeydən azad olsa, Cənnətə düşəcək: şöhrət üçün xeyriyyəçilikdən, yaşamaq üçün vəsait istəməkdən və başqasını məzəmmət etməkdən. Bu cür insan yaxşılıq etdikdə minnət qoymur. O, özünü bir parça çörəklə təmin etmək üçün insanlardan daha az asılı olur. Və kimdəsə qüsur gördükdə onu məzəmmət etmir».

**Hikmət**

Belə nəql olunur ki, İbn əl-Kariyyə günlərin bir günü o dövrün ən böyük fərasətli və ağıllı adamı olan ibn Yusif əl-Həcacın yanına gedir və əl-Həccac ondan soruşur: «İmansızlıq nədir?». O cavab verir: «Mərhəmətə qarşı nankorluq və rəhm ümidini itirmə». O soruşur: «Bəs razılıq nədir?». O cavab verir: «Qadir Allahın qərarı ilə kifayətlənib çətinliklərə dözmək». Əl-Həccac soruşur: «Bəs dözüm nədir?». O cavab verir: «Əsəbi yatırıb və ürəyindən keçəni saxlaya bilmək». O soruşur: «Xeyirxahlıq nədir?». O cavab verir: «İmkan daxilində mərhəmət göstərmək və qəzəbə cavab verməmək». O soruşur: «Alicənablıq nədir?». O cavab verir: «Dostu qorumaq və öhdəlikləri yerinə yetirmək». Əl-Həccac soruşur: «Aza qane olmaq nədir?». O cavab verir: «Aclığa dözmək və əlavə libasının olmaması». O soruşur: «Var-dövlət nədir?». O cavab verir: «Azı çox və çoxu az saymaq». O soruşur: «Yaşamaq üçün vəsait əldə etmək nədir?». O cavab verir: «Bir çox şeyi az üsulla əldə etmək». O soruşur: «Təkəbbürlük nədir?». O cavab verir: «Özündən əskiyi saymamaq». O soruşur: «Cəsarət nədir?». O cavab verir: «Düşmənlə, kafirlərlə açıq döyüş, geri çəkilmək əvəzinə, dözümlülük». O soruşur: «Ağıl nədir?» O cavab verir: «Danışıqda səmimilik və insanlarda özünə qarşı razılıq hissi oyatmaq». O soruşur: «İnsaf nədir?». O cavab ve-

rir: «Arzulardan imtina, düzgün düşüncə və həyat tərzi». O soruşur: «Ədalət nədir?». O cavab verir: «İnsanlar arasındakı şikayətləri qərəzsiz həll etmək». O soruşur: «Alçaldılma nədir?». O cavab verir: «Ehtiyacdan yaranan xəstəlik və yaşamaq üçün vəsaitin azlığından yaranan itaət». O soruşur: «Acgözlük nədir?». O cavab verir: «Arzuların hərisliyi». O soruşur: «Etibarlılıq nədir?». O cavab verir: «Boyun olduğunu yerinə yetirmək». O soruşur: «Satqınlıq nədir?». O cavab verir: «Gücün olduğu zaman zəiflik göstərmək». O soruşur: «Anlamaq nədir?». O cavab verir: «Düşünmək və şeylərin həqiqi mənasını dərk etmək».

**Hikmət**

İnsanı alçaldan səkkiz əməl var: çağırılmadığı masa arxasında əyləşmək, ev yiyəsi ilə hökmlə danışmaq, düşmənindən səxavət gözləmək, dəvət edilmədiyi halda, iki nəfərin söhbətini dinləmək, hökmdarın və özündən yüksək hər kəsin qarşısında alçalmaq, səni dinləməyənlə söhbət etməyə çalışmaq və layiq olmayanla dostluq etmək.

**Hikmət**

Bəzorqmehrdən soruşublar: «İnsanda ən iyrənc hansı xüsusiyyətdir?». O cavab verib: «İnsanın özünü öyməsi. Çünki heç vaxt xəsis təriflənmir, qəddar sevilmir, ağıllı xəsis, səxavətli paxıl, özündən razı bədbin, səbirsizin isə dostu olmur». Aqil belə buyurmuşdur: «Beş nəfər beş şeydə sevinir, sonra məyus olur: əlindən nəyi isə buraxan tənbəl, qardaşlarından ayrıldıqdan sonra bəla ilə rastlaşan, düşmənləri üzərində qələbə imkanını əldən buraxıb, ondan istifadə etməyən, zalım arvadı ilə bədbəxt yaşayıb, əvvəlki xeyirxah arvadını xatırlayan və işlətdiyi günahdan peşimançılıq çəkən əməlisaleh adam».

**Hikmət**

Bəzorqmehrdən soruşurlar: «Var-dövlət alim insanın qəlbini dəyişə bilərmi?». O cavab verir: «Kimin ki qəlbi var-dövlətdən dəyişir, demək, o, alim deyil». Əl-Hakim demişdir: «Açıq qınaq gizli kindən yaxşıdır». Bəzorqmehr demişdir: «Dünyada qəmli və kədərli üç insan var: sevgilisindən ayrılan sevən, övladını itirmiş canıyanan valideyn və müflisləşmiş dövlətli».

**Hikmət**

Əl-Hakim demişdir: «Beş nəfər üçün var-dövlət onlara özlərindən və həyatlarından daha əzizdir; mükafat üçün müharibə aparan, arx və quyu qazan, ticarəti dəniz yolu ilə edən, yalın əllə ilan tutan ovsunçu və bəhsə zəhər içən».

**Hikmət**

Əmr ibn Madi Kirb deyirdi: «Xoş söz qayadan da möhkəm ürəyi yumşaldır, kobud söz isə ipəkdən də yumşaq ürəyi sərtləşdirir». Əl-Hakim demişdir: «Kədər ruhun xəstəliyidir. Necə ki ağrı bədənin xəstəliyidir. Və sevinc ruha qidadır. Necə ki xörək bədənə qidadır».

Bir müdrik bir nəfərdən bir dinar pul istədikdə, o etiraz edir. Və müdrik deyir: «Sənin etirazın məni utandırıb üzümü bircə dəfə qızartmaqdan başqa, mənə heç bir təsir etmədi. Lakin əgər sən bu dinarı mənə versəydin, mənim üzüm sənin nəinki bir, hətta min xahişindən də saralmazdı».

**Hikmət**

Müdriklərdən biri demişdir: «Nəm torpağa toxum səpməzlər». Və o deyib: «Kimin ki ağlı və qüruru yoxdur, o, bəhərsiz ağacdır», «Zülm qılıncını çəkən bu qılıncla da öldürüləcək. Özündən ədalət tələb etməyən peşimançılıqdan yaxa qurtarmayacaq. Bəxşişli əl uzadanın üzü işıqlı olar», «Günahdan qorxmayan onun çirkabına batar», «Gənclik ağılsızlığın bacısı, qocalıq isə hörmət və rahatlığın rəfiqəsidir» və «Ehtiyat topla, öz ehtiyatından başqalarına da ver və rəqiblərindən qorxma».

**Öyüd**

Müdrik Loğman buyurmuşdur: «Yol gedərkən keçə geyinmiş birini görüb, ondan soruşdum: «Ey insan, sən kimsən?». O cavab verdi: «İnsan». Mən soruşdum: «Adın nədir?». O cavab verdi: «Dayan bir, özümü adlandırmaq üçün düşünüm». Mən soruşdum: «Nə ilə məşğul olursan?». O cavab verdi: «Özümü əzabdan qoruyuram». Mən soruşdum: «Nə ilə qidalanırsan?». O cavab verdi: «O, məni nə ilə yedirib-içirsə, onunla da qidalanıram. Mən soruşdum: «O, səni haradan qidalandırır?». O cavab verdi: «Haradan istəsə». Mən dedim: «Sənə xeyir və xoşbəxtlik arzulayıram». O ca-

vab verdi: «Bəs sənə bu xeyir və xoşbəxtliyi əldə etməyə kim mane olur ki?».

**Hikmət**

Əl-Hakim deyirdi: «Üç şey ürəkdəki kədəri aparır: alimlərlə ünsiyyət, vəzifəni yerinə yetirmək və sevdiyin insanın üzünə baxmaq», «İki şey ürəyə qəmginlik gətirir: xəsislərdən səxavət gözləmək və alçaq təbiətli insanlarla zarafat etmək» və «Dörd şeydən uzaq ol ki, onun dörd acı nəticəsi ilə üzləşməyəsən: paxıllıqdan uzaq olsan- kədərlə üzləşməzsən, yaramaz insana yaxın oturmasan- məzəmmətlə qarşılaşmazsan, günah etməsən – Cəhənnəmə düşməzsən, var-dövlət dalınca qaçmasan – insanların nifrətinə tuş gəlməzsən. Əgər sən Allahın qəzəbinə tuş gələcək əyləncəyə görə alçalırsansa, nə xasiyyətcə, nə səviyyəcə, nə də ağılla itdən fərqlənmirsən. Tfu! Belə mənə bənzərlərə!»

O demişdir: «Dörd əməl var ki, məzəmmət edilib, bu, o biri dünyada da cəzasız qalmayacaq: birincisi, qeybətdir, zira deyilmişdir ki, qeybət tez yetişən atlıdır, ikincisi, alimlərə qarşı hörmətsizlik, zira kim alimlərə qarşı hörmətsizlik etsə, nifrətə layiq olar. Üçüncüsü, Qadir və Böyük Allahın rəhminə naşükürlük etmək, dördüncüsü, bir insanı günahsız öldürmək. Bu barədə keçmişin böyük insanlarının belə bir atalar sözü var: «Hər bir qatil nə vaxtsa öldürüləcək».

Şair demişkən:

Yolda bir nəfərin öldürüldüyünü
görən İsa kədərli halda soruşdu:
«Səni nə üçün öldürüblər?»
Sən öldürülmüsən, lakin sənin qatilin də
ölümü dadacaqdır.
Əgər sənə öldürmək üçün qaldırılmış
Əli saxlamaq imkanı verilsə,
Bu imkandan istifadə et!

VI Fəsil

# AĞILIN VƏ AĞILLI İNSANLARIN DƏYƏRİ HAQQINDA

Bil ki, Qadir Allah ağlı mükəmməl olaraq yaradıb, ona demişdir: «Yaxınlaş» – və yaxınlaşmışdır. Sonra ona demişdir: «Uzaqlaş» – və o uzaqlaşmışdır. Və Allah deyib: «Qüdrətimə və böyüklüyümə and olsun ki, səndən əzəmətli heç nə yaratmamışam. Sənin köməyinlə Mən alıram, sənin köməyinlə Mən verirəm, sənin köməyinlə Mən məhkəmə qururam və sənin köməyinlə mən cəzalandırıram». Və bunun həqiqiliyinə sübut olaraq, Qadir Allahın bəndələri üçün yaratdığı iki şeyi göstərmək olar: itaət və qadağa. Və onların hər ikisi Allahın sözü ilə bizə göndərilmiş vəhydə deyildiyi kimi, ağıldan asılıdır: *«Ağıl sahibləri, Allahdan qorxun!» (Quran, 5:100).* «Ağıl sahibləri ağıla malik olanlardır». Və «Ağıl» sözü «ikal» (qandal, zəncir) sözündən yaranmışdır. («Məkil» - divarlarının möhtəşəmliyi, tikintisinin mükəmməlliyinə görə heç kəs tərəfindən alına bilməyən dağ başında olan qaladır.)

**Hikmət**

Fars müdrikindən soruşmuşlar: «Ağıllını nə üçün ağıllı adlandırıblar?». O cavab verib: «Çünki onu tanıdan yeddi xüsusiyyəti var. O, onu incidəni bağışlayır. O, özündən aşağıda olanla sadə davranıb, özündən yuxarıda olana yaxşılıq etməyə çalışır və hər zaman Allahını xatırlayır. O yalnız bildiyini deyir. O, vaxtında deyilmiş sözün xeyrini anlayır. Çətinliyə düşəndə Qüdrətli və Böyük Allahı çağırır. Nadanın da öz xüsusiyyətləri var. O, insanlarla qəddar olub onları incidir. Özündən aşağı olanları sıxışdırır. Rəhbərlərlə özündən razı davranır. Bilmədiyini deyib, lazım olanda susur. Və çətinliyə düşəndə özünü məhv edir. Xeyir iş görəndə üzünü ondan çevirir.

**Hikmət**

Səid ibn Cabir demişdir: «Mən insan üçün ağıldan gözəl geyim görməmişəm. İnsan sarsılsa, ağıl onu düzəldər; əgər o yıxılsa, ağıl onu qaldırar; əgər insan alçaldılsa, ağıl onu yüksəldər; əgər

uçuruma düşsə, ağıl onu oradan çıxarıb xilas edər; əgər kasıb olsa, ağıl onu dövlətli edər». Və natiqə ilk öncə lazım olan bizə çatan bu əhvalatda göstərildiyi kimi, ağıl və bilikdir.

**Əhvalat**

Belə deyilir ki, Abbasilərdə bütün elmlərdən xali olan əl-Məmun kimi ikinci bir xəlifə yox idi. Və o, həftədə iki günü hüquqşünaslarla söhbətdə keçirirdi. Onun məclislərində hüquqşünaslar, alim-natiqlər toplaşırdı. Bir gün onun məclisinə nimdaş geyimli qəribə bir kişi daxil olur: o, arxa cərgədə hüquqşünasların arxasında ən adi yerdə əyləşir. Mübahisə vaxtı isə irəli sürülən suallar orada iştirak edənlərin hər birinə ünvanlanırdı. Və hər kəs məsələ ilə bağlı öz fikrini bildirməkdə sərbəst idi. Bu kişi növbəti suala bütün hüquqşünaslardan daha yaxşı cavab verir. Onu tərifləyən əl-Məmun onun daha yaxşı yerdə oturdulmasını əmr edir. O, ikinci sualı birincidən daha da gözəl cavablandırır. Əl-Məmun onun ön sıraya keçirilməsini əmr edir. Onun üçüncü suala daha gözəl və dürüst cavab verdiyini görən əl-Məmun onu yanında əyləşdirir. Söhbət bitdikdən sonra su gətirirlər. Onlar əllərini yuduqdan sonra isə yemək təklif olunur. Hamı yedikdən sonra hüquqşünaslar çıxıb gedirlər. Əl-Məmun bu kişini yanına çağıraraq, onunla yaxşı rəftar edib mükafatlandıracağını bildirir.

Sonra əl-Məmun qonaqları ziyafətə dəvət edir. Yaxın kef yoldaşları gəldikdən sonra ortaya şərab gətirilir və növbə ilə içməyə başlayırlar. Növbə bu adama çatanda, o ayağa qalxıb deyir: «Əgər möminlərin hökmdarı icazə versə, mən bir söz demək istərdim». Əl-Məmun deyir: «Nə istəyirsənsə, de». O deyir: «Böyük hökmdar, Allah sizdən razı olsun, adınızı daha da ucaltsın. Allah bilir ki, bu bəndə bu gün ali bir məclisdə ən cahil və qaba insanların arasında iştirak edirdi. Və möminlərin hökmdarı bu bəndənin nümayiş etdirdiyi kiçik bir ağılı yüksək dəyərləndirərək, onu şərəfləndirib mərifətləndirdi. Və bəndə arzularında yaşatmadığı bir səviyyəyə qalxdı. İndi isə əgər o, bu şərabı içsə, onun kiçik ağlı da ondan uzaqlaşacaq və o, əvvəlki kimi rəzil və yazıq vəziyyətinə qayıdıb insanların gözündə alçalacaq. Bu səbəbdən əgər sizin ali həzrətləriniz onu bu mükafatdan məhrum etmək istəmirsə, qoyun sizin səxavətiniz onun üzərində bir qədər də davam etsin». Bunu eşidən əl-Məmun onu yanında əyləşdirərək, təşəkkür edib şərəfləndirdi. Və ona yüz min dirhəm və bahalı bəzədilmiş at bağışlan-

masını əmr etdi. Və o, hər tədbirdə onun yerini bir qədər də yüksəldərək hamıdan hörmətli səviyyəyə çatdırdı.

Biz bu əhvalatı ağılın öz sahibini nə qədər yüksək səviyyəyə qaldırdığını göstərmək üçün verdik. Şübhəsiz, kobudluq, qanacaqsızlıq insanı ən yüksək səviyyədən də ən aşağı mərhələyə sala bilər.

**Əhvalat**

Belə nəql olunur ki, bir dəfə bir şəxs xəlifə Əbu Davanik əl-Mənsurun qapısının ağzına gələrək, qapıçıya deyib: «Möminlərin hökmdarına de ki, qapıda Suriyadan gəlmiş Asim dayanıb. Və o, xatırlamalıdır ki, əvvəllər möminlərin hökmdarı ilə mənim aramda təhsil alarkən bir illik dostluq qurulmuşdu. İndi isə o gəlib ki, imamla[36] salamlaşıb, dostluğu davam etdirsin». Qapıçı hökmdara bu haqda məlumat verdikdə o, ziyarətçinin yanına gəlməsinə izn verir. O, içəri daxil olarkən xəlifə Əbu Davanik bu ziyarətçinin pis tərbiyəsini və ağlının azlığını xatırlayıb, bir qədər sıxıntı keçirdi. Və onu yanında əyləşdirib soruşdu: «Nə üçün gəlmisən?». O cavab verdi: «Köhnə dostluqdan istifadə edib möminlərin hökmdarına baş çəkməyə». Xəlifə ona min dirhəm verilməsini əmr etdi və o, pulu götürüb getdi.

O, bir də bir il sonra yenidən geri qayıtdı. Bu zaman əl-Mənsurun oğlu vəfat etmişdi. Və o, başsağlığı qəbul edirdi. Bu adam xəlifəni salamladıqdan sonra onun üçün dualar etdi. Xəlifə ondan soruşdu: «Nə üçün gəlmisən?». O cavab verdi: «Mən o şəxsəm ki, səninlə Suriyada bir yerdə təhsil almışam. İndi isə sənə başsağlığı verib, borcumu ödəməyə gəlmişəm». Və xəlifə ona beş yüz dirhəm verilməsni əmr etdi. Əbu Davanik[37] çox xəsis idi. Və Abbasilərdə onun qədər xəsis olmadığı üçün bu ad ona qoyulmuşdu.

Bu adam bir il sonra yenidən qayıtdı. Lakin şəxsən xəlifənin qəbuluna düşməyə bəhanəsi yox idi. Bu səbəbdən o, bütün ziyarətçilərlə birlikdə xəlifənin yanına gedərək onu salamladı. Xəlifə soruşdu: «Nə səbəbdən yenə yanıma gəlmisən?». O cavab verdi: «Mən o şəxsəm ki, səninlə birlikdə Suriyada təhsil almışam. Və bizə elə bir dua öyrətmişdilər ki, onu hər hansı bir xahişlə oxuduqda Qadir Allah onu yerinə yetirirdi. Bu duanı itirdiyimdən mö-

---

[36] Ərəb xilafətinin rəhbərləri yalnız siyasi hakim deyil, eyni zamanda müsəlman dini icmasının da rəhbəri olub, imam adını daşıyırdılar.

[37] «Davanik» – «danik» (xırda pul) sözünün cəm halıdır: «dannaka» feli xəsislik etmək deməkdir.

minlərin hökmdarının yanına gəlmişəm ki, bu duanın üzünü yenidən saxlayım». Əl-Mənsur dedi: «Özünü bu duanın axtarışı ilə yorma, çünki o, eşidilməyən duadır. Mən bu duanı üç il oxumuşam ki, Allah məni səndən, sənin kimi baş ağrısından qurtarsın. Amma faydası olmayıb. Əgər o dua eşidilən dualardan olsaydı, mən səndən qurtulardım». Və bu sözləri eşidən adam utanıb xəcalət çəkdi.

Biz bu əhvalatla göstərmək istədik ki, hətta təhsilli adamın da ləyaqəti və mövqeyi ağılsızlığından alçala bilər.

**Əhvalat**

Elə həmin bu dövrdə xəlifə əl-Mənsurun dostlarından biri köhnə dostluğa güvənərək Rəsulun, ona Allahın xeyir-duası və salamı olsun, şəhəri olan Məkkədən ona təşrif gətirir. Bu adam ağıllı və arif olsa da, savadsız idi. Əl-Mənsur onu görən kimi saraya dəvət edib hörmətlə qarşılayır. Və bu adam deyir: «Ey möminlərin hökmdarı, mən səni çox sevirəm və Allaha olan dualarım səmimi olsa da, hökmdarın qulluğuna yaramıram. Mənə de, səni necə ziyarət edim ki, ürəyini sıxıb, tərbiyəsiz görsənməyim?» Əl-Mənsur belə dedi: «Elə et ki, sənin hər gəlişinin arasında müəyyən zaman olsun; nə az, nə çox. Mən nə səndən yorulum, nə də səni unudum. Belə olsa, mənim sənə bağlılığım daha da artar. Yanıma gəldikdə məndən kənar otur ki, gözətçi səni mənə tədricən yaxın buraxsın, həddən çox oturub özünü tərbiyəsiz göstərmə. Və mənim ürəyimi sıxmamaq üçün xahişimin barəsində danışma. Əgər səni mükafatlandırsam, olduğun hər yerdə məni elə təriflə ki, bu mənə çatdıqda təşəkküründən sevinib, sənə daha çox xeyirxahlıq edim. Və keçmişdə aramızda baş verənləri heç yerdə xatırlama». Bu məsləhətlərə qulaq asan adam ildə iki dəfə xəlifənin yanına gəlirdi. Əl-Mənsur da hər dəfə ona 1000 dirhəm bəxşiş verirdi.

Bu əhvalat ona görə verildi ki, heç də alim olmayan ağıllı adamın ağlının ona düzgün istiqamət verməsi aydın olsun. Kimin savadı var, ağlı yoxdursa, onun bütün işləri bərbaddır. Kimin ki həm ağlı, həm savadı olub, onlar ya peyğəmbər, ya müdrik insan, ya da rəhbər olmuşlar. Və insanların gözəlliyi, böyüklüyü, qüruru və işlərinin düzgünlüyü dünyəvi həyatı üçün ağılın, xasiyyətinin bütövlüyü, kamilliyi isə axirət həyatı üçün yol göstəricisidir.

Şair demişkən:

Ağılla insan aya qədər ucala,
Yüksək mövqe və hörmət qazana bilər.
Və ağıl eyib və günahları poza bilər.

Ağıl – dinin, imanın başlanğıcı, ortası və sonudur. Keçmiş müdriklərdən bəziləri demişdir: «Ağıllı o kəs deyil ki, çətin vəziyyətdə uçurumdan çıxış yolu axtarır. Ağıllı o kəsdir ki, çətin vəziyyətə düşməmək üçün yol axtarır».

**Hikmət**

Hökmdar Abraviz oğluna demişdir: «Öz rəiyyətini qoru ki, ağıl da səni qorusun. Qamçını rəiyyətdən uzaq et ki, ağıl da öz qamçısını səndən uzaq etsin. Və bil ki, sən insanların hakimi, ağıl isə sənin hakimindir. İnsanlar sənin əmrinə tabe olduqları kimi, sən də ağlın əmrinə tabe olmalısan».

**Hikmət**

Vəzir Yunan ədalətli Ənuşirəvana ağıl, onun əmrlərinə tabe olmağın vacibliyi barədə məktub göndərir. Ona təşəkkür edən Ənuşirəvan belə bir məzmunda cavab məktubu yazdırır: «Ey müdrik, sən ağıl barədə çox gözəl sözlər yazmısan. Çünki biz və bizdən əvvəlki hökmdarlar özünə ağılla bəzək vurub onun itaətindən çıxmamışıq. Və ağıllı insan – Allaha ən yaxın insandır. Ağıl – yaxşı işlərin başlanğıcı olan bir günəşdir. Ağıl – bütün insanlarda gözəldir, hökmdar və rəhbərlərdə isə daha gözəldir. İnsanın ağlı ağaca verilən sudur, çünki ağac sulu olduqda o, öz ətri, çiçəkləri, kölgəsi, bəhəri ilə insanları sevindirir, gəzinti vaxtı şənləndirir.

Ağacın suyu çəkilsə, onun təravəti də itər. Belə ağac isə kəsilib yandırılmaqdan başqa, heç nəyə yaramır.

Və insan da belədir; nə qədər ki, onun güclü ağlı, sağlam bədəni var, onun bugünü və gələcəyi xoşbəxt və faydalı olacaqdır. Və əgər onun ağlı dumanlanıb, nadanlıq ona hakim kəsilsə, ölümdən başqa, heç nə onu bu biabırçılıqdan qurtara bilməz.

Mən ağılı tərif etdiyim vaxt onun əmrindən çıxa bilmərəm. İstər rəiyyət, istərsə də hökmdar üçün öz işığı ilə pisi yaxşıdan, gözəlliyi eybəcərlikdən, həqiqəti yalandan, haqqı nahaqdan ayıran ağıldan yaxşı heç nə yoxdur».

Bəzorqmehr demişdir: «İnsanlarda yalnız iki şey kamil ola bilər: ağıl və cəsarət».

**Hikmət**

Müdrik Loğman demişdir: «İnsanın nə qədər savadlı olmasına baxmayaraq, əgər onun savadı ağlını müşayiət etmirsə, o, bundan heç bir fayda görməyəcəkdir».

**Hikmət**

Ənuşirəvan Bəzorqmehrdən soruşub: «Ən ağıllı adam kimi görmək istərdin?». O cavab verib: «Mənimlə müharibə aparan düşmənimi». O soruşub: «Niyə?». O cavab verib: «O, mənə pislik etməsin deyə». Ağıldan başqa, hər şeyin çoxluğu insana ziyandır. Yalnız ağıl çox olduqca öz sahibinin ləyaqətini artırır.

**Hikmət**

Və Bəzorqmehrdən soruşublar: «İnsana ən vacib lazım olan nədir?». O cavab verib: «Ağıl». Və ondan soruşublar: «Ağıl nə qədər olmalıdır?». O cavab verib: «Heç kimdə tam halda mövcud olmayan şeyin həcmini necə bilmək olar?».

Müdriklərdən biri demişdir: «Hamının ağıla, ağılın isə təcrübəyə ehtiyacı var. Ağıldan qiymətli var-dövlət, nadanlıq kimi də kasıblıq yoxdur. İnsanın savadı artdıqca savada olan ehtiyacı da çoxalır. Ağılsız alim böyük sürüsü olan zəif çobana oxşayır».

Alimlər deyiblər: «Ağıl ordusu olan hökmdardır. Onun ordusu isə sağlam fikir, yaddaş, düşüncə və anlamaqdır. Qəlbin sevinci ağıldan gəlir. Çünki bədənin dözümlülüyü ağılla bağlıdır. Qəlb çıraq, onun işığı isə ağıldır. Bu işıq daha sonra bütün bədənə yayılır. Ağıllı insan onu kədərləndirə biləcək bir şey etmədiyi üçün qəmə batmır. Və layiq olmayan hadisələrə çox da fikir vermir».

**Hikmət**

Abdulla ibn Mübarəkdən soruşurlar: «Nə daha yaxşıdır; ağıl, yoxsa tərbiyə?». O cavab verir: «Ağıl – bilik əldə etmə, biliyə uyğun fəaliyyət, nə etməli olduğunun bilgisidir. Və nəyi isə bilib edirsənsə, bu, ağıldır».

**Hikmət**

İbn Abbasdan soruşurlar: «Daha yaxşı nədir; ağıl, yoxsa tərbiyə?». O cavab verir: «Ağıl. Çünki ağıl Allah vergisi, tərbiyə isə Allah bəndəsinin özünün qazancıdır».

**Hikmət**

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Allah öz bəndələrinə ağıldan yaxşı heç nə verməyib. Nadanın ibadətindənsə, ağıllının yuxusu daha yaxşıdır. Və oruc tut-

mayan ağıllı, oruc tutan nadandan daha üstün və ağıllının gülüşü nadanın göz yaşından daha yaxşıdır».

**Hikmət**

Bir nəfər Əklidasa demişdir: «Ya sən sakitləşəcəksən, ya da mən səni məhv edəcəyəm». O cavab verib: «Mən sənin qəlbini qəddarlıqdan təmizləyənə kimi sakitləşməyəcəyəm».

Əl-Hakim demişdir: «Ölüdən pis iy gəldiyi kimi, nadandan da onun özünə və ətrafındakılara ziyan verən kobud sərsəmlər yayılır».

**Hikmət**

Müdriklərdən birindən soruşublar: «Ağıl nədir?». O cavab verib: «Ağıl – iyirmi üç şeyi bir-birindən ayıran bənddir. Əgər bu bənd olmasaydı, yaxşı pisə qarışardı. O, ilk növbədə təkallahlılığı allahsızlıqdan, dini dinsizlikdən, ehtiyatlılığı tədbirsizlikdən, səxavəti xəsislikdən, gözəlliyi eybəcərlikdən, mütiliyi qürurdan, dostluğu düşmənçilikdən, tərifi tənqiddən, biliyi nadanlıqdan, sadəliyi abırsızlıqdan, həqiqəti yalandan, yüngüllüyü ağırtəbiətlilikdən, işığı qaranlıqdan, ləyaqəti alçalmadan, itaəti itaətsizlikdən, zikri qaflətdən (Allahı unutmaq), yaxşı məsləhəti paxıllıqdan, sünnəni bidətdən, rəhmi qəddarlıqdan, Allaha qurban verilməni qayğısızlıqdan, inancı şübhədən, müdrikliyi səfehlikdən ayırır».

Bu kitabın müəllifi demişdir: «İnsanın ləyaqəti ağlı ilə bağlıdır və bütün bilik və işlər aşağıdakı hadisədə göstərildiyi kimi, ağıla əsaslanır.

**Əhvalat**

Belə nəql olunur ki, bir dəfə külək Süleyman peyğəmbəri taxtı ilə bərabər göylərə qaldıraraq, bir şəhərin üstündən keçirir. O, küləyə onu yerə endirməsini əmr edir. Peyğəmbər şəhər qapılarının üstündə belə bir yazı görür: «Bir günlük çalışqanlığın dəyəri bir dirhəm, gözəllik və cazibədarlığın bir günlük dəyəri 100 dinar, bir saatlıq elmin dəyəri isə qiymətsizdir».

Və hər şey bilgidən asılıdır. Bilgi insanın fikrinin əsiri, fikir isə ağılın ekiz qardaşıdır. Və Allahın ağıl verdiyi hər kəs bundan fayda görəcəkdir.

Şair demişkən:

Əgər sən nəsil-nəcabətli
Və ya Yusif kimi gözəlsənsə də,
Əzizim, ağlını çalış itirmə.

İnsanlar arasında yalnız nöqsanlılar gözü kölgəli dəyərsizdirlər.

Və sən, ey qardaşım, ağılın mahiyyətini, dəyərini və ləyaqətini bilməlisən. Və sən, ey ağıl sahibi! Bu ağılı sənə verən o Ulu Yaradana təşəkkür etməlisən. Qoy onun qüdrəti daim yüksəlsin.

VII Fəsil
# QADINLARIN XÜSUSİYYƏTİ VƏ ONLARDAKI XEYİRLƏ ŞƏRİN XATIRLANMASI

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Ən yaxşı və nəcib qadın – gözəl, çox doğa bilən və az başlıq tələb edəndir».

Və o, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Sizin üçün ən yaxşı azad qadındır (hürrə[38]) . Çünki o daha təmiz və nəcib olur».

Ömər ibn əl-Xəttab demişdir: «Qadir Allahdan qadın zülmünə hədəf olmamağı diləyin və onları seçərkən diqqətli olun».

Kim ki iman və nəciblik axtarışındadır və hələ də sevəcəyi gözəl qadını tapmayıb, ona dindar arvad lazımdır. Çünki imanı olan daha yaxşı və nəcibdir. İman olan yerdə var-dövlət də olar. İmansız arvaddan heç bir fayda və bərəkət gəlməz.

**Əhvalat**

Mərv şəhərinin böyüyü və hakimi Nuh ibn Məryəmin çoxlu var-dövləti, gözəl və yaxşı bir qızı var idi. Onun qızını şəhərin çox dövlətli və tanınmış adamları istəsə də, qızı kimə verəcəyini hələ müəyyən etməmişdi. O, belə düşünürdü ki, əgər qızımı buna versəm, filankəsin acığı gələr. Onun çoxlu meyvə ağacı olan gözəl bir bağı və Mübarək adlı hindli bir qulu var idi. Bir gün o, qula deyir: «İstəyirəm gedib bağımı qoruyasan». Qul bağa gedərək iki ay onu qoruyur. Günlərin bir günü o, bağına gedərək quluna deyir: «Mənə bir salxım üzüm ver». Qul ona bir salxım üzüm verir. Lakin üzüm turş olur. Ağa ona deyir: «Mənə başqasını ver». Lakin qulun ona verdiyi ikinci salxım da turş çıxır. Ağa ondan soruşur: «Nə üçün sən mənə ancaq turş üzümləri yığıb verirsən?». Qul cavab verir: «Çünki mən bilmirəm şirin haradadır, turş harada». Ağa təəccüblə soruşur: «Ay Allah, sən burada iki ay yaşamısan və bilmirsən ki, turş üzüm haradadır, şirin harada?». O cavab verir: «Allaha and olsun ki, mən üzümdən dadmadığım üçün harada şirin, harada turş

[38] Hürrə – kəniz olmayan azad qadın

olduğunu da bilmirəm». Onun ağası soruşur: «Nə üçün ondan dadmamısan?». Qul cavab verir: «Çünki sən bu bağı qorumağı tapşırmısan, nəyinsə dadına baxmağı yox. Mən isə heç vaxt səni aldatmamışam». Qulun bu hərəkətindən heyrətə gələn hakim deyir: «Qoy Qadir Allah özü sənin bu dürüstlüyünü hifz etsin».

Hakim başa düşür ki, bu gənc çox ağıllıdır və ona deyir: «Ey gənc, mənim səndən xoşum gəldi. Və mən istəyirəm ki, sən mənim bütün əmrlərimi yerinə yetirəsən». Mübarək cavab verir: «Mən Allaha və sənə tabeyəm». Hakim ona deyir: «Bil ki, mənim çox gözəl bir qızım var. Və bir çox dövlətli və tanınmış adamlar ona elçi düşüb. Lakin qızı kimə ərə verəcəyimi bilmirəm. Sən bu barədə nə fikirləşirsən?». Qul belə cavab verir: «Cahiliyyə dövründə bütpərəstlər əsil-nəcabətə, yəhudi və xristianlar gözəlliyə fikir verirdilər. Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, dönəmində insanlar iman və həqiqət, indi isə var-dövlət axtarırlar. Bu dördündən sən daha çox hansını istəyirsən?». Və hakim ona deyir: «Ey gənc, mən iman və həqiqəti seçərək qızımı sənə vermək istəyirəm. Çünki mən səndə imanı, həqiqəti, dürüstlüyü və dindarlığı görmüşəm». Qul cavab verir: «Ey sahibim, mən satlıq qara hindli qulam, sən qızını mənə verib necə razı qala bilərsən, axı məni pulla almısan». Və hakim ona deyir: «Gəl evə gedib bu işi həll edək».

Evə çatdıqda hakim arvadına deyir: «Bil ki, bu hindli gənc dindar və əməlisalehdir. Onun dürüstlüyü mənim çox xoşuma gəlir. Və mən qızımızı ona vermək istəyirəm. Bu haqda nə fikirləşirsən?». O cavab verir: «Məsləhət sənindir, lakin qoy mən gedib bu barədə qızdan soruşub, cavabını sənə çatdırım». Qızın yanına gələn ana atasının ismarıcını ona deyir. Qız isə belə cavab verir: «Siz mənə nə desəniz, mən də onu edərəm. Və nə Allahın, nə də sizin itaətinizdən çıxıb ürəyinizi sıxmaram». Və qızını Mübarəkə ərə verən hakim onlara çoxlu var-dövlət də verir. Onların Abdulla adında bir övladları olur. O, bütün dünyada Abdulla ibn Mübarək adı ilə tanınan və dünya var olduqca danışdığı hadisələri dildən-dilə gəzəcək dindar bir alimdir.

Ey qardaşım! Və əgər sən evlənmək istəyirsənsə, adı, sanı, dövləti olanı yox, dini, imanı olanını axtar. Çünki qadın bu var-dövləti sənə verməyib, sənə qarşı istifadə edəcək. Və əgər sən arvad axtarırsansa, onu arzularını həyata keçirmək üçün axtarma. Elə birisini axtar ki, dindar və dürüst olsun, səndən qorxub sözündən çıxmasın və Cəhənnəmdən qurtarmasına kömək etsin.

**Əhvalat**

Günlərin birində Abdulla ibn Mübarəkin evinə on alim qonaq gəlir və onun evində qonaqları yedizdirmək üçün heç nə olmur. Onun yalnız bir atı var idi ki, o, bir il həmin atla ziyarətə getmiş, ikinci il isə din uğrunda müharibə etmişdi. O, həmin atı kəsib ətindən qonaqlara yemək bişirtdirir. Bunu görən arvadı ona deyir: «Sənin bu atdan başqa, heç nəyin yox idi, bəs niyə onu kəsdin?». Onda Abdulla ibn Mübarək tez evə girib, oradan arvadına düşən başlıq qədər əşyanı bayıra çıxarıb, o saat və o dəqiqə arvadını boşayır. O deyir: «Qonağı sevməyən arvad mənə lazım deyil». Bu hadisədən bir neçə gün keçəndən sonra onun yanına bir nəfər gəlib deyir: «Ey müsəlmanların imamı, mənim bir qızım var, anasını itirib və hər gün ağlayaraq dərddən-qüssədən bütün paltarlarını cırır, bu gün isə o, sənin yanına gəlmək istəyir. Səndən xahiş edirəm bir söz de ki, onun qəlbini ovundura bilsin. O, minbərə çıxan zaman qızın ürəyini sakitləşdirə biləcək nə isə deyir. Və qız evə dönəndə atasına belə deyir: «Ata, mən səhvimi anladım, bir daha Qadir Allahı qəzəbləndirmərəm, amma mənim səndən bir xahişim var». Atası soruşur: «O, nə xahişdir?». Qız cavab verir: «Sən mənə hər zaman deyirsən ki, dünyanın varlı və adlı-sanlı oğlanları mənə elçi düşüb, səndən istəyirlər. Səni Allahın adına and verirəm, məni onlardan heç birinə vermə. Yalnız Abdulla ibn Mübarəkə ver, ona görə ki, o da bizim kimi imanlıdır».

Və atası onu Abdulla ibn Mübarəkə ərə verib, onlara çoxlu cehiz, var-dövlət, on ədəd yaxşı çapar at verir ki, o, Allah yolunda müharibə etsin. Bir gecə Abdulla yuxuda Allahı görür. Və Qadir Allah ona deyir: «Sən bizim yolumuzda öz qoca arvadını boşadın, əvəzində biz sənə cavan qız bəxş etdik. Və əgər ki, sən öz qonaqların üçün yeganə atını kəsdinsə, biz onun əvəzində sənə on at bəxş etdik. Bil və agah ol ki, hər kim ki bizə bir yaxşılıq edir – biz ona on qat əvəz veririk. Və bizə xeyirxahlıq edənləri mıkafatlandırırıq. Hələ bizə xeyirxahlıq edənlərdən heç kim ziyan görməyib və görməyəcək». Bu barədə növbəti əhvalatda xəbər verilir.

**Əhvalat**

Əbu Səid nəql edirdi ki, İsrail xalqı olan yəhudilərin zamanında bir mömin kişi vardı. Onun çox dindar, əməlisaleh, dərrakəli və hər şeyin yerini bilən bir arvadı var idi. Və Qadir Allah o zamanın peyğəmbərinə belə vəhy göndərir: «O mömin bəndəyə de ki,

Mən belə məsləhət bilmişəm; o, ömrünün yarısını kasıbçılıqla, yarısını isə var-dövlət içində firavan keçirəcək. Və əgər o, cavanlıqda varlı olmaq istəyirsə, Biz onu varlandıraq. Yox, əgər qocalıqda varlanıb, firavan yaşamaq istəyirsə, Biz onun istədiyini yerinə yetirərik».

Bunu eşidən kişi arvadına çatdıraraq deyir: «Mənə Qadir Allahdan göstəriş gəlib» və eşitdiklərini ona danışaraq soruşur: «Bəs bu haqda nə fikirləşirsən?». O cavab verir: «Özün seç». Kişi deyir: «Mənə elə gəlir ki, cavanlıqda kasıbçılığı seçmək daha yaxşıdır. Çünki gənc ikən kasıbçılığa dözmək daha asandır. Yaşlaşıb dövlətli olduqda isə mənim rahat həyatım olacaq və Allaha ibadətlə məşğul ola biləcəyəm». Qadın deyir: «Ey mənim ərim, əgər biz cavanlıqda kasıb olsaq, Allaha lazım olan ibadəti edə bilməyəcəyik və bizim əlimiz xeyir işlərə yaramayacaq, zikr edə bilməyəcəyik. Sən cavanlıqda dövləti seçməlisən ki, biz dövlət, gənclik və ibadətdən uzaq düşməyək. Belə olduqda biz Ona bədənimizlə və əmlakımızla ibadət edə bilərik».[39] Kişi deyir: «Bu daha yaxşı fikirdir. Və biz belə də edərik».[40]

Bu zaman peyğəmbərə yeni vəhy gəlir: «O adama de: «Deməli, sən Bizə ibadəti hər şeydən üstün hesab etdin və sənin və arvadının niyyəti üst-üstə düşdü. Və Mən qərar verdim ki, sən bütün həyatını rahat və dövlətli keçirəsən. Elə isə arvadınla Mənə bundan sonra da itaət edin. Və Mən sizə nə qədər versəm, siz də ondan zəkat paylayın ki, axirətdə də işləriniz yaxşı olsun»». Biz bu əhvalatı ona görə verdik ki, biləsiniz; kimin ki mömin arvadı var, onun həm bu, həm də o biri dünyada işləri yaxşı gedəcək. İbn-Abbas belə nəql etmişdir: «Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, Umm Salamın evinə gəlib görür ki, o, səhər namazını qıldıqdan sonra oturub Allahı zikr edir. O soruşur: «Ey Umm Salam, nə üçün sən başqaları ilə birlikdə namaz qılmırsan? Və nə üçün sən cümə namazlarına gəlmirsən? Və nə üçün müqəddəs yerləri ziyarət etmirsən? Və nə üçün müqəddəs müharibə aparmırsan? Və nə üçün Quran oxumursan?». O cavab verir: «Ey Allahın Rəsulu! Bütün bunlar kişi işidir». Və o deyir: «Qadınlar üçün də onlara uyğun və bunlara bərabər işlər var». O soruşur: «O hansı işlərdir ki, bunlara bərabər hesab olunur?». O cavab verir: «Əgər qadın Allahın buyurduqlarını

---

[39] Bibliya dövrü

[40] «Doğrusu, iman gətirib hicrət edənlər, Allah yolunda malları və canları ilə cihad edənlər və mühacirlərə kömək edənlər- onlar bir-birinin dostudurlar» (Quran, 8:72).

edib, ərinin sözünə qulaq asıb və millə paltar toxusa, bu, təsbeh cütləyərək Allahı zikr etməyə bərabərdir. Mil onun əlində olduğu müddətdə o, başqaları ilə birlikdə namaz qılan kimi sayılır. Əgər uşaqları üçün yemək bişirirsə, ağacdan yarpaq tökülən kimi onun da üzərindən günahları götürülür. Və qadının bir saat paltar toxuması bir körpünün və ya məhəllənin tikilməsinə bərabərdir. Onun milinin səsi isə evinin divarlarını uca edir. Üç səs Allaha yetişir: bunlardan biri Allah uğrunda müqəddəs müharibəyə gedənlərin yayının səsidir, ikincisi, alimin qələminin səsi, üçüncü isə qadınların işlətdiyi cəhrənin səsi».

Əl-Əhnəf ibn Qeys demişdir: «Əgər siz istəyirsinizsə, qadınlar sizi sevsin, onlarla yaxşı rəftar edin». Möminlərin hökmdarı xəlifə Ömər ibn əl-Xəttab, Allah ondan razı olsun, demişdir: «Qadınlara məhəbbət sözləri deməyin – ürəklərini korlayarsınız, çünki bütün qadınlar səhrada sürü kimidir; onların Allahdan başqa qoruyucusu yoxdur». Əl-Mahirə demişdir: «Mən vaxtımı qadınlarla keçirərək üç şeylə məşğul olmuşam: cavanlıqda eyş-işrətlə, yaşlaşanda zarafat və yaxşı rəftarla, qocalıqda isə var-dövlətimi paylamaqla. Çox sayda kəniz toplamaq isə tərifə layiq iş deyil. Və mən onların haqqını yalnız yataqda ödəyə bilmişəm».

Süleymandan bizə çatıb ki, Allahın Rəsulundan, ona Allahın xeyir-duası və salamı olsun, soruşmuşlar: «Qadınlardan ən yaxşısı hansıdır?». O cavab verib: «Kim ki ərinin əmrlərini yerinə yetirir». Və yenə soruşmuşlar: «Bəs ən pisi kimdir?». Deyib: «Əri ilə sözləşib, ona rahatlıq verməyən».

**Əhvalat**

Bir müdrik qızlara xəttatlıq öyrədən müəllimin yanına gəlib deyir: «Sən yamanlığa pislik öyrədirsən?». Deyirlər ki, bir-birilə məsləhətləşən iki qadının yanından keçən müdrik demişdir: «Biri o birindən zəhər borc alan ilanlara baxın».

Bir ağıllı qadından soruşublar: «Qadının əxlaqı nədir?». O deyib: «Bəs kişinin qüsuru nədir?». Ona cavab veriblər: «Xəsislik və qorxaqlıq». O deyib: «Məhz bu da qadının əxlaqıdır».

Bir müdrik çox alçaqboylu bir qadını alır. Ondan soruşublar: «Nə üçün sən əməlli, boylu-buxunlu qadın almırsan?». O cavab verib: «Qadın yamanlıqdır, o, nə qədər az olsa, bir o qədər yaxşıdır».

**Hikmət**

Müdrikl ərdən biri demişdir: «Dörd cür qadın və arvad olur: bütünlüklə ərinə məxsus qadın; yalnız yarısı ərinə məxsüs qadın; üçdə biri ərinə məxsus qadın və ərinə düşmən kəsilən qadın».

*İzah:* Tam olaraq ərinə məxsus qadın bakirə olan gənc qızdır. Yarısı ərinə məxsus olan qadın isə ərindən boşanıb, lakin yenidən onunla barışıb nigah bağlayan qadındır. Üçdə biri ərinə məxsus qadın isə əri ölüb, qucağı uşaqlı olan qadındır. Ərinə düşmən kəsilən qadın isə qucağı uşaqlı, ərindən boşanıb başqasına ərə gedən, lakin könlü birinci ərində qalan arvaddır. Bil ki, ən yaxşı arvad – gənc qızdır.

Deyilir ki, Həvva Allahın əmrindən çıxdığı üçün O, qadınlara bir çox cəzalar vermişdir: uşaq dünyaya gətirmək, ata və anasından ayrı düşmək, ixtiyarının əlində olmaması, onun payına düşən mirasın az olması, özbaşına bilməməsi, əri dörd arvad aldığı halda, onun yalnız birinə ərə getməsi, evdən yalnız mehrlisinin nəzarəti ilə bayıra çıxa bilməsi, iki qadının şahidliyinin bir kişinin şahidliyinə bərabər olması, başını örtməsi, kişi kimi cümə, bayram və ölü namazını qıla bilməyib, müqəddəs müharibə aparmaması, hakim və hökmdar ola bilməməsi, hər əxlaqsız qadının Qiyamət günü günahkarlar üçün nəzərdə tutulmuş bütün əzabların yarısına bərabər cəzaya tuş gəlməsi, onun əri öldükdə dörd ay on gün müddətdə yas saxlaması, boşandıqdan yalnız üç ay sonra ərə gedə bilməsi, İlahi mükafatdan yalnız mində birinin onlara, qalanının isə kişilərə pay düşməsi. Və bütün bunlar qadınlara verilən cəzalardır.

**Qadınların davranışı və vərdişləri haqqında**

Bil ki, qadınlar on cür olur. Və onların hər birinin davranışı müxtəlif heyvanları xatırladır. Biri donuza, ikincisi meymuna, üçüncüsü itə, dördüncüsü ilana, beşinicisi eşşəyə, altıncısı əqrəbə, yeddincisi siçana, səkkizincisi quşa, doqquzuncusu tülküyə və onuncusu qoyuna bənzəyir.

Bunun izahı isə belədir; donuz kimi davranan qadın o qadındır ki, qarnını yeməklə doldurub, qab-qaşıq sındırmaqdan başqa, heç nə bilmir. O heç düşünmür ki, orucsuz, namazsız və imansız hara gedir. O, ölüm, mükafat və cəza haqqında düşünməyib Qadir Allahın mükafatını və qəzəbini unudur. Uşaqların qayğısına qalıb onları tərbiyələndirmir. Quran və elm öyrətmir. Çirkli paltarda gəzir və ondan pis iy gəlir.

Meymun kimi davranan qadın isə yalnız qırmızı, sarı və yaşıl, parlaq paltarlar geyib, gümüş, qızıl, daş-qaşla özünə bəzək vu-

raraq rəfiqələrinin qarşısında əda göstərir və bu yolla ərinin gözündə ucalmağa çalışır. Amma ola bilsin ki, onun həqiqi mövqeyi bunun tam əksini ifadə edir.

Xasiyyəti it kimi olan qadınlar isə əri bir şey deyən kimi, onun üstünə atılaraq, mübahisə edib qışqır-bağır salır. Lakin gördükdə ki, ərinin pul kisəsi qızıl və gümüşlə doludur, evdə buğda, meyvə və hər şey var, o, ərinə yanaşaraq ona deyir: «Mən səndən ötrü canımı verərəm. Allah səndən razı olsun! Sənin uğrunda ölümə getməyə hazıram». Vəziyyət əksinə olduqda isə o, ərinin üstünə it kimi atılaraq, onu kasıbçılıqda suçlayır. Təhqir edib alçaltdıqdan sonra isə evdən qovur. Və bir gün də olsun susmur.

İlana bənzəyən isə ərinə xoş söz deməsinə baxmayaraq, qəlbində tamamilə əksini gəzdirir. Və ərində yaxşı heç bir şey görmür. O bir ilan kimi incədir. Yavaş sancır və insana əzab verir.

Eşşəyə bənzəyən eşşək kimi tərsdir. Əgər o, körpünün üstündə dayansa, nə qədər döysən də, yerindən tərpənməz. O, hər zaman öz fikrində qalıb özündən razı olur.

Əqrəb kimi olan isə şər və qeybətlə qonşuların evini gəzib, onları daha sonra yamanlamaq üçün dinləyir. O, əqrəb kimi araya nifaq salıb harada olmasından asılı olmayaraq və Allahdan qorxmayıb neştəri ilə sancır.

Allahın Rəsulu onlar haqqında demişdir: «Qeybət edən Cənnətə girməyəcək».

Siçana bənzəyən isə ərinin pul kisəsini açıb, götürdüyü pulları qonşuda gizlədən oğrudur.

Quşa bənzətdiyimiz isə bütün günü hərəkətdə olub, istirahət etməyən qadındır. Beləleri öz ərinə deyir: «Hara gedirsən? Bilirəm ki, mən sənə lazım deyiləm, sən başqasını sevirsən, sən mənimlə bədbəxtsən və sadəcə, mənə yazığın gəlir».

Tülküyə bənzəyən isə ərini evdən qovur. Və hər dəfə əri evə gələndə onu gözümçıxdıya salır. O, yatıb özünü xəstəliyə vurur və əri evə girdikdə ona belə deyir: «Sən məni evdə tək, xəstə qoyub getmisən».

Qoyun xasiyyətli qadın isə nəcib qadındır. O, qoyun kimi mülayim olur. O, hər şeydə xeyir və bərəkət axtarır. O, dindardır. Ərinə, qonşusuna, uşaqlarına və evdəki hər kəsə qayğı göstərir. Bu qadında çoxlu yaxşılıqlar var. Və o, Qadir Allaha etiqad edir.

Bil ki, qadının imanı və ağlı Allah tərəfindən verilmiş vergidir. Və kimsə çətin ki, əməlisaleh qadını yolundan çıxarsın. Növbəti əhvalat bu haqdadır.

**Əhvalat**

Belə nəql olunur ki, bir nəfər əxlaqsız adam tərbiyəli bir qadını günah yoluna çəkmək istəyir. O, qadına deyir: «Get və evin bütün qapılarını ört. Diqqət et ki, qapılar kip örtülsün. Qadın gedir və qayıtdıqdan sonra deyir: «Mən bir qapıdan başqa, bütün qapıları kip bağladım». O soruşur: «Bu, hansı qapıdır?». Qadın cavab verir: «Yaradılanlarla aramızda olan qapıları örtdüm, lakin bizimlə Qüdrətinə həmd olmuş Yaradan arasındakı qapını örtə bilmədim. Və o, açıq qaldı». Bu sözlər kişinin ürəyinə qorxu salır və o, səmimi qəlbdən Allahı qarşısında tövbələr edir. Daha sonra isə öz günahkar niyyətindən əl çəkərək Allaha itaətə dönür.

**Əhvalat**

Belə deyirlər ki, bir gün Səmərqənddə evinin qarşısında dayanan şiənin yanından gözəl və cazibədar bir qadın keçirdi. Bu vaxt küçədə bir kəsin olmadığını görən şiə təcavüz etmək məqsədi ilə qadının qolundan tutub evinə çəkdi. Qadın yalvararaq dedi: «Mən istəyirəm ki, bircə sualıma cavab verəsən. Sonra nə edirsən et». Kişi soruşdu: «De görüm nə istəyirsən?». Qadın dedi: «Əgər indi sən mənə təcavüz etsən, mən hamilə olub, səndən uşaq dünyaya gətirəcəyəm. Bəs bu uşaq şiə olacaq, yoxsa axmaq və alçaq bir insan?». O cavab verdi: «Şübhəsiz ki, o, şiə olacaq». Qadın dedi: «Sən şiələrin ən əclafısan. Belə olmasaydı, sən bu cür pis fikrə də düşməzdin». Xəcalət çəkən şiə elə o andaca əlini qadından çəkir. Və Allah qarşısında söz verir ki, o, halal olmayan qadınlara pis niyyətlə baxmayacaq.

Və kişi öz arvadına qarşı qısqanc olub, onu yad gözdən qorumalıdır. Çünki dində də göstərilir ki, yad kişi qadının ayaq səsini də eşitməməlidir. Və əgər yad kişi qapını döyürsə, qadın ona incə və nazik səslə cavab verməməlidir. Çünki kişinin qəlbi ən adi şeylərə də meyl sala bilir. Və əgər qadın cavab verməlidirsə, o, əli ilə ağzını tutub, elə cavab verməlidir ki, onun səsi qoca arvadın səsindən fərqlənməsin.

Və qadın da yad kişilərə baxmamalıdır – əgər bu kişi kor olsa belə. Çünki bir hədisdə deyilir ki, Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, Aişənin (Allah ondan razı olsun) evinə gələrkən görür ki, Abdulla ibn Umm-Gülsüm qadınlarla bir yerdə oturub. O deyir: «Ey Aişə! Qadına yad kişilərlə birlikdə oturmaq olmaz!». O, cavabında deyir: «Ey Allahın Rəsulu! Axı o,

kordur». Və onda Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, deyir: «O, səni görməsə də, axı sən onu görürsən».

**Əhvalat**

Belə nəql olunur ki, əl-Həsən əl-Bəsri (Allahın rəhmi onun üzərindən əskik olmasın) dostları ilə birlikdə Rabiyə əl-Ədaviyyəyə baş çəkməyə gedir. Və onlar qapının ağzına çatanda deyirlər: «İcazə verərsən içəri keçək?». O cavab verir: «Bir qədər gözləyin». Daha sonra o, bürüncəyini götürərək onlarla özü arasında pərdə düzəldəndən sonra içəri keçməyə icazə verir. Onlar içəri keçərək Raviyə əl-Ədaviyyəyə salam verirlər. O, pərdənin arxasından onların salamına cavab verir. Ziyarətçilər soruşurlar: «Bu pərdəni aramızda niyə asmısan?». O cavab verir: *«Allah özü belə əmr etmişdir: «Onlardan (Peyğəmbərin zövcələrindən) bir şey soruşduqda pərdə arxasından soruşun» (Quran, 33:53).*

Və başqa dinə qulluq edən qadına (əcnəbiyə) kişinin baxması qadağandır. Çünki o, bunun cəzasını axirətdən öncə, bu dünyada, növbəti əhvalatda göstərildiyi kimi alacaqdır.

**Əhvalat**

Buxarada bir zərgərin evinə 30 il su daşıyan suçu yaşayırdı. Və bu zərgərin çox gözəl, hərəkətləri cəzbedici olan, hər mənada kamil, mömin, ağıllı və sədaqətli bir arvadı var idi. Bir gün bu suçu onların evinə gəlib adəti üzrə suyu çəlləyə boşaltmağa başlayır. Qadın isə evin ortasında durmuşdu. Suçu qadına yaxınlaşaraq onun əlini tutub, özünə çəkib sığalladı. Əri bazardan qayıtdıqdan sonra arvadı ondan soruşdu: «Bir mənə de görüm bu gün sən bazarda Allaha xoş getməyən nə etmisən?». O cavab verdi: «Heç bir şey etməmişəm». Qadın dedi: «Əgər mənimlə səmimi olub hər şeyi danışmasan, bircə an da evdə qalmayacağam. Və bundan sonra nə mən səni, nə də sən məni görəcəksən». Bu zaman kişi dedi: «Bil ki, bu gün dükana mənə bilərzik düzəltdirən bir qadın gəlmişdi. O, bilərziyi əlinə taxanda onun əlinin ağlığı və biləyinin gözəlliyi məni valeh etdi. Və bu an mən bu beyti xatırladım:

Onun əlindəki qızıl bilərzik
Axar sudakı atəşə bənzər.
Mən heç vaxt bilməzdim
Suda atəşə yer olsun.

Sonra mən onun əlini götürüb, özümə çəkərək sığalladım». Və bu an onun arvadı çığıraraq dedi: «Allah böyükdür! Heç də qəribə deyil ki, otuz il bizə su gətirən və bir dəfə də olsun nalayiq hərəkət etməyən suçu bu gün mənim əlimi tutaraq özünə sıxdı».

Kişi dedi: «Ey mənim arvadım, mən etdiyimə peşimanam, mənə düz qərar verməkdə kömək et». Arvadı dedi: «Allaha ümid edək ki, hər şey yaxşı qurtarsın». Növbəti gün suçu gəlib, arvadın qarşısında üzü üstə yerə yıxılaraq yalvardı: «Xanım, məni bağışlayın. Dünən şeytan ürəyimə girib məni çaşdırmışdı». Qadın cavab verdi: «İşinlə məşğul ol. Çünki o səhv sənin yox, dükandakı adamın günahı ucbatından baş vermişdir. Və Allah da bu dünyada onu cəzalandırdı». Arvad əri ilə məhz bu cür rəftar etməlidir. Əgər kişi çoxu bacarmırsa, Fatimə ilə Aişədən (Allah onlardan razı olsun) örnək alıb aza qane olmalıdır ki, əbədi bağın sakinlərindən biri olsun. Növbəti əhvalatda bu haqda danışılır.

**Əhvalat**

Fatimə əl-Zəhra daş dəyirmanında o qədər çox un üyüdürdü ki, hətta onun barmaqları da qanamağa başlamışdı. Və əri Əli ibn Əbu Talibə şikayət edərkən, o demişdir: «Atana de ki, sənə qulluqçu tutsun». O, Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, yanına gedərək deyir: «Ey Allahın rəsulu! Mənə ev işlərində kömək üçün qulluqçu lazımdır». Və o əleyhissəlam deyir: «Ey Fatimə, istəyirsən, mən sənə elə bir şey öyrədim ki, quldan da, qulluqçudan da yaxşı olub, yeddi göy və yeddi yerdən də qiymətli olsun?». O cavab verir: «Ey Allahın Rəsulu, öyrət». Və o, deyir: «Yatmağa getməzdən öncə, bu sözləri de: «Sübhan Allah, və-l-hamdu li-lah və la ilahə illə-llah və Allahu əkbər» (Eşq olsun Allaha! Şükürlər olsun Allaha! Allahdan başqa, yaradan yoxdur! Allah böyükdür!)». Və belə deyirlər ki, onların evində bürüncəkdən başqa, heç nə yox idi. Və onlar başlarını örtəndə ayaqları çöldə qalırdı. Və Fatimənin toy gecəsi yatağa döşək əvəzinə, keçi dərisi sərilmişdi. Və onlar bunun üzərində yatırdılar. Və Fatimənin bu dünya malından bir tək paltarı və palma mifindən bircə balışı var idi. Və qəribə deyil ki, Qiyamət günü onun şəninə deyəcəklər: «Ey burada olanlar! Baxışlarınızı aşağı dikin ki, qadınların xanımı Fatimə əz-Zəhra keçsin!».

Əgər qadın ərinə hörmətlə münasibət bəsləyirsə, onun uşağını böyüdürsə, onun qayğısına qalırsa, vaxtını daha çox evdə ke-

çirib, çölə az çıxırsa, qəlbən təmizdirsə, çətinliklərə səbirlə sinə gərirsə, vaxtında yeməyinə diqqət edirsə, ərinin sirrini saxlaya bilirsə, əri üçün çox dəyərli olur və onun qəlbində məhəbbət günügündən artır.

**Əhvalat**

Deyirlər ki, Xosrov ibn Abravizin balıq yeməkdən xoşu gəlirmiş. Bir gün o, arvadı Şirinlə qonaq otağında oturmuşdu. Bu an içəri daxil olan balıqçı Xosrova böyük bir balıq hədiyyə edir. Balıq onun xoşuna gəldiyindən əmr edir ki, balıqçıya dörd min dirhəm verilsin. Şirin ona deyir: «Sən heç də yaxşı etmədin». O soruşur: «Nə üçün?». O cavab verir: «Çünki bundan sonra sən yaxınlarından kiməsə bu qədər pul versən, o, hər yerdə deyəcək: «Xosrov mənə balıqçıya verdiyi qədər pul verdi. Az verdikdə isə belə deyəcək: «O, mənə balıqçıya verdiyindən də az pul verdi». Xosrov dedi: «Sən haqlısan, lakin şahlara verdiyini geri almaq yaramaz. Artıq gecdir». Şirin dedi: «Mən bilirəm nə etməli». O soruşdu: «Nə?». O cavab verdi: «Sən balıqçını çağırıb soruşacaqsan: «Bu balıq erkəkdir ya dişi?». Və əgər o desə ki, erkəkdi, sən de ki, dişi balıq istəyirdim. Əgər desə ki, dişidir, de ki, erkək istəyirdim. Bu cür sən onu çaşdıraraq pulu geri alıb, ona yalnız layiq olduğu bəxşişi verərsən». Balıqçını çağırdılar və o getdi. Lakin balıqçı çox uzaqgörən və ağıllı adam idi. Xosrov ondan soruşdu: «Ey balıqçı! Bu balıq erkəkdir, ya dişi?». Balıqçı yeri öpərək dedi: «Bu nə erkəkdir, nə də dişi». Bu cavaba gülən Xosrov ona daha dörd min dirhəm verilməsini əmr etdi. Xəzinədən səkkiz min pul alan balıqçı pulları kisəyə töküb çiynindən asdı. Və saraydan çıxarkən kisədən bir dirhəm pul yerə düşdü. Balıqçı dirhəmi əyilib götürmək istəyərkən onu müşahidə edən Şirin ərinə dedi: «Sən heç bu cür miskin bir adam görmüsən? O, bir dirhəmi götürməkdən ötrü çiynindən səkkiz min dirhəmi yerə qoydu. Və rəva görmədi ki, o bir dirhəm qulluqçulardan kiməsə qismət olsun». Şirinlə razılaşan Abraviz əsəbi halda dedi: «Düz deyirsən, Şirin». Sonra o, balıqçını geri çağırtdırıb dedi: «Sən ləyaqətsizsən, o qədər pulu bir dirhəmə görə yerə qoydun. Xəsisliyindən imkan vermədin ki, pul yerdə qalsın». Balıqçı yeri öpərək dedi: «Allah bizim şahın ömrünü uzun etsin. Mən o dirhəmi onun üçün qaldırmadım ki, o, mənə çox dəyərlidir. Sadəcə olaraq, o dirhəmin bir üzündə rəhmli şahın şəkli, o biri üzündə isə onun adı həkk olunub. Və mən qorxdum ki, kim-

sə təsadüfən onu tapdalayar. Bu isə mənim günahımdan şahın şəklinə və adına qarşı hörmətsizlik olar».

Onun sözündən təəccüblənən Xosrov balıqçıya daha dörd min dirhəm verilməsini əmr etdi. Və balıqçı evə on iki min dirhəmlə qayıtdı. Xosrov isə carçıya car çəkməsini əmr etdi ki, heç kəs qadınların sözünə qulaq asmasın. Yoxsa onların sözünü dinləyən bir dirhəm əvəzinə, iki dirhəm itirər.

**Nəticə**

Kitabın müəllifi deyir: «Bu dünyanın sahmanı və nəsil artımı qadınlar vasitəsilə olur. Qayda-qanun və sahman isə şəxsi fikir və düşüncə olmadan qeyri-mümkündür. Ləyaqətli və ehtiyatlı kişi qız seçərkən diqqətli olmalıdır və o, qızı yetkinlik yaşına çatarkən ərə verməlidir ki, sonra biabır olub ürək xəstəliyi tapmasın».

Qüdrətli Allahın köməkliyi ilə böyük alim Əbu Həmid Məhəmməd ibn Məhəmməd ibn Məhəmməd əl-Qəzalinin qələminin məhsulu olan «Hökmdarlara nəsihət» kitabı yekunlaşdı. Qoy Allah rəhm və mərhəmətini onun müəllifinin üzərindən əskik etməsin! Amin!

# ƏL-QƏZALİNİN QADININ CƏMİYYƏTDƏKİ YERİ VƏ ROLU HAQQINDA GÖRÜŞLƏRİ

Əl-Qəzali kitabını vətəndaş cəmiyyətində qadının yeri və rolu haqqındakı fəsillə tamamlayır. O, qadının ictimai həyatda və tərbiyə sahəsində nə qədər vacib rol oynadığını aydınlaşdırdıqdan sonra müsəlmanın arvad alarkən hansı şərt və meyarlara əsaslanmasını da dəqiq və əhatəli şəkildə göstərir. Əl-Qəzali qadının ictimai həyatdakı rolunu, cəmiyyətdəki proseslərə təsirini və insan nəslinin davamçısı olmasını xüsusi qabarıqlıqla əks etdirmişdir. Əl-Qəzali belə bir nəticəyə gəlir ki, siyasət yalnız hökmdarın səlahiyyətləri, cəmiyyətin siyasi quruluşu və canişin qubernatorun seçilməsi meyarları ilə məhdudlaşmayıb, özündə məişətin müxtəlif sahələrini – ailə, qul, uşaqların tərbiyəsi, arvadlarla rəftar və ictimai həyatın digər problemlərini də ehtiva edir. Bu kitabda ictimai həyatın problemlərindən olan qadının cəmiyyətdəki yeri və rolu məsələsi əl-Qəzali tərəfindən təhlilə cəlb edilmişdir.

Heç də qəribə deyil ki, əl-Qəzali ictimai həyat, iqtisadiyyat və tərbiyə barədə fikir yürüdərək, siyasi problemlərə də toxunmaqdan yan keçməmişdir. Çünki antik və müsəlman filosofları fəlsəfəni ailə-məişət, gəlir və vergi, uşaqların tərbiyəsi, qulla rəftar kimi problemləri araşdıran siyasət haqqında elmin bir sahəsi sayırdılar.

Bəs əl-Qəzalinin qadına münasibəti necədir? Qadının kişi qarşısında və kişinin qadın üzərində hansı hüquqları var? Qadının kamil mənəviyyat sahibi olması üçün hansı şərtlər vacibdir?

Bu suallara cavab əl-Qəzalinin qadının cəmiyyətdəki rolu haqqındakı nəzəri baxışlarına aydınlıq gətirir.

Əl-Qəzali qadına şəriət qanunlarına ciddi əməl edən dindar müsəlman, ağıllı insan gözü ilə baxır. O, qadına yalnız zövq mənbəyi kimi baxmayıb, onun cəmiyyətdəki mövqeyini yüksək dəyərləndirir. Əl-Qəzali göstərir ki, cəmiyyətin vacib hissəsi olan qadınsız nə ailə tərbiyəsi, nə də insan nəslinin davamı mümkündür. O deyirdi: «Sivil (mədəni) dünyanın təşkili və Adəm nəslinin davam etməsi qadınların sayəsində olur». Əl-Qəzali qadını şəriətə əsaslanaraq əri ilə hüquqi nigahda olan arvad, kişinin tərəf müqa-

balı, dünyaya uşaq gətirən, onlara tərbiyə vermək işində ailə vəzifələrini, bununla yanaşı ictimai və iqtisadi vəzifələrin məsuliyyətini əri ilə paylaşan birisi kimi təsəvvür edirdi. Əl-Qəzali «Zəhmətin mizanı» kitabında yazır ki, əgər kişi təkbaşına bütün ev işlərini icra etməyə başlasa, o, buna vaxtının böyük bir hissəsini sərf edib, əmək və elmlə məşğul ola bilməz. Əl-Qəzali nigahı dini ayin və Məhəmməd Peyğəmbərin (s.) bütün müsəlmanlara borc və vəzifə bildiyi bir sünnə sayır. Peyğəmbər buyurmuşdur: «Nigaha gedin, həqiqətən, Adəm hümmətimi sizin vasitənizlə çoxaldıram!». Buna uyğun olaraq insan şəriətin qanunlarını zina etməməlidir.

Əl-Qəzali «Din haqqında elmlərin dirçəlişi» və «Zəhmətin mizanı» əsərlərində nigahın üstünlüklərindən danışır. Qeyri-qanuni və mənfəət üzərində qurulan evliliyin fəsadlarından da söz açır.

Və nigahda münasibətlərin fərqli olmasına baxmayaraq, qadın, şübhəsiz ki, əri üçün sevinc mənbəyi, ailə əmlakı və ümumi mülkiyyətin etibarlı həmsahibəsi və əri ilə birlikdə ev işlərinə, uşaqların tərbiyəsinə nəzarət edəndir. O, həyat yoldaşının namusunu qorumalı, onun ürəyinə sevinc və rahatlıq gətirməli, çətin günlərdə öz məsləhətləri ilə ona kömək edib, təskinlik verməlidir.

Qadının bir həyat yoldaşı kimi ailədə rolu və vəzifələrini nəzərə alan əl-Qəzali bu problemə müraciət etməzdən öncə, həyat yoldaşı seçimi məsələsinə diqqət çəkir. Lakin o, bunu qadınların dürüstlüyünə, bacarığına olan şübhələrini göstərdikdən sonra edir. Lakin bu şübhələrindən həqiqəti üzə çıxarmaq, qadının ona layiq olan davranışını müəyyən etmək üçün bir metod kimi işlətmişdir. Nigah az əhəmiyyətli məsələ olmayıb, təsadüfi xarakter də daşımır. Əksinə, bu, əks cinslərin şəriətin hökmünü yerinə yetirmək və insan nəslini davam etdirmək üçün bir-birini dərk etməsidir.

Bəs əxlaqlı qadın kimdir? Və o, hansı xüsusiyyətlərə malikdir?

Əl-Qəzali qəti olaraq şəriətə və adət-ənənələrə uyğun olmayan heç bir nigahı qəbul etmir. O, kişini yalnız müsəlman qadını ilə evlənməyə sövq edərək Məhəmməd Peyğəmbərin (s.) sözlərini misal gətirir: «Və o kəsi ki, onun dini daha yaxşı və imanlıdır». Həqiqətən də, din- mənəviyyatın əsası, dəyərlərin, yaxşı işlərin və nümunəvi davranışın mənbəyidir və əgər qadın bu yolu tutsa, nəcibliyini saxlayar, əri və onun qohumları qarşısında hər zaman itaətdə olub, evini yalnız ərinin razılığı ilə ailə işləri üçün tərk edər. Dindar olmayan qadın isə öz əməllərini yalnız hissləri ilə müəyyən edir. O, ərinin qayğısına qalmayaraq, onun var-dövlə-

tini və əmlakını hara gəldi xərcləyir. Əl-Qəzali bu haqda kitabında belə demişdir: «Əgər iman olsa, var-dövlət də olacaq. İmansız qadından isə heç bir xeyir gəlməz».

Əl-Qəzali qeyri-müsəlmanla (dinsizlə, bütpərəstlə və qulla) nigahı qəbul etmirdi. Onun fikrincə, qeyri-müsəlman arvad nə uşaqlara ana, nə də həyat yoldaşı kimi yararlı deyil.

Onun fikrincə, qeyri-müsəlmanla nigah şəriətə əksdir: «Kişi başqa dindən olan qadına qətiyyən baxmamalıdır. Buna görə o, axirətdən öncə, bu dünyada cəzalanacaq. Onun vərdişləri, meylliliyi İslama zidd olub, davranışları və dünyagörüşü ilə müsəlman əxlaqına ziddir». Əl-Qəzalinin fikrincə, o, uşaqları müsəlman kimi tərbiyələndirməyib, ailə ocağının müqəddəsliyini yaşada bilməyəcəkdir. Belə arvad ərinin həyatını korlayıb, onun qəlbini həmişə narahat edəcəkdir. Və o, ərinin gələcək uğuru və xeyir-bərəkəti üçün bir təhlükə olub, ağıllı, səmimi, ailəsi və din uğrunda ölümə getməyə hazır olan Fatimə və Aişə kimi ideal müsəlman qadınının tam əksini təşkil edəcəkdir.

Qeyd etmək lazımdır ki, «Hökmdarlara nəsihət» kitabının müəllifinin başqa dindən olan qadınlara münasibəti yaşadığı dövrün, zəmanənin təsiri ilə formalaşmışdır. Bu dövrdə cəmiyyətin müxtəlif sahələrində və fərqli sferalarında maddi rifaha meyl güclənmişdir.

Dövlətlilər daha da dəbdəbəyə can atır, müsəlman cəmiyyətinə türk və hind mədəniyyəti gətirirdilər. Bu faktorların təsiri ilə mənəvi tənəzzül və təzadlar yaranırdı. Cəmiyyətin mənəvi əsasları sarsılmış və çox bərbad vəziyyətə düşmüşdü. Əl-Qəzalinin bütün bu mənfi təzahürləri yoluna qoymaq cəhdləri isə ictimai şüur və mənəviyyatla sıx bağlı idi. Ona görə də o, bu barədə Quran və mübarək Məhəmməd Peyğəmbərin (s.) hədislərində qanun kimi deyilmiş adət-ənənə və mənəvi prinsipləri oxucuların diqqətinə çəkərək xatırladırdı. Əl-Qəzali yalnız elmi əsərlər və fiqh (müsəlman qanunu) haqqında kitablar yazmaqla kifayətlənməyib. O, dini məsələlər, vətəndaş cəmiyyəti və xüsusən də şəxsiyyət problemi ilə bağlı əsərlərin də müəllifidir.

Əl-Qəzali qadının qarşısında qoyulan tələblərdən biri kimi, gözəlliyi və sağlamlığı qeyd edirdi. Bunun üçün o, peyğəmbərin hədisindən də sitat gətirib: «Ən yaxşı dindar qadınlar gözəllərdir». Kişi eybəcər xarici görünüşə malik qadınlardan uzaq olub, özünə həyat yoldaşı, dost, köməkçi seçmək üçün başqa qadın axtarışına

çıxır. Eyni zamanda onun həyatı öz rahatlığından məhrum olub, ağlın diktəsi ilə yox, təsiri altına düşdüyü hiss və əyləncələrlə yaşayacaqdır.

Kişi ilə qadın münasibətlərində aparıcı amillərdən olan qadın gözəlliyi qadını həm bədbəxtçilikdən, həm də erkən qocalmaqdan saxlayır. Əl-Qəzali bu fikrini əsaslandırmaq üçün bir hədisdən də misal gətirib: «O qadın yaxşıdır ki, əri ona baxdıqda ürəyi açılsın». Gözəllik və sağlamlıqdan başqa, xoşbəxt nigah üçün lazım olan başqa bir şərt də qızın bakirəliyidir. Eyni zamanda o, sonsuz olmamalıdır ki, buna görə əri ilə arasında yaranan soyuqluq boşanma ilə nəticələnməsin. Bu səbəbdən əl-Qəzali dönə-dönə qeyd edir: «Yaxşı və xeyir-dualı arvadlar çox uşaq dünyaya gətirə bilir». Sonsuzluq nəsil artımının qarşısını alıb, qohumluq əlaqələrini sona çatdırır və şəriət qanunlarına əsasən valideynlərinə həm bu, həm də axirət həyatında kömək etməli olan övladların dünyaya gəlməsində əngəl olur.

Gəlinin bakirə olması xoşbəxt nigahın əsas şərtidir: «Tələb et ki, o, bakirə olsun».

Əl-Qəzalinin fikrincə, müsəlmanın arvadı azad qadın olmalı və bu da onun qul qarşısında əsas üstünlüyü sayılmalıdır. Bununla bağlı Peyğəmbərin (s.) belə bir hədisi də verilir: «Sizin üçün daha uyğun olanı azad qadındır. Çünki o, sizin üçün daha təmiz və daha yaxşıdır». Onun fikrincə, qul müsəlmana ərə getdikdə İslamı qəbul etməsinə baxmayaraq, mövqeyinə görə azad qadından sonra gəlir. Çünki azad qadın nəsil-nəcabətlidir və qulla müqayisədə daha çox hörmət və ehtirama malikdir. Burada əl-Qəzali yaşadığı dövrün, cəmiyyətin inam və ehkamlarının təsiri ilə çıxış etmişdir.

Əl-Qəzali mənfəət üçün edilmiş nigahdan uzaq olmağa çağırır. Və qadının dövləti, cəmiyyətdəki yüksək mövqeyinə görə onunla ailə quran kişilərə qarşı olan nifrətini qətiyyən gizlətməyib deyir: «Var-dövləti və şöhrəti olan arvad axtarma, çünki arvad ondan sənə pay verməyib, yeri gəldikdə sənə qarşı istifadə edəcəkdir». Xəsislik fayda vermir, dövlət isə tədricən azalır. Bəzən var-dövlət ailəni dağıdan təhlükəyə çevrilir. İslam dini kişi qarşısında arvadına yaxşı baxmaq və öz mülkiyyəti ilə sərbəst davranmağa imkan verməyi tələb edir. Qüdrətli Allah buyurur: *«Ey iman gətirənlər! Qadınlara zorla varis çıxmaq sizə halal deyil. (Qadınlar) açıq-aşkar pis iş görməyincə özlərinə verdiyiniz şeylərin bir hissəsini geri qaytarmaq məqsədilə onlara əziyyət verməyin. Onlarla*

*gözəl rəftar edin» (Quran, 4:19)*. Həmçinin müəllif müvəqqəti nigahın da (mütə) əleyhinə çıxaraq deyir: «Əgər sən arvad axtarırsansa, onu yalnız hisslərini ödəmək üçün axtarma». Nigahdan yalnız hissi zövq gözləyən kişilərdən heç bir fayda gəlməz. Çünki onlar öz ehtiraslarının və hisslərinin əsiridirlər. Və belə kişilərdə bir qadına qarşı hiss sönsə, elə o andaca başqa bir qadına qarşı alovlanacaq.

Müəllif qadınlara qəlbən mehriban və səxavətli olub, qonaqlara qarşı hörmətsizlik etməməyə çağırır. Bu barədə o, fikirlərini qonaqları yedirtmək üçün yeganə atını kəsib, daha sonra arvadının deyingənliyinə görə onu boşayan Abdulla ibn Mübarək haqqındakı əhvalatı nəql edərək verir.

## QADININ HÜQUQ VƏ VƏZİFƏLƏRİ

Əl-Qəzali kişini evin böyüyü, ailə üzvlərinin himayədarı sayır. Müəllif yazır: «Arvad ərin əsiridir. Baxmayaraq ki, qadının azadlığa, şəxsi həyata və sərbəst iradəyə haqqı var, o, əqli və fiziki göstəricilərinə görə, ərindən daha zəif sayılır. Müəllif kişi ilə qadın arasındakı bu fərqi Allahın sözü ilə – *«Kişilər qadınlar üzərində ixtiyar sahibidirlər» (Quran, 4:34)* təsdiqlədərək bunun təbiət və şəriət qanunlarına nə qədər uyğun olduğunu göstərmək istəmişdir. Kişi ilə qadın arasındakı bu fərqdən çıxış edərək əl-Qəzali qadınlara qarşı mehriban və nəzakətli olmağı, onların səhvlərinə qarşı kobudluq göstərməməyi, sərtliklə qayğıkeşlik arasında orta mövqe saxlamağı məsləhət bilmişdir. Əl-Qəzali «Dini elmlərin yaranması» əsərində qadının kişi üzərindəki hüququna bunları daxil edir: ərin arvad ilə yaxşı davranması, onunla evliliyin rəsmi olaraq qəbul edilməsi, yaxşı adının qorunub saxlanması, onun izlənilməsinə yol verilməməsi, onun davranışındakı qüsurları aradan götürmək.

Əl-Qəzali «Hökmdarlara nəsihət» kitabında «Dini elmlərin yaranması» əsərində irəli sürdüyü bir çox məsələlərə yenidən münasibət bildirmişdir. Onlardan birincisi isə ərin arvadın haqqını tapdamaması, ona səmimi və hörmətəlayiq münasibət bəsləməsidir: «Kişilər arvadlarına qarşı rəhmli olub, onları incidib təhqir etməməlidirlər».

Təbiət kişini güclü yaradıb, şəriət və vətəndaş qanunları isə ona qarşı çox böyük iltifat göstərib. İslam kişiyə bir, iki, üç, hətta

dörd arvadla eyni anda evlənməyə icazə verdiyi halda, qadının yalnız bir əri ola bilər. O, (kişi) evdən çıxmaqda, istədiyi kimi pul xərcləməkdə, ailəyə və cəmiyyətə daha sonra xeyir gətirəcək sahələrə pul yatırmaqda tam sərbəstdir. Bütün bunlar isə qadına qadağandır; o, ərinin icazəsi olmadan evi tərk edə və ya əmlakdan nə isə götürə bilməz. O, həmişə ərinə qulluq etməlidir.

Həmçinin əl-Qəzali kişiyə məsləhət görür ki, ər-arvad münasibətlərini korlaya biləcək səviyyədə qadına qarşı zəiflik göstərməsin. Və o, müstəqil və sərbəst qərar vermək haqqını özündə saxlamalıdır. Çünki qədim hökmdar Xosrov ibn Abraviz dediyi kimi, arvad sözünə qulaq asan ziyana düşər. Müəllif qadınlarla yalnız müzakirə aparıb onları dinləməyi məqbul sayır: «Arvadı dinlə, amma onun dediklərinin tərsinə iş gör». Qadının kişi üzərində haqqı kimi, ərin arvadı müdafiə edib onun təhlükəsizliyini və himayəsini qorumasını göstərmək olar. Qadının haqqı olduğu kimi, vəzifələri də var; o, ağıllı arvad olmalı, öz adını və ərinin namusunu qorumalıdır. Bunun üçün isə o, başqa kişilərdən uzaq olub, naməhrəmlərin gözünə görünməməlidir. O yazır: «Əgər yad kişi qapını döysə, qadın ona incə və nazik səslə cavab verməməlidir». Qadına başqa kişilərə, xüsusən də başqa dindən olan kişilərə baxmaq qəti qadağandır: «Qadınlara başqa dindən olan kişilərə baxmaq olmaz». Bu ondan irəli gəlir ki, qadının ağlında onu ləkələyəcək pis fikirlər yarana bilər. Həmçinin qadın ərindən çox da vacib olmayan nəyi isə yerinə yetirməyi istəməməlidir. O, imkan daxilində əldə edilən aza qane olmalıdır: «Ona mümkün olmayanı məcbur edib, tərs olma. Ərinin sirrini o olmadıqda da hifz elə». Məhz bu cəhətlər əri arvada qarşı daha etibarlı və səmimi edir.

**Doktor Məhəmməd Əhməd Daməq**
**Beyrut 1986**

## ÖN SÖZ

«İlahi elmlər haqqında bilgilər» («Ər-Risalə əl-ləduniya» və ya «Ər-Risalə fi-l-ilm əl-ləduni» və ya «Ər-Risalə-fibəyan əl—ilm əl-ləduni») adlı əsər əl-Qəzalinin İlahi bilgilər əldə etmək, daha doğrusu, bu bilgiləri yaşatmaq haqqında olan kiçik, lakin kifayət qədər tanınmış traktatıdır. Əl-ilm əl-ləduni («mistik, ilahi bilgilər») İslam mistikasında yaranaraq möhkəm və təməlli bir anlayışdır. Sufiliyi yaşayıb onun nəzəriyyəsi ilə məşğul olanlar öz əsərlərində əl-ilm əl-ləduniyə müraciət edərək bu və ya dolayısı yolla Quran ayətlərinə müraciət edirlər: *«Öz dərgahımızdan mərhəmət (peyğəmbərlik və vəhy, yaxud ilham və kəramət) əta etdiyimiz və Öz tərəfimizdən elm (qeybə dair bəzi biliklər) öyrətdiyimiz bəndələrimizdən birisini tapdılar» (Quran, 18:65)*. Sufilər buradakı «birisini» Xızır Peyğəmbər kimi yozurlar. Əl-ilm əl-ləduni anlayışı İlahi bilgidən çox, heç bir insan vasitəçiliyi olmadan ona sahib olmağı öyrədir.

Əl-Qəzali öz əsərində bu ayətə müraciət edərək elmi iki üsulla qazanmağın yolunu göstərir: vasitəli, yəni kiminsə köməyi ilə, vasitəsiz, yəni Allahdan. Eyni zamanda onların hər ikisi özlüyündə iki növə ayrılır. Birinci halda bu, (müəllim və müxtəlif əyani vasitələrin, məlumatların yardımı ilə verilən təəllüm) fikir (tədəbbür) və düşüncənin (təfəkkür) köməkliyi ilə dərk edilən məhdud bilgilərdir.

İkinci halda isə bu bilgilər vəhy halında gəlib Peyğəmbər sözü kimi (əl-ilm-i-ən-Nəbivi) tanınan İlahidən təsirlənən (ilahi) əl-ilm əl-ləduni adlanan bilgilərdir.

Sufilikdə əl-ilm əl-ləduni Allaha yaxın olanların (övliya) elmidir. Lakin bu elmdən əl-Qəzalinin fikrincə, peyğəmbərlər də istifadə edə bilirdilər. Lakin Məhəmməd, ona Allahın xeyir-duası və salamı olsun, peyğəmbərlərin sonuncusu, onun vəhyləri isə Allah-təala tərəfindən göndərilən axırıncı bilgilər olduğu üçün əl-ilm əl-ləduni İslamda yalnız ruhi təmizlənmə yolu ilə yaşana bilən yeganə İlahi bilgilər sayılır.

Bütün hallarda əl-ilm əl-ləduni psixo-texnik və ruhi-dini hərəkətlərlə şüşə kimi cilalanmış mənəvi ürəklə sirli lövhə (əl-lauh

əl-məxfuz) arasında mənəvi əlaqə (ən-nisba əl-ruhiyə) yaratmağa xidmət edir. Mənəvi əlaqə yarandıqda insanın ruhuna daxil olan İlahi təsir (əl-ilham) ona əl- ilm əl-lədunini yaşadır.

Həcmcə böyük olmayan «İlahi elm haqqında bilgilər» əsəri dünya şərqşünaslığında, daha doğrusu, qəzəlşünaslıqda çoxsaylı tədqiqatlara səbəb olan müstəqil bir sahə kimi öyrədilməkdədir. Bu isə ilk növbədə əl-Qəzalinin yazılı irsi ətrafında olan problemlərə maraqdan irəli gəlir. Bu tədqiqatları aşağıdakı kimi də qruplaşdırmaq olar:

1. Bu və ya digər əsərin əl-Qəzaliyə məxsusluğu.
2. Onun əsərlərinin yazılma xronologiyası.
3. Onun əsərlərinin tekstoloji təhlili əsasında əl-Qəzalinin düşüncələrinin evolyusiyasını müəyyənləşdirmək.
4. Sufizmin inkişafında əl-Qəzalinin rolu.

Buradan göründüyü kimi, birinci məsələ həll olunmadan digərlərinə keçmək əhəmiyyətsizdir. Lakin əl-Qəzali əsərlərinə imza qoymayıb, özü haqqında bir işarə vermədiyi üçün günü bu gün də tədqiqatçıları çətin vəziyyətə salır (ola bilər ki, müəllif əsərlərində özü, imzası haqqında bu və ya digər məlumatlar qoymuşdur. Lakin bu haqda hələlik məlumat əldə edilməyib. Bu səbəbdəndir ki, müxtəlif vaxtlarda və müxtəlif məqsədlərlə bir sıra əsərlər onun adına çıxarılmışdır. Onun bəzi orijinal əsərlərinə hətta ayrı-ayrı fəsillər də əlavə edilmişdir (məsələn, «Hökmdarlara nəsihət» kitabının 2-ci fəsli). Burada başqa bir problem də ondan ibarətdir ki, əl-Qəzaliyə aid edilən bir sıra əsərlərin onun qələm məhsulu olmadığı haqda fikirlər də yürüdülür.

Bu səbəbdən uzun zaman «İlahi elmlər haqqında bilgilər» bir sıra qərb alimləri tərəfindən əl-Qəzaliyə aid edilmirdi. Bunun səbəbi isə çox sadə, inandırıcı idi. Keçən əsrin ortalarında yaşayan tanınmış ispan şərqşünası Asin Palasios ibn əl-Ərabinin «Ruh və qəlb haqqında bilgilər» («ər-risalə fi-n-nəfs və-r-ruh») kitabını tərcümə etdikdən sonra «İlahi elm haqqında bilgilər» kitabı ilə rastlaşıb müəyyən edir ki, buradakı mətnlərin çoxu sözbəsöz ibn əl-Ərabinin əsərini təkrar edir. Tədqiqatçı belə bir məntiqi fikrə gəlir ki, ibn əl-Ərabi əl-Qəzalinin ölümündən 50 il sonra dünyaya gəldiyi üçün ibn əl-Ərabinin əsərləri daha original olmalıdır. Deməli, «İlahi elm haqqında bilgilər» əl-Qəzaliyə məxsus olmayıb, ibn əl-Ərabidən sonra onun «Qəlb və ruh haqqında bilgilər» kitabı əsasında kiminsə tərəfindən qələmə alınıb. Lakin daha sonra aparılan tədqiqatlar, ma-

nuskreptologiya və mətnşünaslıq sahəsindəki yeniliklər bu fikrin yanlış olduğunu sübut etdi. Məsələ bundadır ki, «İlahi elm haqqında bilgilər» əsəri ibn əl-Ərabinin doğulmasından 50 il əvvəl tərtib olunmuş külliyyatlara daxil edilmişdir (onlardan biri isə əl-Qəzalinin ölümündən 4 il sonra tərtib olunub və burada bu əsərin müəllifi kimi əl-Qəzali göstərilib). Beləliklə, tanınmış iran alimi Nəsrullah Pürcavadın dediyi kimi, «əgər ibn əl-Ərabinin risaləsinin mövzusu əl-Qəzalinin risaləsinin mövzusuna uyğun gəlirsə, deməli, ibn əl-Ərabi başqa hallarda etdiyi kimi, burada da mövzunun kimdən götürüldüyünü və mənbəyini göstərməmişdir»[41].

Zənnimcə, «İlahi elm haqqında bilgilər»in yazılma tarixi və əl-Qəzalinin əsərlərinin xronologiya ardıcıllığındakı yeri ilə bağlı fikirlər hələ də açıqdır. Əl-Qəzali əsərlərinin ətraflı katoloqunu təşkil edən Əbdürrəhman Bədəvi bu əsərə «Dini elmlərin yaranması» (28) və «İşıq şüası» (52)[42] kitabları arasında 50-ci mövqeni vermişdir. Zənnimcə, bu, çox mübahisəli məsələdir. Çünki «İlahi elm haqqında bilgilər»in sonunda o, ilahi bilgilər, təfəkkür haqqında ayrı bir kitab qələmə almaq istəyini bildirmişdir. Onun təfəkkür haqqında düşüncələri çox vacib və lazım olduğundan biz bu barədə bir qədər sonra danışacağıq.

Zənnimcə, «Dini elmlərin dirçəlişi» kitabı əl-Qəzalinin təfəkkürün əsasları sahəsində qələmə almaq istədiyi elə həmin əsəridir. Qeyd etmək lazımdır ki, burada ayrı verilmiş 39-cu kitab məhz «Təfəkkür kitabı» adlanır. Və əl-Qəzalinin öz sözlərindən aydın olur ki, bu əsər təfəkkürə həsr olunub. Əgər bu, belədirsə, deməli, «İlahi elmlər haqqında bilgilər» kitabı «Dini elmlərin yaranması» əsərindən əvvəl qələmə alınıb. Əl-Qəzalinin «İlahi elmlər haqqında bilgilər» əsərində hansı fikir üzərində qaldığını başa düşmək üçün mən «Yaranış...» əsərindən təfəkkür, onun mahiyyəti və adi həyatdakı tətbiqi ilə bağlı bir parçadan sitat gətirmək istəyirəm: «Beləliklə, burada beş mərhələ var. Onlardan birincisi – anma (təzəkkür) olub ürəkdə iki mistik bilgini ehtiva edir. İkinci – düşünmə (təfəkkür) ve-

---

[41] Sm.: Nasrollah Pourjavady. Majmuah-yi Falsafi-yi Maraghah (A Phhilosophical Anthology from Maraghah Containing works by Abu Hamid Ghazzali, "Ayn al-Qudat Hamadani, Ibn Sina and others) / Facsimile ed. with introd. in Persian and English by Nasrollah Pourjavady. Tihran. Iran University Press, 2002, 13-14.

[42] Badawi 'Abd ar Rahman. Muallafat al-Ghazali /Les oeuvres d'al-Ghazali Al-Qahira/Le Caire,
1380/1961. N50 (ar-Risala al Laduniya) P. 191; N 90 (ar-Risala al Laduniya) P. 270-271

rilmiş iki mistik bilgi ilə üçüncüsünün axtarışı, üçüncü – axtarılan mistik bilginin əldə edilərək, onunla ürəyin nurlandırılması (xüsul), dördüncü – mistik nur gələn zaman ürəkdə olan dəyişiklik (təhəyyür). Beşinci – ürəkdəki dəyişikliyə uyğun olaraq bədənin ayrı-ayrı hissələrinin ona qulluğu (xidmət).

Dəmirə dəyən daşın yaratdığı atəş ərazini işıqlandırıb gözəl işıq verdikdən sonra əvvəl görünməyəni görünən edir. Və buna uyğun olaraq da bədənin ayrı-ayrı hissələri fəaliyyətə başlayır. Və təfəkkür də məhz bu cür mistik nurun çölə çıxmasıdır. İki mistik elm bir-birilə daşın dəmirlə toqquşması kimi toqquşaraq yeni bir mistik elm yaradır. Bu elm daşla dəmirin toqquşmasından yaranan atəşə bənzəyir. Bu işıq ürəkləri dəyişir ki, əvvəllər meyl hiss edilməyənlərə qarşı yeni meyl yaransın. Necə ki atəş əvvəl görünməyəni sonra görünən edir. Daha sonra qaranlıqdan işıqlığa çıxan insanın əvvəl görməyib indi gördüklərini qəbul etməsi üçün bədəninin ayrı-ayrı hissələri fəaliyyətə keçdiyi kimi, bu zaman burada da bədəndə ürəyin vəziyyətinə uyğun müəyyən dəyişikliklər yaranır»[43].

Bu kiçik ön sözü tamamlayaraq qeyd etmək istərdim ki, aşağıda təqdim edilmiş tərcümə ilk dəfə «Sufizm»[44] kitabında verilmiş və burada «Peterburq» şərqşünaslığının razılığı ilə heç bir dəyişikliyə uğradılmadan yenidən təqdim edilir. Xatırlatmaq istərdim ki, məndə kitabın ərəbcə orijinalı olmadığı üçün onu fars dilində nəşr olunmuş «İlahi elm» («ilm-i-lədunі», Tehran, 1982) adlı variantdan tərcümə etmişəm. Buna baxmayaraq, ümid edirəm ki, bu əsər oxucuların böyük marağına səbəb olacaqdır.

Aleksey Xismatulin

---

[43] Muxammad alğ Qazali at-Tusi Abu Xamid . İxya' 'ulöm ad-din. V 4-x t. Al-Kaxira (Kair). 1885. T.4. S. 387- 388.
[44] Xismatulin A.A. Sufizm. SPb.: Peterburqskoe Vostokovedenie, 1999.

# GİRİŞ

*Rəhman və rəhmli olan Allahın adı ilə!*

Allaha həmd olsun! O, seçilmiş bəndələrinin qəlbini öz nuru ilə bəzəyib onları qayğı və rəhm ilə ərsəyə yetirmiş, dərk edən ürəkləri üçün müttəfiqlik qapısını düşünmə və anlama açarı ilə açmışdır. Və Allahın xeyir-duası bizim rəhbərimiz, peyğəmbərlərin cənabı, Allah qanunlarının sahibi, müsəlman cəmiyyətinə xoşbəxtlik yolunu göstərən, xilas və öyüd gəmisinin kapitanı olan Məhəmmədin üzərindən əskik olmasın.

Əməlisaleh dostlarımdan biri mənə demişdir ki, bəzi alimlər sufilərin və sufilik yolunu tutanların İlahi elmləri qazanılan və öyrənilən elmlərdən üstün tutmasına şübhə ilə yanaşırlar. Onlar deyirlər: «Biz sufilərin inancının əsasını təşkil edən elmi təsir belə etmirik. Biz inanmırıq ki, elə bir adam olsun ki, o, təhsil almadan elm və bilikləri düşünüb fikirləşərək əldə edə bilsin».

Bu an mən əlavə etdim: «Elə bil ki, bunu deyən elmi biliklərin müxtəlif yolla mənimsənilməsini təsəvvür etməyərək insan ruhunun müxtəlif keyfiyyətləri və xüsusiyyətləri, gizli bilgilərin dərki və onda İlahi elmlərin əks olunması haqqında heç bir şey eşitməyib». Mənim dostum cavab verdi: «O adam deyir ki, fiqh, Quranın şərhi (təfsir) və kəlamdan başqa, elm yoxdur». – «Deməli belə, bu, necə mübahisəçidir ki, Quranın şərhini elm saydığı halda, sahilsiz dəniz olan Qurandakı mirvari və inciləri nəzərdən kənar qoyur?! Xalq arasında geniş yayılmış heç bir əsərdə və şərhdə bu qiymətli daş-qaşlar və İlahi həqiqət haqqında məlumat yoxdur. Və o şərhlərin həqiqi mənası o mübahisəçinin təsəvvüründən daha yaxşı və yüksək anlam daşıyır.

O, Quşari, Sələbi, Məvardiyə və onlar kimi tanınmışların şərhlərindən başqa, heç kəsin şərhini qəbul etmir. Bu səbəbdən o, həqiqət yolundan çox uzaq düşüb. Məsələn, Sunami Quranın şərhinə aid kitabında həqiqət axtarıcılarının bir çox fikirlərini toplayıb çox dəyərli bir əsər ərsəyə gətirib. Quranın şərhi, kəlam və fiqhdən başqa, heç nəyi elm saymayan bu adam əslində, elm, onun mərhələ-

ləri, həqiqət haqqında lazımi bilgilərə malik deyildir. Əks təqdirdə, həqiqəti dadan və İlahi bilgilər haqqında azacıq da olsa, məlumatı olan ona şübhə ilə yanaşmaz». Mənim dostum dedi: «Mən istərdim ki, sən elmlərin növü, İlahi bilgilər haqqında anlayışları qələmə alasan». – «Bu elm haqqında danışmaq çox çətindir. Lakin mən bacardığım qədər nə isə yaratmağa çalışacağam. Çalışağacam ki, qısa və aydın tərzdə fikirlərimi ifadə edim. Çünki ən yaxşı nitq qısa və aydın olandır». Mən dostumun bu xahişini Allahdan kömək və uğur diləyərək həyata keçirməyə çalışacağam.

## ELMLƏR, DƏRK EDƏN VƏ DƏRK OLUNAN HAQQINDA BÖLMƏ

Bilmək lazımdır ki, bilik - ağıllı insanın qəlbinin əldə etdiyi ayrı-ayrı şeylər haqqında həqiqi təsəvvürüdür.

Bilən o kəsdir ki, şeylər haqqında məlumat toplayaraq, onları dərk və təsəvvür edə bilir. Dərk edilən isə təsəvvür nəticəsində qəlbdə həkk olunaraq əks edilləndir.

Həmçinin bilmək lazımdır ki, elmin, biliyin dəyəri onu öyrənənin səviyyəsindən və öyrənilənin əhəmiyyətindən çox asılıdır. Şübhə yoxdur ki, insanlar üçün ən vacib olan bilgilər, Qadir və Ulu Yaradan, təkallahlıq, teologiya haqqındadır. Bu bilgiləri hər bir ağıllı və müdrik insan bilməlidir. Peyğəmbərin buyurduğu kimi: «Elm öyrənmək hər bir müsəlmana vacibdir». Elm öyrənmək üçün o, hətta ən uzaq səfərlərə çıxmağı da tövsiyə etmişdir: «Elm dalınca hətta Çinə də gedin».

Bu bilgilərə malik olan bilənlərin ən kamili hesab olunur. Allah-təala onların adını çox yüksək səviyyədə çəkmişdir: *«Allah özündən başqa, heç bir tanrı olmadığına şahiddir. Mələklər və elm sahibləri də haqq-ədalətə boyun qoyaraq (haqqa tapınaraq) O qüvvət, hikmət sahibindən başqa, ibadətə layiq heç bir varlıq olmadığına şəhadət verdilər» (Quran, 3:18).* Bu səbəbdən təkallahlıq haqqında ən kamil bilgilər peyğəmbərlərdən və onlardan sonra gələn alimlərdəndir.

Lakin təkallahlıq haqqında elm çox nəcib və kamil olmasına baxmayaraq, başqa elmlərin də mövcudluğunu qətiyyən inkar etmir. Bu elmlər isə daha çox güman və fərziyyə üzərində qurulmuşdur. Qeyd etmək lazımdır ki, daha sonra müraciət edəcəyimiz bu elmlər haqqında bilgilərə də təkallahlıq haqqında elmdə rast gəlmək mümkündür.

Nəzərə alınmalıdır ki, təbiətindən asılı olmayaraq, bütün elmlər, hətta saxta elm olan cadugərlik də nadanlığa qarşıdır. Nadanlıq – zülmət, zülmət – durğunluq, durğunluq isə yoxluq olduğu halda, elmin sinonimi varlıq və mövcudluqdur. Əlbəttə, varlıq yoxluqdan daha üstündür. Rəhbərlik, istiqamətlənmə, həqiqət, hərəkət və işıq – bütün bunlar varlıqda mövcuddur. Varlıq yoxluqdan üstün olduğu üçün elm də nadanlıqdan üstündür. Nadanlıq – korluq və zülmət, elm – işıq və göz deməkdir. Məgər işıq və zülmət, kor və görən bərabər ola bilərmi? Allah-təala belə buyurmuşdur: *«De, heç bilənlərlə bilməyənlər eyni ola bilərmi?» (Quran, 39:9).*

Elmin nadanlıqdan daha yaxşı olduğunu müəyyənləşdirdikdən sonra biz bilməliyik ki, nadanlıq bədəndən, bilik isə ruhdan irəli gəlir. Deməli, ruh bədəndən daha nəcib və üstündür. Elmin müxtəlif növləri olduğu kimi, elm öyrənənin də mənimsəməsi üçün müxtəlif yolları var. Biz bu haqda kitabın başqa hissələrində danışacağıq. İndi isə başa düşməliyik ki, elm bilgilərin məkanı olan ruhun dərk olunma vasitəsidir. Çünki bədən həcminin məhdud olmasına görə biliklərin məkanı sayıla bilməz. O, qətiyyən elmlərin artması və sərhədsizliyinə uyğun deyildir. Bədən qanun və vərdişlərdən başqa, heç nəyi əks etdirmədiyi halda ruh yorulmadan və məhdudiyyətsiz şəkildə elm və bilikləri mənimsəyə bilir. Beləliklə, biz qəlb və onun vəziyyəti haqqında qısaca məlumat verəcəyik.

## İNSAN QƏLBİ VƏ RUHU HAQQINDA FƏSİL

Qadir Allah insanı iki substansiyadan yaradıb: birinci tünd rəngdə, mürəkkəb quruluşlu, təbiətin təsirinə məruz qalan, mövcudluqdan ölümə gedən bir maddədir. İkinci isə bədəni kamilləşdirməyə çalışıb, hərəkət edən qüvvəyə tabe olan təmiz, sadə və parlaq ruhdur. O, bədəni təbiətin köməkliyi ilə inkişaf edən, qidalanan, ayrı-ayrı hissələrdən ibarət, mükəmməl forma və özünəməxsus sərhədlərə malik maddə kimi yaratmışdır. Lakin o, təkrarolunmaz ruhu daha kamil və getdikcə daha kamilləşən varlıq kimi yaradıb. Ruh və bədəndən danışarkən mən, gücə və qidaya ehtiyacı olan, hiss və qəzəbi özündə əks etdirən güclü və ya qəlbdən hisslə bütün digər orqanlara yayılan qüvvəni nəzərdə tutmuram. Çünki bu güc və qüvvə heyvani ruh, hiss, hərəkət, ehtiras və qəzəb isə onun ordusudur. Məsələn, mədənin işləməsi nəticəsində yaranan imtahanın gücü fiziki ruhun adını daşıyır. Həzm olma və

bağırsaqların boşalması isə bədənin bütün digər fiziki gücünə bərabər qüvvə sayəsində baş verir. Bədən heyvani ruha xidmət etməklə məşğuldur. Heyvani ruh isə insanın gücünü arzuladığı istiqamətə yönəldə bilir. Ruh isə sadə və mükəmməl substansiya olub vəzifəsi xatırlamaq, fikirləşmək, düşünmək, müəyyən etmək və aydınlaşdırmaqdan ibarətdir. O, bütün elmləri özünə çəkərək heç zaman qeyri-maddi meyllərin qəbul olunmasından yorulmur. Qəlbin mahiyyəti ruh üzərində rəhbərlik edərək onun tabeçiliyindəki bütün qüvvələri özünə itaət etdirir. Ağıllı insanın qəlbini, onun mahiyyətini adlandırmaq üçün müxtəlif ifadələrdən istifadə olunur. Filosoflar onu «ağıllı qəlb», Quranda «rahatlıq tapmış qəlb» və «əmrdən yaranan qəlb», sufilər isə «ürək» kimi adlandırırlar. Adlanma fərqli olsa da, mahiyyət eynidir və bir-birindən fərqlənmir. Bu səbəbdən istər «ürək», istər «qəlb», istərsə də Quranda deyilən kimi «əmrdən yaranan qəlb» olsun, bütün bunlar sadə, fəaliyyətdə olan və dərk edən substansiyadan yaranan «ağıllı qəlbin» müxtəlif formada ifadəsidir. Və ruh, yaxud ürəkdən danışılmasından asılı olmayaraq, hər yerdə biz məhz bu substansiyanı nəzərdə tutacağıq. Sufilər heyvani ruhu «qəlb» adlandırır. Şəriətdə də buna bənzər yanaşma və belə bir deyim var: «Sənin ən qəddar düşmənin sol və sağ böyürlərinin arasında yerləşən qəlbindir».

Baş Qanunvericimiz (Məhəmməd Peyğəmbər (s.)) «qəlb» sözünü işlətməklə bərabər, onun iki böyrümüz arasında yerləşdiyini də vurğulayır. Əlbəttə, bu, iki böyrümüz arasında yerləşən və ehtirasla qəzəbin güc mənbəyi olan ürəyə işarədir.

İndi isə aqillərin qəlbi müxtəlif adlarla ifadə etdiklərini bildikdən sonra bu mükəmməl substansiyanın mahiyyətinə olan fərqli münasibəti də aydınlaşdırmaq lazımdır. Sxolastikada özlərinə məxsus yeri olan mütəqəlimlər qəlbi incə, nazik bədən kimi nəzərdə tuturdular. Onların fikrincə, bədənlə qəlb bir-birindən bir o qədər də fərqlənməyib, yalnız naziklik və incəliyinə görə seçilir.

Bəzilərinin fikrincə, ruh keçicidir. Bu fikrə həkimlərin çoxu inanır. Eyni zamanda, ruhu qanla eyniləşdirənlər də olub. Lakin bütün bu fikirlər yalnız fantaziyaya əsaslanırdı.

Bilmək lazımdır ki, ruh üç növdə olur: bədən, keçici hadisə və təmiz mahiyyət. Heyvani ruh müəyyən bir bədəndir. O, ürəyin yanan fitilidir. Həyat bu fitilin işığı, qan onun yağı, hiss və hərəkət ehtirası, qəzəb tüstüsü, mədəyə olan iştahanın gücü isə onun mühafizəsi, qulluqçusu və nümayəndəsidir. Bu ruh bütün heyvanlarda və insanlarda var. O, özü elə bədəndir. Zahiri xüsusiyyətləri isə

onun nişanələridir. Bu ruh elm və kamilliyin nə olduğunu bilmir. O, yarananları dərk və yaradanın haqqını anlaya bilməz. O, bədənin quludur və onunla birlikdə ölüb məhv olur. Əgər qan çoxalsa, çox qızmadan fitil sönər. Əgər onda çat əmələ gəlsə, o yenə də soyuqdan sönər. Bu sönmə isə ölümə və bədənin məhvinə səbəb olar. Bu ruh Allahın yaratdığı mübarək ruh deyil və dini anlayışların ona heç bir aidiyyəti yoxdur. Heyvanların insanlara çevrilməsi qeyri-mümkün olduğu halda, insanların daxilən dəyişib çevrilməsi mümkündür. Bu, ağıllı qəlb vasitəsi ilə ola bilər. Və bu ruh bədən deyil. İlahinin yaratdığı və keçici olmayan anlayandır: *«De: ruh Rəbbimin əmrindədir» (Quran, 17:85). «Ey (öz imanından, əməlindən və Allahın vədindən) xətircəm olan kəs! (Və ya arxayın nəfs!) Dön Rəbbinə, sən Ondan razı olaraq, O da səndən» (Quran, 89: 27-28).*

Allahın əmri heç bir maddi formaya malik deyil. Bu, hiss edilməyən, heç bir maddə ilə bağlı olmayan təmiz substansiyadır. Ruh və ya bizim dediyimiz qəlb bu cür təmiz, heç vaxt məhv olmayan bir substansiyadır. O, heç vaxt məhv olub boşluğa çevrilmir. Sadəcə, bədəndən ayrılaraq şəriətdə göstərildiyi kimi, Dirilmə gününü gözləyir ki, ona yenidən qayıtsın. Fəlsəfə elmində inandırıcı arqumentlərlə sübut olunub ki, ruh nə bədən, nə də keçici təzahürdür. Onun mahiyyətini təmizlik, əbədilik və həmişəyaşarlıq təşkil edir. Bunu ayrı-ayrı arqumentlərlə sübut etməyə heç bir ehtiyac yoxdur. İstənilən şəxs bu sahə ilə bağlı elmi əsərlərə müraciət edərək, kifayət qədər inandırıcı məlumatlar əldə edə bilər. Bizim tutduğumuz yol arqumentlər və sübutlar yolu olmayıb vəhy, şübhəsizlik və dini inam yoludur.

Qadir Allah bəzən insan ruhunun Onun əmri ilə yarandığına müəyyən işarələr etmişdir: *«Mən onu tamamlayıb (insan şəklinə salıb) Öz ruhumdan üfürən (can verən) kimi ona (hörmət əlaməti olaraq) səcdə edin» (Quran, 38:72). «De ki, ruh Rəbbimin əmrindədir» (Quran, 17:85). «Və Biz libasının yaxasından ona (Məryəmə) öz ruhumuzdan üfürdük» (Quran, 66:12).*

Şübhəsiz ki, Allah-təala ruhdan formalaşaraq murdar, dəyişilən və məhv olan bədənlə özünü heç vaxt əlaqələndirib uyğunlaşdırmazdı. Bu barədə bizim baş Qanunvericimiz, ona Allahın xeyir-duası və salamı olsun, belə buyurmuşdur: «Ruhlar – nizami ordudur». Və o, belə də demişdir: «Əzablı ölümlə vəfat edənlərin ruhu yaşıl quşların boğazında yaşayır».

Forma isə məzmunun ölümündən sonra özü-özlüyündə yox olur. Çünki o, mahiyyəti etibarı ilə əbədi deyil. Bədən isə tibbə aid kitablarda yazıldığı kimi, ölümdən sonra ayrı-ayrı hissələrə parçalanır. Biz Quran ayətləri, hədislər və əqləuyğun nəticələrlə tanış olduqdan sonra başa düşürük ki, ruh sadə, qeyri-maddi, mükəmməl, mahiyyətcə diri olan xüsusi bir substansiyadır. Fiziki və heyvani ruhlar isə bədənin bütün digər qüvvələri kimi onun əmrini yerinə yetirir. Bu substansiya konkret insana, onun dini görüşünə məhəl qoymadan elmi bilikləri əxz edə bilir. Ruh insanı görmədən onun mahiyyətini dərk edə bilər. O, insanın üzünü görmədən mələk və şeytanlığı müəyyən edə bilər. Lakin insan hissi bu mahiyyətə varmaqdan məhrumdur.

Bir sıra sufilərin fikrincə, insanın xarici aləmi görmək üçün gözü olduğu kimi, haqqı görmək üçün də qəlbinin gözü var. Allahın Rəsulu (s.ə.) demişdir: «Yalnız Allahın öz bəndəsinin ürəyində gizlinləri bilməsi üçün iki göz var. Allah bəndəsinin ürəyinə gizlinləri aşkar etmək üçün iki göz verəcək qədər mərhəmətlidir. Və bu ruh bədənlə birlikdə ölmür. Allah onu taxt-tacına çağıraraq buyurmuşdur: *«Rəbbinə dön!» (Quran, 89:28)*.

Lakin o, bədəndən imtina edərək ondan ayrılır. Bu etirazın əsas səbəbi heyvani və fiziki qüvvənin tükənməsi, fəaliyyətin dayanması ilə yaranan ölümdür.

Sufilərin ruha və qəlbə müraciət edib, ümid bəsləməsi şəxsiyyətə və bədənə olan təvəkküldən tamamilə fərqlənir. Ruh, Allahdan olub, bədəndə bir qonaq kimi yaşayır. Onun bütün diqqəti ayrıldığı mənbəyinə yönəlib. Bu səbəbdən ruh qüvvətləndikdən sonra ondan məqsədəuyğun istifadə insana bədəndən daha çox fayda verə bilər.

Ruhun adi substansiya olduğu müəyyən edildikdən sonra bilmək lazımdır ki, hər bir bədən forma, forma isə müəyyən özül tələb edir. Ruh bədəndə yaşasa da, ayrı-ayrı orqanlarla heç bir əlaqəsi yoxdur.

İlk işıq beyində yaranır. Beyinin ön hissəsi – onun mühafizəçisi, orta – məsləhətçi və rəhbər, arxa – onun anbarı sayılır. Bədənin orqanları – onun atlı və süvari gücü, heyvani ruh – onun qulu, fiziki ruh – onun nümayəndəsi, bədən – onun minik heyvanı, dünya – onun üçün səhnə, həyat – sərmayə, hərəkət – ticarət, bilik – qazanc, axirət – onun məqsədi, İlahi qanun – yolu, ehtiraslı qəlb – onun ürəyinin düşməni, xarici hiss – onun köməkçiləri, din – onun

qoruyucusu, ağıl – müəllimi, duyğu – şagirdi, dünyanı Yaradan isə – kənardan ona nəzarət edəndir. Ruh bütün bu qeyd olunan xüsusiyyətləri ilə birlikdə maddiyyata yönəlib bədənlə bütövləşmir. Lakin Allahın bədənə verdiyi zaman daxilində yolunu Allaha tərəf tutub lazım gəldikdə bədəndən istifadə edir.

Deməli, bu dünyada ruh yalnız İlahi bilgilər, elm toplayaraq axirətdə bunlardan özünə bəzək vurmaq istəyir. Bu dünyadakı vardövlətlə isə axirətdə bunu etmək qeyri-mümkündür. Göz görüb, qulaq eşitdiyi, dil dediyi, bədən heyvani hisslərlə yaşadığı kimi, insanın ürəyində rahatlıq tapan ruh da yalnız İlahi bilgilər və elm toplamaqla məşğul olur. O, elmlə gözəlləşir. Lakin əgər onu elmdən başqa nə isə maraqlandırırsa, bu yalnız bədənin maraqlarını müvəqqəti ödəmək üçün edilə bilər. Biz ruhun vəziyyəti, onun iradə və əbədiyyəti, sevgisi, İlahi bilgilər və elmə olan bağlılığını müəyyən etdik. İndi isə elmlərin təsnifatına diqqət yetirməliyik. Hərçənd ki, elmin növü çoxdur, biz çalışacağıq onları qısa şəkildə sadalayaq.

## BİLİKLƏRİN NÖVLƏRİ HAQQINDA BÖLMƏ

Bilmək lazımdır ki, iki cür bilik olur. Allahdan, onun qanunlarından və ağıldan gələn biliklər.

*«Allah bir kəsə nur bəxş etməsə, onun nuru olmaz» (Quran, 24: 40).*

Allah-təala qanunları da iki növə bölünür: əsas biliklər və törəmə biliklər.

Əsas biliklər və ya təkallahlılıq bilikləri Allahın dərki və onun əbədi mahiyyətinin müxtəlif adlar altında öyrənilməsidir. Eyni zamanda bu, peyğəmbərlərin, onların davamçılarının, imamların, onların silahdaşlarının öyrənilməsi, həyat, Qiyamət günü, Allahın rəhmini qazanmaq kimi anlayışların izahıdır. Həqiqi bilikləri öyrənənlərin müraciət etdikləri mənbələr bunlardır: birinci, müqəddəs Quranın ayələri, ikinci, Peyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, hədisləri, üçüncü, əqlə uyğun sübutlar və müqayisə nəticəsində əldə olunmuş nəticələr.

Bu elmin biliciləri dialektikanı və elmlərin bazisini məntiq və fəlsəfədən götürərək bir sıra termin və ifadələrin təyinatına görə istifadə etməyərək qarışdırmışlar. Onlar «məzmun», «for-

ma», «sübut», «arqument» kimi anlayışları müxtəlif qruplarda müxtəlif cür yozublar. Misal üçün, filosoflar «cövhər» (substansiya) sözündən öz təsəvvürlərini, sufilər və mütəkəllimlər isə tamam başqa təsəvvürləri ehtiva ediblər. Elə başqa məsələlərdə də bu hal mövcuddur. Bizim məqsədimiz terminlərin araşdırılması deyil, eyni zamanda biz müxtəlif təlimlərin dini inanclarını da təhlil etməyi qarşımıza vəzifə qoymamışıq. O kəslər ki təkallahlılıq görüşlərində kəlamlara məxsusi diqqət yetirirlər, mütəkəllim adı ilə tanınmağa başlanmışlar. Kəlam haqqında elm isə təkallahlılıq bilikləri kimi qəbul olunmuşdur.

Əsas biliklərə Quranın şərhi daxildir. Çünki Quran ən böyük və dəyərli kitabdır. Burada adi şüurla dərk edilməsi çətin olan çox sayda simvol və ilahi sirlər mövcuddur. Eyni zamanda Quran xeyirxahlıq və rəhm kitabıdır.

Peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, demişdir: «Quran kimi özündə məlum və gizli olanları ifadə edən başqa bir kitab yoxdur. Buradakı gizli olanlar isə özündə daha yeddi sirr saxlayır" (Başqa bir hədisdə isə deyilir: «doqquz sirr»).

Eyni zamanda o buyurmuşdur: «Qurandakı hər bir sözün öz məna sərhəddi var və hər birinin öz ucalıq zirvəsi var».

Qadir Allah agah etmişdir ki, müqəddəs Quranda bütün elmlər və bilgilər, məlum və sirli olanlar, hiss olunan və dərk olunanlar ifadə olunmaqdadır: *«Elə bir şey yoxdur ki, açıq-aydın kitabda olmasın» (Quran, 6: 59).* O həmçinin buyurmuşdur: «(İnsanlar) onun *ayələrini düşünüb dərk etsinlər və ağıl sahibləri də (ondan) ibrət alsınlar» (Quran, 38: 29).*

Quran bütün məsələlərin önündə gəldiyi zaman və oradakı bəzi anlamların izahı çətinləşərkən şərhçi və alimlərdən kim onun sirlərini daha dügzün aça bilər? Bəli, şərhçilər Quranı bildikləri qədər əqillərinin imkanı daxilində şərh etməyə çalışmışlar. Onlardan hər biri nəsə deyib, eyni zamanda heç nə də deməyiblər.

Quran haqqında elm əsas elmlərdən irəli gəlməlidir. Və burada ilahi bilgilər və əqlə uyğun anlayışlar bir-biri ilə əlaqəli şəkildə olmalıdır. Bu baxımdan şərhçidən Quranı müxtəlif yöndə şərh etmək tələb olunur: "Leksika, bəlağət, alleqoriya, qrammatika, fəlsəfə, sufilərin düşüncəsi kimi anlayışlar Quranın şərhində mütləq nəzərə alınmalıdır. Yalnız Quran birtərəfli şərh edilərkən şərhçi istəyinə nail ola bilməz».

Əsas biliklər eyni zamanda hədisləri də əhatə edir. Peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, ərəblər və qeyri-ərəblər arasında öz bəlağəti ilə hamını heyran edirdi. Onun Allahdan gələn müəllimi bu bilgiləri ona vəhylə vermişdir. Onun hər sözü, hər ifadəsi sirlər dəryası, pünhanlar xəzinəsidir. Bu baxımdan peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, haqqında olan deyimləri və hədisləri mütləq bilmək lazımdır.

Peyğəmbərdən başqa, heç kim ilahi bilgilər haqqında onun qədər məlumata malik ola bilməz. Heç kim onun kimi hər sözün, hər ifadənin məna dərinliyini şərh edə bilməz. Şərhçilər yalnız Quranda buyrulmuşları, məsləhətləri yerinə yetirməyə, qəlblərini və ruhlarını şəriətə uyğun olaraq təmiz saxlamağa qadirdirlər.

Quranı şərh etmək istəyən hər hansı bir şərhçi ilk növbədə leksikologiyanı bilməli, sintaksisi mükəmməl qavramalı, morfologiya qanunlarından xəbərdar olmalıdır. Çünki leksikologiya digər elmlər üçün bir nərdivandır. Onu bilmədən başqa elmlər haqqında bilgilər toplamaq mümkün deyil. Sözsüz ki, müəyyən mərhələyə ucalmaq istəyən özü üçün nərdivan müəyyən etməli və onunla yuxarılara qalxmalıdır. Leksikologiya başqa elmlər üçün də bir qalxma vasitəsidir. O, hər hansı bir qanunun təməli və əsasıdır. Bu baxımdan bilgilərə can atan insan leksikoloji bilgilərlə silahlanmalıdır.

Leksikologiyanı öyrənmək üçün ilk addım hərflərdən başlayır. Hərflər sözləri təşkil edən hissəciklərdir. Daha sonra fellər öyrənilməlidir. Məsələn, 3-4 hərfli fellərdən başlamaq olar. Leksikoloq ərəb poeziyasını, xüsusən də islama qədərki ərəb poeziyasını diqqətlə mənimsəməlidir. Çünki bu dövr ərəb poeziyası ruha qida olaraq, daşıdığı məna dərinliyi ilə ən gözəl ərəb poeziyası sayıla bilər.

Lakin leksikologiyanı, hərfləri, ərəb poeziyasını dərindən öyrənmək qrammatikadan uzaq olmaq demək deyil. Leksikologiya üçün qrammatika qızıl və gümüş üçün tərəzi, fəlsəfə üçün məntiq vacib olan qədər əhəmiyyətlidir. Aydındır ki, hər hansı bir əşya lazımi tərəzidə ölçülməsə, onun dəyər və əhəmiyyəti məlum olmaz. Ümumiyyətlə, leksikologiya Quranın, hədislərin şərh edilməsində ən vacib silahlardan biri olmaqla təkallahlıq elmlərini isbat etmək üçün əhəmiyyətli anlayışdır. Təkallahlıq elmlərini dərk etmədən isə insan ruhu həqiqəti dərk edib, xilas ola bilməz. Onsuz Qiyamət günü qurtuluş yoxdur.

İlahi biliklərin ikinci hissəsini isə törəmə bilgilər və yaxud da ilahi bilgilər təşkil edir. Məsələ bundadır ki, elmlər nəzəri və praktik olur. Əsas bilgilər nəzəri, törəmə isə praktikdir.

**Nəzəri bilgilər özündə üç cür qanunu ehtiva edir:**

**1.**Allaha itaətin əsasları: dəstəmaz almaq, namaz, oruc, zəkat, həcc, cihad, bayram, cümə namazı və s.

**2.**Allahın bəndələrinin bir-birinə olan hüququ bu ictimai münasibətlərdən asılı olaraq, iki hissəyə bölünür:

Müəyyən münasibətlər aparan hüqüq, məsələn, ticarət, tərəfdaşlıq, xeyriyyəçilik və s. Və birtərəfli hüquqlar: nigah, boşanma, qul olmaqdan qurtuluş, varislik məsələləri. Bu iki qanun fiqh anlayışı ilə ifadə olunur. Fiqh bilgiləri bütün insanlara vacib və hamının maraqlarına cavab verdiyi üçün çox lazımlıdır.

**3.**İnsanın öz ruhuna qarşı olan haqq və hüququ. Burada şəxsi xüsusiyyətlərin dərki vacib rol oynayır. Əgər xüsusiyyətlər pisdirsə, onlardan uzaq, yaxşıdırsa, onlara yaxın olaraq ruha bəzək vermək lazımdır. Nəyin yaxşı, nəyinsə pis olduğu müqəddəs Quranda və hədislərdə aydınlaşdırılmışdır. Yaxşı xüsusiyyətlərlə özünə bəzək vermək istəyən insan əbədi cənnətdə özünə rahatlıq tapar.

Birinci bölgünün ikinci növ bilgiləri isə, yəni əqlə uyğun bilgilər çox mürəkkəb anlayışdır. Burada haqq, həqiqət bulunduğu kimi, onun əksi də var. Bu bilgini üç kateqoriyaya bölmək olar:

Birinci kateqoriya özündə riyazi bilgiləri və məntiqi ehtiva edir. Riyazi bilgilər cəbr (rəqəmlərə aid elm), həndəsə (ölçülər haqqında elm), astronomiya (göyü, ulduzları və bununla bağlı bütün anlayışları öyrənən elm) kimi bilgiləri öyrənir. Müəyyən doğum günləri və bununla bağlı yozumlar da bu elmlərdən irəli gəlir. Musiqi haqqındakı elmləri də riyazi elmlər kateqoriyasına daxil etmək olar. Çünki burada sim və akkordların uyğunluğu göstərilir.

Məntiq isə insanların düşüncələri anlamaq üçün apardıqları axtarışlar, mühakimələrin sərhəd və qanunauyğunluqları arqumentlər haqqında olan düşüncələr elmidir. Buna əsaslanaraq deyə bilərik ki, məntiq bilgiləri ilk öncə hissələri, daha sonra isə bütövü mühakimə etməklə məşğuldur.

İkinci və yaxud keçici kateqoriya olan təbii bilgilərdə bütöv haqqında danışılır. Onun əsasları, forması, hərəkəti, ona təsir edən anlayışlar öyrənilir. Burada ruhun, bədənin, hissiyyatın, tibbin, canlı orqanizmlərin sirləri saxlanmaqdadır. Bu bilgilər qrupuna meteorologiyanı, minerologiyanı, kimyanı daxil etmək olar.

Üçüncü ən ali kateqoriya isə gerçəklik, onun təsadüf və zərurətləri, bu dünyanı yaradan, onun fəaliyyətinin keyfiyyəti, istəyi, əmrləri haqqındadır. Eyni zamanda burada ən adi substansiyalar, abstrakt intellekt, kamil qəlb, mələk və iblis qüvvələr, müqəddəs ruhlar kimi anlayışlar da var. Bu bilgilərin törəməsi isə cadugərlik, sehrbazlıq və ona bənzər anlayışlardır.

Bu qeyd olunan bilgilərin hər birinin xarici göstəricisi, əsas hissələri, müəyyən izahları və izaha ehtiyacı olan sirli anlayışları, mühakimələri vardır.

Ümumiyyətlə, əqlə uyğun elmlər çox sadə anlayışlardır. Lakin ondan yaranan bir sıra anlayışlar adi bilgilər formasında olsa da, müəyyən xüsusiyyətlərə malikdirlər. Məsələn, təsəvvüf və sufi. Sufilər haqqında elmlər və yaxud sufi yolu özündə 2 bilgini – əqlə uyğun və ilahi qanunlardan gələn anlayışları birləşdirir. Yəni ekstazı, təmizliyi, qeyb olmanı, faniliyi, ilahi sevgini. Allah qoysa, ayrı bir əsərdə biz bu anlayışlar haqqında ətraflı danışarıq. İndi isə bizim əsas məqsədimiz bilgilərin sayı və növü haqqında qısa və eyni zamanda geniş məlumat verməkdir. Biz müəyyən mənada bunu etdik. Daha ətraflı məlumat almaq istəyənlər bu sahədə yazılmış kitablara müraciət edə bilərlər.

Bilgilər haqqında təsnifat bitdikdən sonra isə mütləq bilmək lazımdır ki, hər hansı bir elmi biliyi dərk etmək üçün xüsusi şərait olmalıdır. Bunsuz bu bilgiləri dərk etmək qeyri-mümkündür. Bilmək lazımdır ki, hər elmin özünəməxsus öyrənilmə yolu var. Bu yollar elmlərin açarıdır. Və onlar haqqında ətraflı məlumat vermək lazımdır.

## ELMİ BİLİKLƏRİN ƏLDƏ EDİLMƏSİ YOLLARI

Bilmək lazımdır ki, insan elmi bilgilərə iki yolla nail olur:
Birinci insanın təhsili, ikinci isə ilahi vəhy, vergidir.

Birinci yolla bütün ağıllı insanlar müəyyən elmi biliklər əldə edirlər. Lakin onun da iki yolu var. Onlardan birincisində bilgilər ən ali təhsil vasitəsilə dərk olunur.

İkincidə isə bu bilgilər mühakimə və düşünmə vasitəsilə qavranılır. Düşünmə və mühakimə təhsil prosesində əldə edilən bacarıqdır. Bilgilərin kimdənsə əxz edilməsi elmin, təhsilin xarici

forması kimi qəbul edilə bilər. Mühakimə və düşüncə isə daha çox daxili forma kimi qəbul olunub, insanın ruhu ilə bağlıdır. Sözsüz ki, ümumi ruh anlayışı hər hansı bir alim insandan və yaxud da müəllimdən daha güclüdür.

İnsan qəlbində olan bilik yerə basdırılmış bir buğda və yaxud dəryanın dibində gözə görünməyən qiymətli daş-qaşdır. Özünətəhsil (təəllüm) mümkünü real etmək, təlim isə hansısa anlayışı praktik fazaya çevirməkdir. Bu baxımdan müəllimlə onun şagirdinin müəyyən ruhi oxşarlığı olmalıdır. Nəyi isə izah edən müəllim əkinçidir. Şagird - əkin sahəsi, bilgi – toxum, həyata keçirilmiş elm, məlumat isə sanki bir bəhərdir. Kamillik zirvəsinə ucaldılmış şagird qol-budaq açmış bir ağaca bənzəyir.

Hər dəfə ki şagirdin ruhuna onun nəfsi qalib gəlməyə çalışır, bu zaman o, elm, bilgi qazanmaq üçün daha artıq əzmkarlıq göstərməli, vaxtına heyflənməməlidir. Və əksinə, ruh bədənin üzərində qələbə qazandıqda şagird öz düşüncələri və mühakimələri ilə qısa zaman ərzində, hətta bir il müddətində əldə edə bilməyəcəyini mənimsəyə bilər.

Bu baxımdan bəziləri elmi təhsil yolu ilə, digərləri isə mühakimə və düşüncələri ilə qazanır. Lakin istənilən halda, insan oxuyub mənimsəməkdən başqa, düşünüb dərk etməlidir. Çünki yalnız mexaniki oxumaqla elmi biliklərə yiyələnmək mümkün deyil. Və eyni zamanda insan oxuya-oxuya öz mühakimə və düşüncələrini daha kəsərli edə bilir. Əqlə uyğun biliklərin çoxu, fəlsəfi və digər elmi kəşflər, əsasən məhz mühakimə və dərketmə gücü vasitəsilə əldə edilmişdir. Əgər belə olmasa idi, insan hər şeyi yalnız təhsil vasitəsilə əldə edə bilərdi. Lakin deyildiyi kimi, bir sıra anlayışlar təhsil, digərləri təcrübə, üçüncüsü isə ruhun təmizliyi və dərrakə ilə əxz edilir. Məhz sonuncu alimlərin ən əsas iş prinsipidir.

Məsələn, həndəsə ilə məşğul olan yaşadığı ömür ərzində ehtiyacı olan hər şeyi öyrənə bilməz. O, həndəsənin əsaslarını, ümümi qanunauyğunluqları qəbul etdikdən sonra müəyyən müqayisələr apararaq hər hansı bir elmi fikrə gəlir. Eyni zamanda həkim bütün xəstəlikləri və dərmanların təsir gücünü öyrənə bilməz. Həkimlərin çoxu müalicəyə əldə etdikləri ümumi tibbi anlayışlar mövqeyindən yanaşırlar. Astroloqlar da həmçinin, astrologiyanın ümumi anlayışlarını öyrəndikdən sonra müəyyən nəticələr əldə etmək üçün öz şəxsi düşüncə və mühakimələrini tətbiq edirlər. Bu qanun digər anlayışlar üçün də keçərlidir. Məsələn, musiqidə kim-

sə əqlinin gücünə, digəri isə musiqi alətlərinin imkanlarına əsaslanaraq nə isə yarada bilir. Bütün ruhi, fiziki iş və məşğuliyyətlər də birinci mərhələdə təhsil, daha sonra isə düşünmə və mühakimə yolu ilə əldə edilir.

İnsanın ağıl və düşünmə imkanları açıldıqdan sonra o, düşünmənin, mühakimənin verdiyi güc və qüvvə ilə sirr və pünhan olanları agah edə bilər. İkinci yol isə - ilahi vəhy - özlüyündə iki növə ayrılır: birinci, vəhydir. Vəhy insan ruhu kamilliyə çatdığı zaman insana agah olur. Bunun üçün ruh fiziki günahlardan, arzu və istəklərdən, dünyəvi zövqdən, ehtirasdan, maddiyyatdan uzaq olub, Yaradanına istiqamətlənməli, yalnız Ona, Onun rəhminə güvənməlidir. Belə olduqda Qadir Yaradan bu ruhu öz rəhmi və diqqəti ilə mükafatlandırır. Ona ilahi bilgilər haqqında məlumatlar verir.

Kamil ruh sanki şagird, ümümi şüur isə müəllimdir. Bu müəllim vasitəsi ilə şagird bütün həqiqət və bilgiləri öyrənmədən əldə edə bilir. Bilgilər onun qəlbində kağız üzərində olduğu kimi əks olunur. Buna sübüt olaraq böyük Peyğəmbərimizə, ona Allahın xeyir-duası və salamı olsun, nazil olmuş bu ayəni göstərmək olar: *«Çünki Allah sənə Quranı və hikməti nazil edərək bilmədiklərini öyrətdi» (Quran, 4: 113).*

Peyğəmbərlərin bilgiləri bilgilərin ən müqəddəsi və ən alisidir. Çünki bu bilgilər heç bir vasitəçi və hər hansı bir xüsusi üsul olmadan Yaradan tərəfindən bəxş edilmişdir. Bu mövzu ilə bağlı Adəm əleyhissəlamın və mələklərin həyatını misal gətirmək olar. Mələklər uzun illər ərzində müxtəlif üsullarla elm və biliklər toplamış, haqqı dərk edə bilmişlər. Bu isə onları Allahın yaratdığı ən bilgili varlıq səviyyəsinə ucaltmışdır. Adəm əleyhissəlamın isə elm şərbətindən dadması üçün mələklər ona qürurla məzəmmət edərək deyirdilər: «Biz bütün həqiqətləri və bilgiləri bildiyimiz üçün daha mübarək və Allahın xeyir-dualı bəndələri sayılırıq».

Bunu eşidən Adəm gücsüzlük və bacarıqsızlığını hiss edərək Yaradandan ona kömək etməsini diləyir. Qadir Allah ona bütün bilgilər haqqında məlumat verərək mələklərə deyir: *«(İddianızda) doğrusunuzsa, bunların adlarını Mənə bildirin» (Quran, 2:31).*

Adəm qarşısında olan susqunluqlarını görüb mələklərin bütün qürurları heçə endi. Onlar Yaradana müraciət etdilər: *«Sənin bizə öyrətdiklərindən başqa, biz heç nə bilmirik» (Quran, 2:32).* Bu zaman Allah Adəm əleyhissəlama buyurdu: *«Ey Adəm, bunların adlarını onlara bildir» (Quran, 2:33).* Və Adəm əleyhissəlam mələklərə bütün sirli və pünhan olanları öyrətdi.

Bütün aqillər qəbul edirlər ki, vəhy vasitəsilə əldə edilmiş bilgilər təhsil vasitəsilə əldə edilmişlərdən daha qüdrətli və dəyərlidir. Vəhy peyğəmbərlərə məxsus xüsusiyyətlərdir. Qadir Allah Məhəmməd Peyğəmbərdən, ona Allahın xeyir-duası və salamı olsun, sonra vəhy qapılarını bağlı tutur. Böyük Peyğəmbər peyğəmbərlərin sonuncusu, insanların ən kamili və ən bəlağətlisi idi. O deyirdi: «Məni qadir Allah öyrətmiş və kamil etmişdir». Və O, belə də buyurub: «Mən sizlərin ən bilgili olanıyam».

Böyük Peyğəmbərimizin, ona Allahın xeyir-duası və salamı olsun, bilgili olmasının daha mübarək tərəfi isə onun bu bilgiləri ilahi yolla əldə etməsi və heç bir zaman təlim və təhsil almamasındadır. Allah bu barədə belə buyurub: *«Onu çox qüdrətli mələk (Cəbrail) öyrətdi» (Quran, 53:5).*

İkinci növ – İlahi təsir (ilham). İlham elə bir xüsusiyyətdir ki, bu zaman insanın qəlbi paklıq dərəcəsinə görə qadir Allahdan bilik və bacarıq əldə edir. İlham – bir növ vəhydir, çünki vəhy sirli və pünhan olanın açıqlanmasıdır. İlham isə buna işarə və göstərişdir.

Vəhy vasitəsilə əldə edilmiş bilgilər ilm – i nəbavi, ilhamla əldə edilmişlər isə laduni adlanır. Onların hər ikisi ilahi bilgilər olub, Tanrı ilə onun yaratdığı arasında heç bir vasitəçi olmadan ötürülür.

Bunu belə izah etmək olar: vəhy peyğəmbərlərin, ilham isə müqəddəslərin xüsusiyyətləridir. Çünki müqəddəs anlayışı peyğəmbər anlayışından aşağı səviyyədə ölçülür. Bu baxımdan ilham vəhydən aşağı, ilahi açıqlama olan röyadan yuxarı səviyyədədir.

Yuxarıda qeyd edildiyi kimi, peyğəmbərlərin və müqəddəslərin ilahi bilgiləri insanların bildiyi ən ali, ən müqəddəs məlumatlardır. Lakin vəhy vasitəsilə əldə edilən və ilahi ilhamla qazanılan bilgilər yalnız peyğəmbərlərə məxsusdur. Adəm, Musa, İbrahim və Məhəmməd də (onlara salam olsun) məhz belə olmuşdur. Bilmək lazımdır ki, peyğəmbərlik (nübüvvat) risalətdən fərqlənir. Peyğəmbərlik müqəddəs ruhdan qidalanaraq haqq və bilgiləri əxz etmək, daha sonra isə tətbiq etməkdir. Risalət isə bu bilgiləri başqalarına ötürməkdir. Mümkündür ki, hər hansı müqəddəs ruh vəhy vasitəsilə Yaradandan aldığı bilgilərin daşıyıcısı olsun. Lakin hər bir səbəbdən isə onları insanlara çatdırıb izah edə bilməsin.

İlahi bilgilər (ilm-i ladunu) yalnız müqəddəslərə deyil, eyni zamanda peyğəmbərlərə məxsus xüsusiyyətdir. Məsələn, Xızır pey-

ğəmbər əleyhissəlam bu xüsusiyyətə malik idi. Müqəddəs Quranda Qadir Allah bu barədə demişdir: *«Öz dərgahımızdan mərhəmət (peyğəmbərlik və vəhy, yaxud ilham və kəramət) əta etdiyimiz və Öz tərəfimizdən elm (qeybə dair bəzi biliklər) öyrətdiyimiz bəndələrimizdən biri...» (Quran, 18:65).*

Mömünlərin hökmdarı Əli ibn Əbu Talib (Allah ondan razı olsun) bu barədə belə deyib: 'Mən ağzımı tikdim və mənim qəlbimdə o bilgilərdən min qapı açıldı. Və onların hər birinin min qapısı var idi». Bundan başqa, o demişdir: «Əgər mənə bir döşəkcə versəydilər, mən onun üzərində oturub, Tora əhlini Tora üzrə, İncil əhlini İncil üzrə, Quran əhlini isə Quran üzrə mühakimə edərdim».

Bu elə bir zirvədir ki, onu adi insan çalışqanlığı ilə qazanmaq qeyri-mümkündür. Buna yalnız ilahi vergi vasitəsilə nail olub, özünə bəzək vermək mümkündür. Və yenə də Əli (Allah ondan razı olsun) Musanın (Allah ondan razı olsun) kitabları 40 dəfə böyütməsi haqqında belə demişdir: «Əgər Allah məni çağırtdırıb «Əl-Fatihə» surəsini şərh etməyi tapşırsaydı, mən onu 40 dəfə daha da genişləndirərdim». Bu cür böyütmə, genişləndirmə, ilahi bilgisiz yalnız dünyəvi elmlərə dayanaraq qeyri-mümkündür.

Bəli, Ulu Yaradan istədiyi vaxt öz bəndəsini öz rəhmi və bilgiləri ilə mükafatlandıra bilər. Belə olduqda isə bu insan üçün sirli və pünhan olanlar agah olur və o, bu sirləri kimə və necə istəsə şərh edə bilər. Həqiqi müdriklik ilahi bilgilərdən gələn müdriklikdir: *«Allah istədiyi şəxsə hikmət (elm, mərifət, müdriklik) bəxş edər. Kimə hikmət bəxş edilmişsə, ona çoxlu xeyir verilmişdir. Bunu ancaq ağıllı adamlar dərk edərlər!» (Quran, 2: 269).*

O kəslər ki, ilahi bilgilər nərdivanına ayaq qoyublar, onlar öyrənmə və mənimsəmə əzabından qurtarmışlardır. Belələri daha az öyrənib, daha çox öyrədənlərdir. Onların çalışqanlıqları az, rahatlıqları isə uzun sürəndir.

Allah buyurmuşdur: «Mən bu gün sizin üçün sizin dininizi tamamladım!». Bu, ona işarədir ki, insanlara daha yeni din və peyğəmbər lazım deyil. Məhz bu səbəbdən vəhy qapıları bağlanmış, risalət də tamamlanmışdır.

Lakin ilahi təlqin olan ilham qapıları hələ də açıqdır və mübarək ruhdan gələn şüalar daimidir və o, insanlara düşünmək, meyl, həvəs üçün çox vacibdir. İnsanlara yeni Rəsul və Peyğəmbərlik lazım olmadığı halda, ilham həmişə lazımdır. Dünyəvi və maddi hisslərin təsiri altında olub onu öz məngənəsinə çəkən ar-

zulara bölünmüş insana ilahidən bir ziya gərəkir. Bu səbəbdəndir ki, Allah öz iradəsi ilə vəhy qapılarını bağlasa da, böyük rəhm göstərərək ilham qapılarını açıq qoyub. Açıq qoyub ki, insanlar Allahın öz bəndələri üzərində olan rəhmini və arzu etdiyi şəxsə olan fəzilətini heç vaxt unutmasınlar.

## İNSANLARIN BİLİK ƏLDƏ ETMƏ DƏRƏCƏLƏRİ HAQQINDA

Bilmək gərəkdir ki, bütün insanlar ümumi bilgilərə malikdirlər. Bu bilgilər insanların əsasını təşkil edir. Və əgər kimsə bu bilgilərdən uzaq düşübsə, bunun əsas səbəbi kənar qüvvələr ola bilər. Və yaxud Peyğəmbərimiz dediyi kimi: «İnsanlar Allahdan bilgili yaradılıb, lakin iblis onları yolundan döndərir». Və o, belə də buyurmuşdur: «Hər bir doğulan özünəməxsus şəkildə meydana gəlir».

Buna görə də düşünən insanın qəlbi Ümumi ruhdan qida alan bir məkandır. O, istənilən əqlə uyğun formanı qəbul edə bilir. Lakin bu dünyada bir çox qəlblər xəstəliyə düçar olur. Bunun da nəticəsində onlar haqqı dərk etməkdən uzaq olurlar. Digərləri isə əksinə, özlərinin ilkin sağlamlıqlarını qorumaqla bərabər, sona qədər sağlam və təmiz qalırlar.

Sağlam qəlblər – peyğəmbərlərin müqəddəs qəlbləridir. Bura ilahi vəhyin, ilahi təlqin olan ilhamın təsir etdiyi məkandır. Bu qəlblər fiziki dünyada möcüzələr yarada bilər. Onlar yarandıqları kimi sağlamlıq və paklıqlarını qoruyur, xəstəlik və qara qüvvələr onları korlaya bilmir. Bu baxımdan peyğəmbərlər insanların mənəvi həkimləri sayıla bilərlər. Onlar insanları pisliklərdən uzaq olmağa və ilkin formada olan mənəvi qayıdışa çağırırlar.

Bu dünyada xəstə olan ruhlar müxtəlif səviyyədə olurlar. Onlardan bəziləri qısa müddət üçün xəstələniblər. Onların üzərini sanki toz basıb. Bu toz unutqanlıq tozudur. Belələri bilgi və ilahi təlqin alan kimi ilkin sağlam vəziyyətə qayıda bilirlər. Başqa cür desək, bu toz heç də uzun sürməyən müalicədən sonra aradan qalxa bilir. Digərləri isə elə ağır xəstəliyə tutulurlar ki, onlar bütün həyatı boyu elm, bilgi toplayıb sağalmaq yollarını axtarsalar da, ilkin vəziyyətlərinə dönə bilmirlər. Lakin buna baxmayaraq, daxilən mübarizə apardıqları üçün onların qəlbinə cüzi də olsa, ilahi işıq düşə bilir.

Bu, insanın dünyəvi ehtiraslara, maddiyyata bağlılığı ilə əlaqədar olan məsələlərdir. Burada sağlam xəstələnə, xəstə ruhlu insan isə sağala bilər.

Bu, baş tutduqdan sonra isə, yəni insan ilkin mənəvi vəziyyətinə (hal) qayıtdıqdan sonra ilahi bilgilərin (ilm-i-laduni) mövcudluğunu qəbul edir. Onlar qəbul edirlər ki, ilkin formada insanlar ilahi bilgilərə malik olmuş, lakin maddi dünyaya olan bağlılıq onları qaranlıq dünyaya çəkmişdir.

Qeyd olunduğu kimi, qəlbdə baş verən xəstəliklərin əsas səbəbi maddiyyata, bədənə olan bağlılıq, arzulara olan istəkdir. Bu, uşaqlarını çox sevən atanın bütün varlığı ilə onlara bağlanıb tərbiyə verməsinə bənzəyir. Bu yolu tutan ata özü özünü unudur. Və yalnız övladları ilə yaşayır. Bunu qəlbə də aid etmək olar. Qəlb də bəzən bütün varlığı ilə bədənə bağlanıb onun üçün yaşayır. Və özünü maksimum dərəcədə unudur, maddi həyata bağlanır. Belə olduqda isə onun qurtuluşu üçün ona müəllim gərəkdir. Elə müəllim ki, qəlbə unudulanları və əldən çıxarılanları xatırlatsın.

Təhsil və öyrətmə şəxsiyyətin daxili aləmində olanların özünəqayıdışından başqa, bir şey deyildir. Beləliklə, ona özünü kamillik və xoşbəxtlik həddinə çatdırmaq lazım gəlir. Zəif qəlblər bu məqsədə özləri çata bilmədikdə onlara müəllim rəhbər tələb olunur ki, bu mərhələni qət edə bilsinlər. Elə, xəstə ilə də belə olur. O, özünü müalicə edə bilmədikdə, lakin sağalmaq və rifaha qovuşmaq istədikdə bir həkimə müraciət edir, öz qüsurunu ona bildirərək ondan sağalmaq, vəziyyətinə qayıtmaq üçün kömək diləyir.

Elə həkimlər var ki, bir sahə üzrə, məsələn, baş və yaxud sinə ağrıları üzrə mütəxəssis olduqları halda elə bu xəstəliyə tutulub bütün bildiklərini unudur, hətta keçmişdə mənimsədiklərini də yaddan çıxarırlar, lakin xəstəlik aradan qalxan kimi bu unutqanlıq da aradan qalxır və o, əvvəlki bildiklərini xatırlayaraq xəstəliyə qədərki vəziyyətinə qayıda bilir.

Beləliklə, biz əmin olduq ki, bilgi, elm yox olmur. Sadəcə, unudulur. Bu iki anlayış arasında isə böyük fərq var. Unutmaq müvəqqəti anlayışdır. Necə ki, bulud və ya onlar insanın gözündən günəşi gizlədə bilirlər. Lakin günəş yer kürəsinin bir tərəfindən başqa yerinə dövr edib yenidən doğduqda, o yenidən qayıdır. Günəş heç vaxt yox olmur.

Bütün bunlardan sonra aydın oldu ki, xəstəliyə düçar olmuş qəlb qısa zaman keçdikdən sonra öz əvvəlki sağlam vəziyyətinə

elə də ağır əzmkarlıq tələb edilmədən tam halda qayıda bilər. Bunun üçün azacıq xatırlatma, diqqətlə düşünmək lazımdır.

Unudulmuş xatirələr onların xatirəsində yenidən canlanacaq, qəlbin bildikləri isə yenidən cuşa gələcəkdir. Belə olduqda isə onlar ilahi bilgiləri, onların dəyərlərinin insanı necə bəzədiyini dərk edə bilir. Onlar bu bilgiləri mükəmməl şəkildə şərh edərək əşyaların mahiyyətini, həyatın anlamını qavraya, bununla da kamil bilgili alim səviyyəsinə ucala bilərlər. Məsələnin sevgiyə, ehtirasa və ya Allaha olan məhəbbətə yönəlməsindən asılı olmayaraq, onlar hər şeyi öz qəlb aləmi ilə müqayisə edib, kindən, küdurətdən, qəzəbdən, qisasdan, maddi bağlılıqdan uzaq olmağa çalışacaqlar. Belə olduqda isə bu səviyyə və mərhələyə çatanlar xilas olacaq. Xoşbəxtlik və Allahın rəhmi kimi bütün insanların arzuladığı nemətə nail ola biləcəklər.

## İLAHİ BİLGİLƏRİN HƏQİQƏTİ VƏ ONUN ƏLDƏ EDİLMƏSİ ÜSULLARI

İlahi bilgi ilahi təlqinin ruh yarandıqdan sonra ona olan təsiri ilə bağlıdır. Qadir Allah bu haqda demişdir: *«And olsun nəfsə (ruha) və onu yaradana» (Quran, 91: 7)*. Bu cür təsir isə üç yolla olur:

**Birinci**, bilgi əldə etmə və ondan mümkün qədər istifadə etmə.

**İkinci**, insanın özünə diqqət etməsi və ədalətlə, Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, bu haqda belə buyurmuşdur: «Bilən bu bilgini Allahdan alaraq bilmədiklərini dərk edir». Və o, belə də buyurub: «Allaha 40 gün səmimiyyət göstərən insana Allah-təala müdriklik zirvəsi bəxş edər».

**Üçüncü,** düşünmə üsulu ilə, yəni qəlb bilgi əldə etdikdən sonra bildiklərini ətrafındakılarla əlaqələndirib, müəyyən fikirlər əldə edir. Bu zaman onun qarşısında pünhan olanlar açılır. Necə ki, ticarətçilər qarşısında gəlir imkanları açılır. O, bu qapılardan istifadə etmədikdə isə iflasa uğraya bilər.

Düşünən insan öz ağlı ilə hərəkət etsə, özünə sarvan ola bilər. Onun qəlbində gizli dünyanın pəncərəsi açılır. O, kamil, müdrik, ilhamdan qidalanan bir bəndəyə çevrilir. Bu barədə Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, belə buyurmuş-

dur: «Bir saat elm öyrənmək 60 il ibadət etməkdən yaxşıdır» (Bəzi yerlərdə: «70 il» və ya «1 il»).

Düşünmək və elm mənimsəməni biz başqa bir əsərdə geniş şəkildə şərh etməyə çalışacağıq. Çünki bu məsələ izah və açıqlamaya ehtiyac duymaqdadır.

Allahın köməkliyi ilə biz bu əsəri tamamlayırıq. Kim ki ilahi işıqdan faydalanmışdır, bu əsərin gücünü dərk edə bilər.

Allah iman əhlini qorusun, biz isə onun mömin qulu olmaq yollarını axtaraq. Eşq olsun Məhəmməd peyğəmbərə!

Allah bizim gözəl, rəhmli Müdafiəçimizdir. Ondan qüdrətli və ondan güclü kimsə yoxdur. Mənim ümidim hər zaman Onadır. Həmd olsun dünyanın hakimi Allaha!

## ÖN SÖZ

*Rəhman və rəhmli olan Allahın adı ilə!*

Dünyanın hökmdarı Qadir Allaha və peyğəmbərlərin davamçısı Məhəmmədə, onun nəslinə və davamçılarına həmd olsun!

İmam əl-Qəzali öz düşüncə və təfəkkür tərzi ilə insanlıq aləmində böyük bir mədəniyyət zirvəsini təşkil edir. O həm İslam, həm də dünyəvi təfəkkür və mədəniyyətə təsir edə biləcək dahiyanə bir biliyə malik idi. Onun əqli onun düşüncələrinin geniş diapazonda yayılmasının əsas meyarı olmuşdur. Zənnimcə, bunun əsas səbəbi Ulu Yaradanın (həmd olsun ona) ona bəxş etdiyi bacarıqda və bu böyük şəxsiyyətin iradə və əzmkarlığı ilə mütləq həqiqət axtarışında olmasıdır.

Bu kitab – «Nur taxçası» həqiqət axtarıcısı olan əl-Qəzalinin yüksək səviyyəsinin əyani nümunəsidir.

Hərçənd ki, əl-Qəzali öz giriş sözündə bu kitabın İlahi ziyaya olan sirlərin cavabı kimi qələmə alındığını bildirmişdir, lakin həqiqətdə isə bu onun müəyyən səviyyəyə qaxmasını və cəmiyyətdəki mövqeyini sübut etmək üçün yazılmış bir kitab kimi dəyərləndirilə bilər.

Əl-Qəzali bu şüalar haqqında olan sualları «Nur» ayətinin təfsiri və pərdə haqqında hədislə açıqlamağa çalışmış və bu izahı da üç hissəyə bölmüşdür:

Birinci hissədə o, «işıq» anlayışını şərh etmiş və bildirmişdir ki, onun vasitəsi ilə biz əşyaları olduğu kimi görürük. Bu hissənin sonunda o, belə bir fikrə gəlmişdir ki, Allah (O, hər şeyə qadirdir, həmd olsun Ona) – Həqiqi İşıqdır və O, hər şeyi görünən, aydın edir. Bu işığı dərk etmək və ona nail olmaq qeyri-mümkündür. O, mahiyyət deyil, lakin beyinlərdə yaşayandır. Onun köməkliyi ilə isə biz şeyləri dərk edirik.

İkinci fəsildə isə əl-Qəzali Ona (həmd olsun Ona!) şüanın, çırağın, şüşənin, ağacın, yağın, işığın bənzədilməsi haqqında danışır. Daha sonra müəllif məhv olmuş qəlblər haqqında söhbət açaraq, bunun nə anlam daşıdığını bildirir.

Sonuncu - üçüncü fəsli o, pərdə haqqında hədisə həsr edərək pərdənin, ona bürünənlərin və onların kimlər olduğu haqqında məlumat verir.

Ey oxucu, bu kitabla səni tək qoymazdan öncə qeyd etmək istərdim ki, bir çox tədqiqatçılar işraqilik fəlsəfəsini abstrakt sayaraq, onu fəlsəfi nəzəriyyə kimi qəbul edirlər. Onların fikrincə, əl-Qəzali islami baxışla bu fəlsəfəni əlaqələndirməyə çalışmışdır. Bu əlaqənin bir tərəfi ayət və hədislər, digər tərəfi isə iskəndəriyyə nəzəriyyəsidir.

Hər halda mən bu fəlsəfi problemi mütəxəssislərin şərhinə buraxıram, çünki mən filosof deyiləm və fəlsəfəni öyrənməmişəm. Mən bu işi bu fəlsəfi problemi daha yaxından bilənlərə etibar edirəm. Lakin diqqətləri iki mühüm amilə cəlb etmək istərdim:

Birinci, tədqiqatçı nəzərə almalıdır ki, bu nəzəriyyə həqiqət axtarıcısı olan əl-Qəzalinin düşüncə tərzinin məhsuludur.

İkinci, bu cür kitablar kütlə üçün yox, müəyyən qrup insanlar üçün nəzərdə tutulmuşdur.

Mənə qaldıqda isə mən əl-Qəzalini oxuyub, onu qəbul edənlərə bu kitabı təqdim edir, onunla razılaşmayanlara isə əqləuyğun düşüncə tərzi və cəlbedici yaradıcı təfəkkür arzulayıram.

*Doktor Badi Səid*

***Rəhman və rəhmli olan Allahın adı ilə!***

İşıq saçan, göz verən, sirləri agah edən və pərdələri qaldıran Allaha həmd olsun. Və işıq şüası olan möminlərin rəhbərləri, Yaradanın sevimlisi, bağışlananların elçisi, cəzalandıranın xəbərçisi, kafirləri cəzalandıran, günahkarları haqqa dəvət edən Məhəmməd Peyğəmbərə, ona Allahın xeyir-duası və salamı olsun və onun təmiz, pak, işıqlı nəsli və davamçılarına eşq olsun!

Ey mənim qardaşım! Qoy Allah Özü sənə ən qiymətli rahatlığı tapmaqda kömək etsin, qoy O, Özü səni ən uca zirvəyə qaldırılanlardan biri etsin, qoy Özü səni həqiqət işığı ilə nurlandırıb, gözlərinə ziya versin. Sən məndən soruşdun ki, nə qeyri-həqiqətdir! Və mənim sənə ilahi şüanın sirləri haqqında məlumat verməyimi istədin. Onun sünnə və Quranın sətiraltı mənalarında gizlənmiş mahiyyətini soruşdun.

Bu sözlər bunlardır: *«Allah göylərin və yerin nurudur. Onun nuru içində çıraq olan bir taxçaya bənzər. Taxçadakı o çıraq bir qəndilin içindədir, o qəndil isə sanki bir parlaq ulduzdur. O çıraq nə şərqdə, nə də qərbdə (aləmin ortasında) olan mübarək bir zeytun ağacından yandırılır. Onun yağı özünə od toxunmasa da, sanki işıq saçır. O, nur üstündə nürdur!» (Quran, 24:35). Və «(Kafirlərin əməlləri) əngin dənizin zülmətinə bənzər. Onu bir dalğa, o dalğanın üstündən bir dalğa, onun da üstündən bir bulud (dalğa) – zülmət üstündən zülmət örtər. O, əlini çıxartdıqda, hardasa onu görməz. Allah bir kəsə nur bəxş etməsə, onun nuru olmaz!» (Quran, 24: 40).*

Sən soruşdun ki, elm, bilik şüadadır, şüşədə, lampada, yağda, yoxsa oduncaqdadır? Bir də sən soruşdun ki, Məhəmməd Peyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, bu hədisini şərh edin: «Allahın yetmiş min zülmət və işıq pərdəsi var. Əgər o, bu pərdələri qaldırsaydı, onun üzünün işığı ona baxan hər kəsi yandırıb-yaxardı». Sən bu sualla elə bir yüksəkliyi dərk etmək istəyirsən ki, hətta adi insan üçün bu yüksəkliyi gözlə görmək çətindir. Sən elə bir qapını döydün ki, bu qapı yalnız bilgili insanlar üçün açılır. Həmçinin hər sirri açıb izah etmək də olmaz və hər sirr də açılmır. «Nəcib ürəklərdə sirlər qəlbdəki kimi gizli qalır», - ariflərdən biri belə buyurmuşdur. İlahi sirləri açmaq kafirlikdir. Və ya

əvvəlkilərin davamçısı olan Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, belə buyurmuşdur: «Gizli bilgilər var ki, Allahı bilənlərdən başqa, heç kəsə agah deyil».

Əgər onlar bu sirləri agah etsələr, yalnız qanacaqsız insanların övladları onlara əks çıxarlar. Belə qanacaqsızların nə qədər olmasından asılı olmayaraq, bu sirlər günahkarların nəzərindən uzaq saxlanmalıdır.

Lakin mən güman edirəm ki, Allah sənin qəlbini işığa qərq etmişdir, sirr isə zülmət kobudluğundan təmizlənmişdir.

Mən bu gözəl ilahi anlayışları səndən gizlədəcək dərəcədə xəsis deyiləm.

Şair demişkən:

Axmaqlara elm verən onu itirir,
Aqillərdən onu gizlədən günah edir.

Lakin sən bu mövzu ilə bağlı kiçik təfsirlə kifayətlənməli olacaqsan, çünki bu suala tam cavab vermək üçün mən onun əsaslarını, mahiyyətini ətraflı şəkildə şərh etməliyəm ki, buna da hazırda kifayət qədər vaxtım yoxdur. Bütün ürəklərə olan açarlar Allahdadır. O, istədiyi zaman, istədiyi şəxslərə və istədiyi üsulla onları açır. İndi isə sənə bu məsələ ilə bağlı 3 fəsil təqdim ediləcəkdir. Onlardan birincisi aşağıdakıdır.

I Hissə

# İŞIQ VƏ ŞÜA: İLKİN BİLGİLƏNMƏ

Həqiqi işıq Allahdır, «işıq»la bağlı olan bütün digər anlayışlar isə keçici anlam daşıyır. Bütün bu hallarda işıq sözü həqiqi mahiyyətini daşımır. Bunun izahı aşağıdadır.

**1. «İşıq» «fiziki işıq» kimi. Yəni Ağıl və ya Göz kimi.**
Sən bilməlisən ki, «işıq» sözü üç mənada işlənir. Birinci, çoxlarının başa düşdüyü məna, ikinci az qisim seçilmişlərin başa düşdüyü məna və üçüncü çox azların bir qisminin, ən seçilmişlərin başa düşdüyü məna.

Daha sonra sən xüsusən sonuncu iki mənanın mahiyyətini anlamalısan. Bu mənaların həqiqət mərhələlərini dərk etməlisən ki, növbəti mərhələ sənin üçün daha asan olsun. Sən bilməlisən ki, Allah ən ali işıqdır.

Daha sonra həqiqi mahiyyət sənə aydın olduqdan sonra hər pilləyə qalxdıqca dərk edəcəksən ki, əsil işıq olan Allahdan başqa, hər hansı bir işıq və şüa yoxdur.

İndi isə birinci mənanı təhlil edək:

Buradakı «işıq» təzahür deməkdir. Təzahür və ya görünmə nisbi məna daşıyır. Buradakı görünmə və ya qeyri-görünmə nisbi məna daşıyır. Bundan başqa görünmə və qeyri görünmə hiss ilə bağlı anlayışlardır ki, onların da ən yüksəyi görmədir. Bunu insanların böyük əksəriyyəti qəbul edir. Eyni zamanda görmə ilə biz şeyləri iki qismə ayırırıq:

Qara cisimlər kimi özü-özlüyündə görünməyənlər

Özü özlüyündə görünən, lakin heç bir şeyi görünən etməyənlər. Məsələn, lampa, yanmazdan əvvəl olan atəş. Buna misal kimi ulduzu göstərmək olar.

3. Görünən və başqa əşyaları da göstərənlər: günəş, ay, yanan lampa, atəş. «İşıq» sözü bu üçüncü kateqoriyaya aid edilir. Bəzən bu, yaranan və parıldayan cisimlərdən çıxıb, qeyri-şəffaf cisimlərə düşən anlayışlar kimi də qəbul edilir. Biz deyirik: «Yer şüa ilə işıqlanır». Və ya «Günəşin şüaları yerin üzərinə qonur». Və ya

«Lampa işığı divara və yaxud paltara düşür». Bəzən isə işıq saçan əşyalar da işıq saçdığı üçün bu adla adlandırılır.

Bundan çıxış edərək demək olar ki, işıq şüası görünən və düşdüyünü də görünən edən anlayışdır. Sanki bir günəşdir. Bu yanaşma və işığın həqiqiliyi onun ilkin anlayışına tam uyğun gəlir.

Biz bilirik ki, işığın mahiyyəti onun görünməsi və ya düşdüyünün görünməsi ilə bağlıdır. Və bu cür yanaşma işıqla onu görən gözün münasibətinə uyğunlaşdırılıb. Çünki günəş görünən olub düşdüyünü göstərsə də, kor insan üçün görünməz olub heç nə göstərmir. İşığı qəbul edən ruh da nəzərdən qaçırılmamalıdır. O, işıq qədər əhəmiyyətli anlam daşıyır. Yox, o hətta işıqdan da vacib mahiyyət kəsb etməkdədir. Çünki məhz onun vasitəsi ilə qavranılır və dərk edilir. İşıq isə yalnız olunan və yaxud dərk etdirəndir. Dərketmə onun köməkliyi ilə həyata keçirilir.

İşıq sözünün altında daha düzgün olardı ki, gözlə görünən və əşyaları görünən edən anlaşılardı.

Beləliklə, insanlar «işıq» dedikdə, göz işığını nəzərdə tuturlar və zəif görən haqqında danışdıqda belə deyirlər: «Gözünün işığı zəifləyib». Çox çətin görənlərə isə «gözünün işığı tutulur», korlar haqqında isə «gözündə işıq sönüb» deyirlər.

Həmçinin bəbək haqqında belə söz işlədilir ki, o, «gözün işığını» yönəldir, onu gücləndirir. Kirpiklərə ilahi müdrikliklə qara rəng ona görə verilmişdir ki, «işığın şüasını» toplasınlar. Gözün ağı haqqında isə belə deyilir ki, onlar «göz işığını» paylaşdırır və onu zəiflədirlər. Belə ki, uzun müddətli ağ əşyaya baxmaq və ya günəşə nəzərləri cəlb etmək «göz işığını azaldaraq, onu zəiflədir». Bunu zəifin güclü qarşısında duruş gətirməsi ilə də müqayisə etmək olar.

İndi artıq sən bilirsən ki, qavrayan ruh nə üçün «işıq» adlanır və bu ad ona hansı səbəbdən daha çox uyğun gəlir. Bu qeyd olunan sözün seçilmişlər tərəfindən işlədilən ikinci mənasıdır.

İndi isə sən bilməlisən ki, fiziki görmə bir neçə qüsura malikdir:

O, özünü görür, lakin başqalarını görmür.

O nə çox uzağı, nə də çox yaxını görür. Və o, pərdə arxasındakını görə bilmir.

O, əşyanın xarici quruluşunu görür, daxili mahiyyətini görə bilmir. O, hissəni görür, bütövü görə bilmir. Müvəqqətini görür, əbədi olanları görə bilmir.

O görərkən çox qüsurlara yol verir; böyüyü kiçik, uzağı yaxın görür. Dayanan hərəkət edən, hərəkət edən isə dayanan görünür. Bunlar fiziki görünüşün yeddi qüsurudur.

Əgər göz varsa və o, bütün bu qüsurlardan uzaqdırsa, «işıq» sözünə daha uyğun bir ifadə tapmaq olmazdımı?

Bil ki, insanın ağlında bir göz var. Və o, belə bir kamilliyə məxsusdur. Bu gözün adı müxtəlif cürdür – ağıl və ya qəlb və ya insan qəlbi. Lakin biz bu terminlərdən uzaq olmağa çalışacağıq. Çünki zəif dərrakəli insanı bu terminlər çoxluğu çaşdırıb, ideyalar çoxluğuna gətirə bilər.

Biz yalnız ağıllı insanı körpə uşaqdan, vəşhi heyvandan fərqləndirən anlayışı nəzərdə tuturuq. Gəlin onu qəbul olunmuş terminologiyaya uyğun olaraq Ağıl adlandıraq.

Deməli, işıq anlayışı ağıla gözdən daha çox uyğun gəlir. Çünki ağıl öz imkanları ilə gözdəki yeddi qüsurdan daha üstündür.

Gəlin birinci qüsurdan başlayaq: göz özünü görmədiyi halda, ağıl həm özünü, həm də ətrafdakıları dərk edə bilir. Ağıl özünü bilikli, qüvvətli hiss edib bu biliyi qəbul edə bilir. O, öz ağlının imkanlarını, onun sərhədlərini də anlaya bilir.

Bu imkanı hər hansı bir fiziki anlamla, məsələn, gözlə əlaqələndirmək mümkün deyil. Bununla bərabər, bunların arxasında bir sirr var ki, onu açıqlamaq çox vaxt aparardı.

Gəlin ikinci qüsura keçək: göz ona çox yaxın olanı və çox da uzaq olanı görmür, ağıl isə bu baxımdan sərhədlərə malik deyildir. Onun üçün yaxın və ya uzaq anlayışı yoxdur. Bir anda o, göylərə ucala, ani də olaraq yerə enə bilər.

Faktlara diqqət etsək məlum olar ki, ağıl «yaxın» və «uzaq» ideyalarını üstələyir. Çünki bu ideyalar yalnız maddiyə aiddir. O, ilahi anlayış olduğu üçün bu anlayışlardan uzaqdır. İlahi anlayış isə Allaha məxsus deməkdir.

Orijinalın nümunəsi olan isə məxsus olduğu törəmə səviyyəsinə qalxa bilməsə də, ona yaxındır.

Bütün bunlar sənin ağlını bu hədis haqqında düşünməyə məcbur edə bilər: «Allah Adəmi öz bənzəri kimi yaratmışdır». Lakin zənn edirəm ki, hazırda bu sual ətrafında daha da dərinə getməyə ehtiyac yoxdur.

Üçüncü qüsur: göz pərdə arxasında olanı dərk edə bilmir. Ağıl isə çox asanlıqla Allahın dərgahına və ümumiyyətlə, göylər pərdəsi arxasında olan hətta Cənnətə də çata bilər. O ən yüksək

dağları fəth edə bilər. O, bu dünyada olan və dünyanın yaxınlığında yerləşən hər şeyi dərk edə bilər.

Şeylərin mahiyyəti ağıl qarşısında sirli deyil. Onu örtən, sirli edən yalnız onun özüdür. Sanki bir göz qapağı kimi altında gizlədilən gözdür. Biz bu məsələyə daha geniş surətdə üçüncü fəsildə müraciət edəcəyik.

Dördüncü qüsur - göz şeylərin yalnız xarici quruluşunu görə bilir. Yəni yalnız nümunəni və formanı. Daxili aləmi, mahiyyəti isə görmək imkanına malik deyil. Ağıl isə şeylərin, sözün əsil mənasında, daxilinə qədər varıb onların sirrini, həqiqi mahiyyətini, substansiyalarını, səbəb və nəticələrini, nədən yarandıqlarını və necə yarandıqlarını, neçə ideal formaya malik olduqlarını, gerçəklikdəki mövqelərini, bir-biri ilə münasibətlərini müəyyən edə bilir. Bu haqda çox uzun məlumat vermək olar. Zənnimcə, qısa və lakonik olsa, daha yaxşıdır.

Beşinci qüsur - göz yalnız mövcud olanın müəyyən hissəsini görə bilir. Digər qavradılan anlayışlar isə onun görmə xaricindədir.

Eyni zamanda o nə iyi, nə səsi, nə dadı, nə istini, nə soyuğu, nə də qavramanı ehtiva edə bilir.

Xeyr, bütün daxili xüsusiyyətlər onun üçün yaddır. Yəni şadlıq, xoşbəxtlik, narazılıq, qəmginlik, ağrı, razılıq, sevgi, iradə, güc, bilik və s. kimi anlayışlar.

Beləliklə, gözün imkanlaırı məhduddur. O, rənglər və formalar dünyasının daxili aləminə vara bilmir.

Ağıl isə biz qeyd etdiyimiz varlıqları və hətta onlardan da gizli və pünhan olan anlayışları görüb dərk edə bilir və hətta inandırıcı mühakimələr yürüdə bilir.

Onun üçün şeylərin daxili sirri agah olur. Gizli formalarda öz sirrini saxlaya bilmir. İndi isə mənə de ki, hansı haqla fiziki göz ağılla bərabər «işıq» adlandırılmağa layiq ola bilər. Bu, qətiyyən mümkün deyil! Bu, sadəcə olaraq, nisbi işıqdır. Ağılla müqayisədə isə zülmətdir.

Göz, sadəcə olaraq, ağılın casusudur. Ağıl ondan müəyyən məlumatları, xüsusən rəng və formalar haqqında anlayışları əldə etməsi üçün istifadə edir. Göz ağılın quludur və o, öz ağasına məlumatlar ötürdükdən sonra ağıl öz dərketmə qanunlarına əsaslanaraq, müəyyən mühakimələr yürüdür.

Eyni zamanda bütün digər qavrama xüsusiyyətləri də ağılın casusları hesab edilə bilər – təxəyyül, fantaziya, yaddaş, xatırlama.

Ağıla qulluq edən başqa xüsusiyyətlər də mövcuddur. Ağıl onları idarə edir və onların arasında bir zadəgan olaraq sərbəst surətdə hərəkət edir. O, öz əyanlarını ona itaət etməyə məcbur edir. Lakin bu haqda uzun-uzadı mühakimə yürütmək çox vaxt apara bilər. Həm də biz bu haqda mənim «Biliklər haqqında düşüncələr» adlı əsərimin yer aldığı «Ağılın xəzinəsi» adlı kitabda məlumat vermişik.

Altıncı qüsur - göz əbədi olanı görmür. Onun gördükləri maddidir. Maddi isə əbədi ola bilməz. Ağıl isə maddi olmayan, yəni fani olmayanlardan da başqalarını görə bilir.

Düzdür, ağılın özünün də qəbul etdiyi anlayışların müəyyən həddi və sonu var. Lakin ağıl həm də sonsuz və əbədi olanları da qəbul edə bilir. Bu haqda uzun-uzadı danışmaq olar. Lakin əgər sən bir misal eşitmək istərsənsə, cəbrdən nümunə çəkmək olar. Bu elmdə ağıl çoxsaylı rəqəmlər qəbul edir. Çoxsaylılıq isə əbədiyyətdir. Daha sonra o, 2-3 saylı rəqəmlər də qəbul edir və burada da müəyyən hədd yoxdur.

Eyni zamanda ağıl onlar arasındakı münasibətləri də dərk edir. Burada da hədd yoxdur. Nəhayət, o, şeylər haqqında bilgisini də dərk edir. O, nəyi bildiyini və nə qədər bildiyini dərk edə bilir. Bunun özü də sonsuzluğa qədər vara bilər.

Yeddinci qüsur - göz böyüyü kiçik kimi görür. O, günəşi nəlbəki boyda, ulduzları isə qəpik boyda görür. Ağıl isə başa düşür ki, günəş və ulduzlar görünəndən çox-çox böyükdür. Göz üçün ulduzlar hərəkətsizdir. Uşaq isə olduğundan böyük görsənmir. Ağıl isə başa düşür ki, uşaq böyüdükcə onun boyu da artır, kölgə genişlənir, ulduzlar isə uzun məsafə qət edərək hərəkət edir.

Peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, Cəbraildən soruşmuşdur: «Günəş hərəkət edir?». Cəbrail cavab verib: «Hə – yox». «Bunu necə başa düşək?» - deyə peyğəmbər soruşduqda o, belə cavab verib: «Mənim hə və yox sözlərim arasından beş yüz il fərq keçdi». Beləliklə, gözün qüsurları həddən artıq çoxdur. Ağıl isə çox-çox uzaqlara vara bilir. Sən deyə bilərsən ki, ağıllı insanlar da çoxsaylı səhvlər edə bilir. Mən isə buna belə cavab verə bilərdim. Onların təxəyyül və fantaziyaları bəzən müəyyən mühakimələrə səbəb olur ki, insanlar səhvən onu ağılla əlaqələndirirlər.

Qısası olaraq deyə bilərik ki, bu cür qüsurların əsas səbəbi daha aşağı səviyyəli anlayışlardır. Bu haqda mənim «Biliklərin ölçüsü» və «Anlamaq sənəti» əsərlərimdə geniş məlumat verilir.

Ağıl təxəyyül və fantaziyasından azad olduqda heç bir səhv edə bilməz. Çünki o, şeyləri olduğu kimi görüb dərk edir.

Ağılın təxəyyülündən uzaqlaşması çox çətin məsələdir. Yalnız ölümdən sonra mümkün olub əsil kamillik zirvəsinə ucalır. Belə olduqda isə səhvlər pərdəsi götürülür. Gizlinlər aşkar olur. Və hər kəs özü üçün topladıqlarını dərk edir: «Bu, necə bir kitab imiş! O, bizim heç bir kiçik və böyük günahımızı nəzərdən qaçırmadan hamısını sayıb yazmışdır!» (Quran, 18:49). «Artıq bu gündən gözündən pərdəni götürdük. Sən bu gün sərrast görürsən!» (Quran 50:22).

Beləliklə, pərdə arxasında gizlənən təxəyyül və fantaziyaların məhsuludur. Bu səbəbdən şəxsi fantaziyaların qurbanı olanın aldanışları və səhv düşüncələri ona deyir: «Ey Rəbbimiz! Biz gördük, eşitdik. İndi bizi qaytar ki, yaxşı işlər görək! Biz (Sənin vəhdaniyyətinə) tam yəqinliklə inandıq» (Quran, 32: 12).

Bu eşitdiklərimizdən başa düşdük ki, hisslə göz arasında müqayisə aparsaq, işıq sözü gözə daha uyğun olanıdır, ağıl isə gözə nisbətən işıq sözünə daha çox layiqdir. Bu iki anlam arasında elə böyük fərq var ki, mütləq ağılı işıq sözünə layiq olan varlıq kimi qəbul etməliyik.

**2.Quran ağılın günəşi kimi**

İndi isə sən bilməlisən ki, insan ağlı hər şeyi düz görsə də, şeylər müxtəlif yönümlü ola bilər. İnsanın ağlı bir sıra hallarda müəyyən biliklərlə ilkin yaranışından silahlanıb. Məsələn, aksiomatik həqiqətlərdə məhz belədir.

Misal üçün, buna sitat olaraq belə anlayışları göstərmək olar ki, bir əşya həm var, həm də yox ola bilməz. Və yaxud hər hansı mühakimə eyni anda həm həqiqət, həm də yalan ola bilməz. Və yaxud hər hansı əşya haqqında olan mühakimə elə eyni başqa əşya üçün də keçərlidir. Və hissə olduğu yerdə mütləq tam olmalıdır.

Misal üçün, qara haqqında bilgi olduğu yerdə rəng haqqında da anlayış olmalıdır. Bu, «insan» və «heyvan» anlayışlarına da aid edilə bilər. Lakin bunun əksini irəli sürmək düzgün deyil. Yəni rəng anlayışı öz arxasınca «qara» anlayışını ehtiva etmir. Və yaxud «heyvan» anlayışının arxasında «insan» anlayışı gizlənməyib.

Bir çox misallar gətirmək olar ki, buradakı anlayışlar bir-biri ilə mütləq surətdə əlaqəlidir. Müəyyən hallar da var ki, onun haqqında ağılda təəssürat oyatmaq üçün ağılı sözün əsil mənasında oyandırmaq, canlandırmaq gərəkdir.

Bu hallara misal olaraq çətin əldə edilən teoremləri göstərmək olar. Bu teoremləri əldə etmək üçün isə beyin fəlsəfənin dialektikasının (kəlam) imkanlarından istifadə etməlidir. Beləliklə, insan beyni, ağlı yaxşı görsün deyə, o, fəlsəfənin şüası ilə işıqlandırılmalıdır. Ən böyük fəlsəfə isə Allahın sözü (kəlam) və əlbəttə ki, Qurandır.

Məhz bu səbəbdəndir ki, Quran ayələri gözə günəş işığı lazım olan qədər beyinə lazımdır. Çünki günəş şüası olmadan insan görə bilməz.

Bu baxımdan «işıq» anlayışı daha çox Qurana aiddir. O sanki bir günəş kimi hər yeri işıqlandırır.

Beləliklə, Quran bir günəşdir, ağıl, gözün işığı baxmadır. Buradan isə bu ayənin mənasını da açıqlamaq olar: *«Allaha, Onun Peyğəmbərinə və nazil etdiyimiz nura (Qurana) iman gətirin»* (Quran, 64:8). Başqa bir ayədə isə deyilir: *«Sizə Rəbbiniz tərəfindən dəlil gəlmişdir. Biz sizə aydın bir nur endirdik»* (Quran, 4:174).

**3. Görünən və görünməyən dünyalar və onların şüaları**

İndi isə sən bildin ki, iki cür göz var: xarici və daxili. Onlardan birincisi hisslər aləminin, özünəməxsus dünyanın gözüdür. Daxili göz isə başqa gözə məxsus olub Allahın dünyasına məxsusdur. Hər iki gözün özünəməxsus günəşi və işığı var. Onların köməkliyi ilə isə gözlər kamillik zirvəsinə qədər ucala bilir. Bu günəşlərdən biri xarici, digəri isə daxili mahiyyət daşıya bilir. Onlardan birincisi görünən dünyaya məxsus olan Günəşdir. O, hisslərlə duyula bilir. O biri günəş isə gizli olan Allahın dərgahına məxsus olan Quran və Allahın digər müqəddəs kitablarıdır.

Əgər sən bunu özündə hiss etmisənsə, Allahın dərgahının qapıları üzünə açılıb. Bu dünyada elə dəyərlər var ki, bütün dünya onun yanında dəyərsiz görünür.

O dünyaya səyahət etməyən, özünü o dünyanın əsiri etməyən insan vəhşi heyvandır. Və o, bizim yaşadığımız cəmiyyətdən çox-çox uzaq düşmüşlərdəndir. Onun vəziyyəti heyvanın vəziyyətindən də ağırdır. Çünki heyvana Allah-təala o görünməz dünyaya uçmaq üçün qanadlar verməyib. İnsana isə o dünyaya uçmaq üçün qanadlar verilmişdir. Quran bu insanlar haqqında belə buyurub: *«Onlar heyvan kimidirlər, bəlkə də (ondan) daha çox zəlalətdədirlər»* (Quran, 7:179).

Qabıq meyvəyə, forma ruha, ideyaya, zülmət işığa, dərinlik yüksəkliyə qeyri-mütənasib olduğu kimi bu hisslər aləmi, bu dünya da Allahın dərgahına elə mütənasibdir. Bu baxımdan Allahın dərgahı daha ayrı dünya və ya ruhlar dünyası, işıq dünyası adlandığı halda, onun əksi olan maddi dünya isə zülmət dünyası sayılır. Lakin belə düşünmə ki, ali dünya deyəndə biz göyləri nəzərdə tuturuq. Hərçənd ki, onlar da bizim dünyaya nisbətən daha «yüksək» sayıla bilər.

Bu göylər bizim qavramamız, dərk etməmiz üçün heyvanlara açdığı imkanlar qədər imkanlar açıb. Lakin insan Allahın dərgahını hələ ki, aça bilmir. Bu ayət həyata keçənə qədər onun içinə daxil ola bilməz: *«Yer başqa bir yerlə, göylər də başqa göylərlə əvəz olunacaq»* (Quran, 14: 48).

Hiss və təxəyyül aləminə daxil olan hər şey, hətta göylər də onun üçün yer sayılır. Göy isə hissdən kənar anlayışdır.

Allah dərgahına ulaşmaq istəyən hər bir zəvvar üçün bu, ilkin mərhələdir. Çünki insanlıq həyatın dibindən ən uca zirvələri dəf etməlidir. Lakin mələklərdə isə vəziyyət tamam başqa cürdür. Onlar Allahın dərgahında – Cənnətdə yaşayaraq yuxarıdan aşağı bizlərə baxırlar. Allahın mübarək peyğəmbəri Məhəmməd, ona Allahın xeyir-duası və salamı olsun, belə demişdir: «Allah yaratdıqlarını zülmətdə xəlq etmişdir. O, işığı onların üzərinə daha sonra salıb» və «Allahın mələk adlandırılan məxluqatı vardır ki, onlar işləri özlərindən yaxşı bilirlər».

Beləliklə, Allahın dərgahına ucalan peyğəmbərlər öz məqsədlərinə çatdıqdan sonra oradan yerə nəzər salıblar. Allahın dərgahında olub ona yaxın bulunanlar isə görünməz aləmin açarına malikdirlər. Mən onu nəzərdə tuturam ki, onların mövcud olduğu aləmdə şeylərin səbəbi hiss aləminə qovuşur. Çünki o, hiss aləminin nəticəsindən biridir. Necə ki, əşyadan kölgə, ağacdan meyvə yaranır, səbəbdən də nəticə yaranır. Nəticənin açarı məhz səbəbdədir.

Məhz buna görə hiss aləmi Allah dərgahının bir əksidir. Bunu izah etmək üçün isə «şüa», «lampa» və «ağac» sözlərinin mənasını şərh etmək gərəkir. Sənin üçün bü müqayisəni aparmaq uyğundur. Müəyyən mənada müqayisənin nə ilə aparıldığı əhəmiyyət daşıyır. Yəni müqayisə aparılanın yaxın və uzaq olduğu əhəmiyyət daşıyır. Bu haqda söhbət açsaq, biz çox dərin mənalara vara bilərik. Onu ən dərin məqamlara qədər dərk edənlər Quranın həqiqi mahiyyət nümunələrini dərk etmiş ola bilərlər.

Yuxarıda qeyd etmişdim ki, özünü və ətrafdakıları görən işıq adına daha çox layiqdir. Lakin bundan əlavə başqalarını işıqlandıran bu ada daha çox layiq ola bilər. Bu cür ad «nurlu çıraq» (Quran, 33: 46) kimi də adlandırıla bilər. Çünki işıq yalnız özü öz üzərinə qonmur. Beləliklə, bu, peyğəmbərlik ruhu daşıyan anlayışdır. Çünki onun köməkliyi ilə bilik şüası bu müti dünyaya yayılır. Bu da Allahın Məhəmməd Peyğəmbərə, ona Allahın xeyir-duası və salamı olsun, verdiyi adın – «nurlu çıraq»ın (Quran, 33: 46) mahiyyətinin açılmasında əsas anlayış ola bilər. O ki qaldı ariflərlə peyğəmbərlərin fərqinə, bu fərq çoxsaylıdır.

Yəni çıraq ilə atəşin arasında olduğu kimi ariflərlə peyğəmbərlərin arasında böyük fərq vardır. Çünki atəş çırağı işıqlandırıb, onu həyata gətirir.

Bütün çıraqlar daha böyük atəşdən, ziyadan qidalanıb atəşlənir. Qadir Allah peyğəmbərlik işığı haqqında belə buyurmuşdur: *«Onun yağı, özünə od toxunmasa da, sanki işıq saçır!»* (Quran, 24: 35).

Ona atəş toxunduqda isə «aləmin işığı» (Quran, 24:35) olur. Şübhəsiz ki, bəşəri ruhlar üçün atəş mənbəyi ali ilahi ruhlar sayılır. Bu haqda Əli ibn Əbu Talib və ibn Abbas belə məlumat vermişlər: «Allahın yetmiş min simaya malik mələyi var. Hər simada yetmiş min ağız var. Hər ağızda yetmiş min dil var. Və onlar - *«Cəbrail və mələklər səf-səf duraraq»* (Quran, 78: 38) Allahı vəsf edirlər. Bu zaman bəşəri ruhlar, əgər onlar təmizliklərini saxlayıblarsa, *«atəşlə»* (Quran, 28:29) müqayisə oluna bilərlər. Atəşlənmək isə yalnız *«...dağ tərəfdə»* (Quran 28:29; 19:52) baş verir».

Gəl indi bəşəri işıqları atəşləndirən ali işıqları, onların bir-biri ilə olan təmasını, hansı ardıcıllıqla yanmasını nəzərdən keçirək.

Bu zaman ən yaxın sayılan mənbə işıq sözünə ən layiqlisi sayıla bilər. Çünki o, onların arasında mövqecə ən yüksəyidir. Beləliklə, bu dünyada olan hisslərin yerləşdirilməsi yalnız ay işığını görən, pəncərədən ay işığının güzgüyə necə düşdüyünü müşahidə edən, oradan isə əks divara şüa kimi yönələn və ən sonda döşəməni işıqlandıran şüanı görən insan vasitəsi ilə olur. Yəni döşəməyə düşən işıq öz mövcudluğuna görə divara düşən işığa, divara düşən işıq güzgüyə, güzgüyə düşən işıq aya, ay isə o biri dünyaya - haradan ki, günəş işıq saçır - minnətdar olmalıdır. Başqa cür desək, bu dörd şüadan hər biri ardıcıl olaraq biri digərindən daha yüksək mövqedə dayanır. Ən yuxarıda olanı ən aşağı olanından öz mövqeyinə görə fərqlənir və onlardan heç biri digərinin mövqeyinə iddia edə bilməz.

Mən istərdim ki, sən biləsən ki, daxili gözləri olan insanlar ən ali işıqlar dünyasında da müəyyən mövqe və mərhələlərin olduğundan xəbərdardırlar. Onlardan ən yüksəkdə duranlar isə ən son həddə duran şüadır. Yəni İsrafil öz mövqeyinə görə Allaha daha yaxındır. Onların arasında Allaha daha yaxın olanı öz şüasını Ulu Tanrıdan alır, eyni zamanda elələri də var ki, insanlara ən yaxınıdır. Onların arasında çoxsaylı mövqe və mərhələlər mövcuddur. Buna baxmayaraq, burada müəyyən ardıcıllıq və nizam-intizam var: *«Bizdən (mələklərdən) elə birisi yoxdur ki, onun müəyyən bir yeri olmasın»* (Quran, 37:164) və *«Həqiqətən, biz səf-səf dururuq və Allahı təqdis edib, şəninə təriflər deyirik»* (Quran, 37:165-166).

**5.Bütün şüa mərhələlərinin mənbəyi – Allahdır**

Mən istərdim ki, sən biləsən ki, şüaların hansı səviyyədə olmasından asılı olmayaraq, ucalma mövqeləri hədsiz deyildir. Onlar müəyyən mərhələyə qədər, daha doğrusu, başlanğıc mənbəyə qədər yüksələ bilirlər. Başlanğıc mərhələ isə özü-özlüyündə şüadır. Onu heç nə işıqlandırmır. O, özü hər şeyi ardıcıllığa və sıraya düzə bilir.

İndi isə sualıma cavab ver – işıq sözü daha çox nəyə uyğundur? Öz mənbəyini ətrafdan götürənə, yoxsa özü-özlüyündə atəşlənib ətrafını işıqlandırana? Mən inanmıram ki, sən doğru cavabı tapa bilməyəsən. Deməli, sən belə bir nəticəyə gələcəksən ki, «işıq» anlayışı daha çox ali şüaya, yəni ən yüksəkdə duran və ətrafındakıları işıqlandırana aiddir. Mən tərəddüd etmədən və cəsarətlə deyə bilərəm ki, işıq anlayışı ilkin başlanğıc istisna olmaqla, metaforadan başqa, bir şey deyildir. Çünki onların mahiyyətinə dərindən varsaq, onlar özü-özlüyündə heç bir işıq xüsusiyyəti daşımırlar.

Onların işığı başqa mənbədən götürülmüş bir borca bənzəyir. Bu borca götürülmüş işıq isə cismin özündə heç bir dəstəyə malik deyildir. Düşün ki, bir insan paltar, yəhər, at borca götürsə, onu dövlətli saya bilərikmi? Bəlkə, bu borcu verən dövlətli olandır. Əlbəttə ki, sualın cavabı ikinci hissədədir. Şübhəsiz ki, borc alan elə özü-özlüyündə kasıb olaraq qalır. Borc verən isə dövlətli olandır.

Beləliklə, həqiqi işıq məhz Odur. Onun əlində rəhm və əmr var. O, əvvəlcə işıq verir, daha sonra bu işığın sönməməsinə nəzarət edir.

Onun yaradanı yoxdur. Heç kəs onun üzərində sahib deyil. Qul özünün və sahib olduğu hər şeyin ağasına məxsus olduğunu

başa düşən kimi, insanlar da işığın və onun işıqlandırdığı hər şeyin Ulu Yaradana məxsus olduğunu başa düşməlidirlər.

Beləliklə, artıq sən bilirsən ki, işığın hansı mərhələləri var və o, necə təzahür edir. İndi isə sən bilməlisən ki, mövcudsuzluq qədər zülmət heç nə yoxdur. Çünki əşya qaranlıq ona görə adlanır ki, kiminsə nəzərini işıqlandırmır. O, görünməsi gərəkən halda görünmür. Baxmayaraq ki, mövcuddur.

O ki qaldı həm özü üçün, həm də başqa anlayışlar üçün qeyri-mövcud olanlara bu, zülmətin ən yüksək növüdür. O, gerçəkliyin tam əksini təşkil edir. Gerçəklik isə işıqdan qidalanır. Bir əşya özü-özlüyü üçün mövcud olmasa, o, başqaları üçün də mövcud ola bilməz.

Eyni zamanda gerçəklik müxtəlif səviyyələrə malikdir. Yəni özü-özlüyündə mövcud olan və öz mövcudluğunu başqasının mövcudluğundan əldə edər. Bu cür əşyalar borc götürülmüş anlam daşıyır. Çünki onlar özü-özlüyündə mövcud deyillər. Başqa cür desək, onlar mahiyyətcə əsl qeyri-mövcudluğu təşkil edirlər. İstənilən gerçəklik - hansı ki, öz mövcudluğunu başqasından borc götürür - həqiqi gerçəklik sayıla bilməz. Bayaq qeyd etdiyim dövlətli və borc alan misalını xatırlamaq kifayətdir. Buna uyğun olaraq deyə bilərik ki, əsl gerçəklik Qadir Allah olduğu kimi, həqiqi işıq da Qadir Allahdadır.

## 8. Həqiqətlərin həqiqəti

Bu nöqtədən Allahı dərk edənlər həqiqi mahiyyətlərə ucalırlar. Necə ki, dərədən dağa ucalan kimi.

Ucalmanın sonunda isə onlar Allahdan başqa, həqiqi mövcud olanın olmadığını dərk edirlər: *«Allahdan başqa, hər şey məhvə məhkumdur»* (Quran, 28:88). Lakin heç bir şey qəfil olaraq məhv olmur. Bu, müəyyən zaman çərçivəsində baş verir və onu məhv olan adlandırmaq daha düzgün olardı.

Allahdan başqa, hər bir şey ayrılıqda götürülsə, qeyri-mövcudluq kimi dərk edilə bilər. Lakin eyni zamanda o, Qadir Allahın varlığından qidalanan bir mövcudluq kimi də mövcuddur.

Beləliklə, gerçəklikdə mövcud olan Allahdan qida alır. Bu, ona görə baş verir ki, hər bir şeyin iki tərəfi var – özünəməxsus tərəfi və Allaha məxsus olan tərəfi. Özünəməxsus tərəfi qeyri-mövcud olan tərəfdir. Allaha məxsus tərəf isə mövcud olandır.

Məhz bu səbəbdən Allahdan başqa, mövcud olan yoxdur və İlahidən başqa, hər şey məhv olur.

Bunu dərk edənlərə (ariflərə) Sonuncu dirçəlişi bilmək tələb olunmur: *«Bu gün hökm kimindir? Bir olan, qadir olan Allahın!»* (Quran, 40:16). Çünki bu səs daim onların qulağında cingildəyir. Onlar həm də fərqinə varmırlar ki, *«Allahu əkbər»* (Allah böyükdür) Onun hər şeydən uca və qadir olduğuna işarədir. Allah özü qorusun! Çünki bütün mövcud olanların arasında Onunla qüdrət və böyüklüyünə görə müqayisəyə gələcək heç bir şey yoxdur. Heç kəs Onunla bərabər mövcud ola bilməz. Mövcudluq yalnız Onun əks gücü ola bilər.

Bu sözlərin mənası odur ki, O, mütləq dərəcədə Böyükdür. Və hətta burada böyük sözü də onun qüdrətini ifadə etmək gücünə malik deyil. Çünki Allahdan başqa, heç kəs onun özünü tam şəkildə dərk edə bilmir. Bu haqda bütün fikirlərimi mən «Allahın gözəl adlarının mənası və ali məqsədi» adlı kitabımda açıqlamışam. Aqillər Ulu Yaradana qovuşduqdan sonra bir səslə deyirlər ki, onlar Bir Həqiqətdən başqa heç nə görməyiblər. Bəziləri bu fikrə dərk etmə, digərləri isə təcrübə vasitəsilə nail olublar.

Sonuncu üçün bir çox məsələlərin mahiyyəti Onun mütləq varlığı və Onun dərgahında əriyib gedir.

Onlar bununla böyük təəccübə uğrayır və Allaha zikr etməkdən başqa, heç bir digər bacarığa nail ola bilmirlər. Onlar hətta özləri özlərini unudurlar. Onlar üçün Allahdan başqa, heç nə olmur. Onlar sanki bir sərxoşa bənzəyirlər. Onların əqli də sərxoşluq sehrində öz gücünü itirir. Onlardan biri (Əbu Mənsur əl-Həllac) belə qışqırıb: «Həqq mənəm», digəri isə (Əbu Yezid Bistami) belə demişdir: «Mən nə qədər də qüdrətli və böyüyəm, bu geyimdə Allahdan başqa, heç nə yoxdur».

Onların sərxoşluğu vaxtı olan sevgiləri unudulmalı və gizlədilməlidir.

Onların sərxoşluğu keçdikdən sonra isə onlar yenidən öz əvvəlki vəziyyətlərinə qayıdırlar. Və Allahın iradəsini başa düşürlər ki, yaşadıqları hal Allahla bütövləşmək deyildi. Onların vəziyyətini bu misralarla ifadə etmək olar:

Mən bütün varlığımla sevənəm,
Bütün varlığım ilə sevdiyim isə elə mən özüməm.

Əgər bir insan ömründə ilk dəfə güzgüyə baxırsa, o, güzgüdəki əksi güzgünün əksi kimi qəbul edir və bunu özünə bənzədir

Bir başqası isə şərab dolu qədəhə baxıb belə düşünə bilər ki, bu şərab rəngli boş qədəhdir. Əgər bu fikir onun üçün adi və vacib bir düşüncəyə çevrilsə, o, bu fikir burulğanında itib bata bilər:

Şərab və qədəh - hər ikisi şəffafdır,
Onlar o qədər bənzərdir ki, fikri dolaşdırır.
Sanki şüşə yoxdur, yalnız şərab var,
Bəlkə də, əksinə - şərab yox, yalnız şüşə var.

Şərab qədəhdir və «şərab sanki qədəhdir» ifadələri arasında böyük fərq var. Beləliklə, bu hala düşən insan üçün bunu metafora dilində «birləşmə», reallıq ifadəsi ilə isə «oxşatma» adlandırmaq olar. Bu həqiqi mahiyyət arxasında isə bizim mühakimə yürüdə bilməyəcəyimiz sirrlər gizlədilir.

**7. «Allahın siması». Bu işıqların Allah işığı ilə əlaqəsinin daha müfəssəl şərhi**

Mümkündür ki, sən Allahın nurunun yer işığı ilə necə əlaqələndiyini bilmək istəyirsən. Bilmək istəyirsən ki, o dünyada sima necə olur.

Və sən inkar etməzsən ki, Allah nurdur və Ondan başqa, işıq yoxdur. Və bütün işıqlar Odur. Və əgər O, işıqdırsa, nə üçün əşyalar təzahür edir və yaxud hansı səbəbdən onlar təzahür edir? Daha dərinə getsək isə onların təzahür etməsində nəyə minnətdar olmaq lazımdır? Bu elə bir işıqdır ki, ondan sonra işıq yoxdur və onun işığını yandıran və ona mənbə verən də yoxdur. O, özü-özünə alışıb yanır və özü üçün alışıb yanır. Bu yalnız ilkin başlanğıc üçün keçərli olan xüsusiyyətdir.

Və sən bilirsən ki, yer və göy iki əsas işığa bürünüb, görünən xarici işığa və daxili işığa. Bu sözlər arxasında isə mən hissi və ağılı nəzərdə tuturam.

Birinci növ işıq görünən işıqdır və o, günəşdə, ayda, ulduzlarda olur. Onlar yerin üzərinə düşərək, rəngləri və çalarları görülən edir. Bu, əsasən yazda baş verir. Onlar təbiəti, heyvanları, əşyaları bütün mövcudluqları ilə nəzərə çarpdırırlar.

Bu işıqlar olmadan nə bir rəng, nə də bir forma təzahür edə bilər. Eyni zamanda bütün forma və ölçülər öz rənginə görə dərk edilir. Çünki rəngsiz nəyisə dərk etmək qeyri-mümkündür.

O ki, qaldı ağıla aid olan ideal şüaya, istər bu ali dünya, istər-

ə də mələklərin substansiyası və maddi dünya olan aşağı dünya ondan uzaq deyil. Bütün heyvani və insani dünya buradan öz payını alır. Aşağı dünyada olan sıralanma insan işığına görə, ali dünyada olan sıralanma isə mələk şüasına görə müəyyən edilir. Bu sıralanmaya Quran ayələrində işarə vardır: *«O, sizi yerdən yaradıb, orada sakin etdi»* (Quran, 11:61). *«(Allah) onları özlərindən əvvəlkilər kimi yer üzünün varisləri edəcəyini, onlar üçün onların Allahın özü bəyəndiyi dinini möhkəmləndirəcəyini... vəd buyurmuşdur»* (Quran, 24:55). *«Sizi yer üzünün varisləri edir»* (Quran, 27:62) və *«Mən yer üzündə canişin yaradacam»* (Quran, 2:30).

Beləliklə, sən görürsən ki, əvvəldən axıra həm xarici, həm də daxili şüalar zəngindir. Eyni zamanda aşağı səviyyəli şüalar birindən digərinə keçir. Necə ki, çıraqdan çıxırlar. Çıraq isə öz-özlüyündə peyğəmbərlik işığıdır.

Və fövqəltəbii peyğəmbərlik ruhları öz işıqlarını ali ruhdan alırlar. Necə ki, çıraq öz işığını alovdan alır. Ali işıqlar isə sıralanmaya uyğun olaraq bir-birindən işıq alırlar. Bu işıqların mənbəyi işıqların çeşməsi olan Qadir və Bir olan Allahdan gəlir. Bütün işıqlar Ondan borc alınıb. O, həqiqi işıqdır. O, hər şeydir. Xeyr, O nəinki hər şey, hətta mahiyyətdir. Ondan başqa, heç nə əsl mahiyyətə malik deyil. Başqalarında olan mahiyyət isə yalnız nisbi mahiyyət daşıyır. Məhz bu səbəbdən Ondan başqa işıq sayıla bilməz. Digər başqa işıqlar Onun əks tərəfini təşkil edir. Bu əks tərəf də yalnız Qadir Allaha məxsusdur.

Beləliklə, bütün simalar yalnız Ona yönəlib və Onun tərəfinə istiqamətləniblər – *«Hansı tərəfə yönəlsəniz (üz tutsanız), Allah oradadır»* (Quran, 2:115). Bu səbəbdən ondan başqa, ilahi yoxdur. Çünki ilahilik elə bir anlayışdır ki, hər kəs ibadət vaxtı üzünü Ona çevirir. O – Allahdır. Sima deyərkən mən insan qəlblərini nəzərdə tuturam. Çünki məhz orada işıq və ruh yerləşir. Xeyr, «Ondan başqa, Allah olmadığı kimi» «Ondan başqa da mahiyyət yoxdur». Çünki O, elə bir anlayışdır ki, biz istənilən məqamda yalnız Ona işarə edə bilərik. Sən hər dəfə nəyə isə işarə etdikdə sənin işarən mahiyyətcə ona ünvanlanıb. Hətta sən bu həqiqəti bilməsən də, bu, biz söylədiyimiz kimidir. İşıq şüasını göstərən hər bir insan istər-istəməz günəşə işarə etdiyi kimi, bütün şeylərin mahiyyəti də Allahla bağlıdır.

Məhz bu səbəbdən «Allahdan başqa Allah yoxdur» ifadəsi bir çox insanlar üçün təkallahlığa işarədir. Seçilmişlər üçün bu sözü

belə ifadə etmək olar: «Ondan başqa, mahiyyət yoxdur». Birinci ifadə daha çox ümumi anlam daşıyır. İkinci ifadə isə məxsusi olub Allahın təkliyini ifadə etmək üçün daha uyğun, daha dəqiq, daha mütləqdir. Bu sözü ifadə və dərk edən insanlar Allahın təklik və bütövlük dərgahına daxil olur.

Allahla bütövlük şahlığı bəndə üçün ucala biləcəyi ən yüksək zirvədir. Bundan uca və ali bir məqam yoxdur. Çünki «ucalmaq anlayışı özü də çoxmənalı olub nisbi məna daşıyır. Burada iki mərhələ var: hara ucalmaq və haradan ucalmaq.

Lakin bu çoxluq aradan qalxıb birləşmə baş tutduqda nisbilik də aradan qalxır və «haradan», «hara» anlamları da öz çoxmənalılığını itirir. Burada nə hündürlük, nə dərinlik, nə yuxarı, nə də aşağı mənaları qalır. Ruh ən alini dərk etdikdən sonra öz yüksəlişini də saxlayır. Çünkü bu məqamdan yüksək heç nə yoxdur. Eyni zamanda Onun olduğu məkanda çoxluq anlayışı da yoxdur. Çoxluq da itdikdən sonra ruhun yüksəlişinə heç bir ehtiyac yoxdur. Əgər bu məqamda hər hansı bir yerdəyişmə baş verdikdə yalnız yuxarıdan aşağı ola bilər. Yəni « daha aşağı göylərə enmə» ola bilər. Bu da bir qədər nisbidir. Çünki ali üçün yüksəlişin ən aşağı məqamı da böyük məqam sayılır.

Bu məqsəd məqsədlərin məqsədi sayıla bilər. Bu axtarış yalnız kamil bilən ruhlar üçün olan axtarışdır.

Bu haqda bilgilər çox sirli saxlanılır və yalnız hər şeyi bilən Allaha məxsusdur. Və bu səbəbdəndir ki, bu sirlər haqqında anlayışı olanlar nəsə dedikdə bilməyənlər tərəfindən inkar olunur.

Ariflərin «daha aşağı səviyyəyə enmə» anlamı çox maraqlı şəkildə şərhə səbəb olmuşdur. Onların fikrincə, bu, mələklərin göydən yerə enməsidir. Aqillərdən biri isə bu məsələ ilə bağlı daha maraqlı bir şərh vermişdir. Allahın ilahi birliyinə nail olmuş bu aqil belə demişdir ki, "daha aşağı məqama enmə" Allaha məxsusdur. Bu eniş – Onun enişidir. Səbəbi isə fiziki fəaliyyəti bərpa edib orqanları fəaliyyətə gətirməkdədir. Və Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, hədisdə bu barədə belə demişdir: «Mən Onun eşidən qulağı, görən gözü və danışan diliyəm».

Və əgər Peyğəmbər Allahın eşidən qulağı, görən gözü, danışan dilidirsə, deməli, yalnız Odur – görən, eşidən və danışan. Musaya ünvanlanmış sözlərdə buna işarə edilib: «Mən xəstə idim, sən isə məni ziyarət etmirdin» (Matfeydən, 25-43).

Buna uyğun olaraq bu möminin fiziki fəaliyyəti ali göylərdən gəlir. Onun hissi isə məsələn, görmə və eşitmə kimi daha yüksəklərdə yerləşən göylərdən gəlir. Ağıl isə bunlardan da yüksəklərdə olan göylərdən gəlir. Bu göylərdən isə daha yüksəklərə qalxaraq Allahın dərgahına ucala bilir. Burada isə onu yeddi pillə gözləyir. Bura Allahın hər şeyi idarə etdiyi məqamdır.

Zənnimcə, bu izahlara son verməyin məqamı çatıb.

**8. Bu şüaların Allahla olan əlaqəsi: ən sadə ifadə və izahlar.**

Mümkündür ki, sən bu sözlərin mənasını tam olaraq dərk edə bilməmisən. Mənim bütün cəhdlərimə baxmayaraq, ola bilər ki, səni yorsun.

Bax, məhz bu zaman sənin anlamına daha yaxın olan sənin zəifliyinə çevriləcəkdir. Allahın göylərdəki və yerdəki işıq olması yalnız görünən işıqla müqayisə zamanı məlum ola bilər. Yazda sən gün işığında təbiətin rəngarəngliyinə baxarkən belə düşünürsən ki, sən yalnız rəngləri görürsən. Məsələn, yaşıl otlara baxarkən belə fikirləşirsən: «Mən otlardan başqa, heç nə görmürəm». Çoxları belə düşünüb, belə mühakimə yürüdürlər. Onların fikrincə, rəng heç bir məna ehtiva etməyən sözdür. Və rəngdə rəngdən başqa, heç nə yoxdur.

Beləliklə, onlar işığın varlığını inkar etmiş olurlar. Çünkü məhz o, əşyaları görünən edir. Lakin gün batıb qaranlıq çökdükdə isə bu insanlar başa düşürlər ki, işıqla qaranlıq arasında böyük fərq vardır və işıq bir formadır. Və işığı rəngdən ayırmaq qeyri-mümkündür. Çünkü onu rəng olmadan hisslə qavramaq qeyri-mümkün olur.

Əgər bütün bunlar sənə aydın oldusa, bilməlisən ki, daxili gözə malik olanlar hər şeydə Allahın varlığını görə bilərlər. Mümkündür ki, bu məsələdə daha çox irəli gedənlər belə desin: «Mən heç nəyi görməzdən öncə Allahı görmüşəm». Çünki bəziləri obyekti gördükdən sonra Allahı, bəziləri isə əksinə, Allahı gördükdən sonra obyekti dərk edirlər.

Quranda bu məsələyə belə bir işarə var: *«Məgər Rəbbinin hər şeyə şahid olması kifayət deyilmi?»* (Quran, 41:53) . Başqa bir yerdə isə belə deyilir: *«Biz öz qüdrət nişanələrimizi onlara həm xarici aləmdə, həm də onların daxilində mütləq göstərəcəyik»* (Quran, 41:53). Bu iki fikir arasında fərqlilik ondan irəli gəlir ki, birincilər Allahı birbaşa duyduğu halda, ikincilər Onu yalnız yaratdıqlarının timsalında duya bilirlər. Birinci məqam övliyalıq məqamıdır, ikinci məqam isə ariflikdir.

Beləliklə, sən başa düşdün ki, insan yalnız işıq vasitəsilə hər şeyi görə bilir. Eyni zamanda insanın daxili gözü də Allahın iradəsi ilə fəaliyyətə başlayır. Ayrı-ayrı məqamlarda O, hər şeydir və məhz Onun xidməti olaraq hər şey təzahür edir. Lakin bir məsələni nəzərə almaq lazımdır ki, görülən işıq günəşin batması ilə kəsilə bilər. Bu zaman bizim baxışımız və nəzərlərimiz ya zəifləyəcək, ya da müvəqqəti olaraq yox olacaqdır. İlahi işıq haqqında isə bunu demək olmaz. Bu günəş heç vaxt batmır. O, hər zaman müəyyən anlayışları bizim üçün görünən və dərk edilən edir.

Bütün təbiət bizim üçün dəyişməz olaraq qalır. Çünki onlar Yaradan ilə vəhdətdədirlər: *«Elə şey yoxdur ki, Allaha tərif deyib, Ona şükr etməsin»* (Quran, 17:44).

O kəsə eşq olsun ki, Özünü yaratdıqlarında gizli saxlaya bilir. O həm görünən, həm də ilahi pərdə ilə gizli, sirli qalandır. Lakin bu cür izah bəzi məhdud düşüncə tərzinə malik olanları çaşdıra bilər. Onlar «Allah hər yerdə və şeydədir» sözünü anlamaya bilərlər. Onlar hər şey sözünü «hər nə oldu» sözü ilə eyniləşdirə bilərlər.

O, çox mübarək və müqəddəs olduğu üçün Onu ən adi formada hər şeylə əlaqələndirmək düzgün deyil. Qətiyyən bu cür mənasız fikirlərə dalma, biz səni əmin edirik ki, O, hər şeydən əvvəl olan, hər şeydən üstün olandır. O, hər şeyi təzahür etdirə bilir. Allah hər şeydə mövcuddur deyərkən, biz onu nəzərdə tuturuq ki, yaradılan istər-istəməz Yaradanla bu və ya digər formada əlaqədardır.

Beləliklə, sən bildin ki, Yaradan yaratdığından çox-çox yüksək məqamda durur. Lakin, eyni zamanda O, yaratdığından üstün olduğu kimi, onunla da eyni məqamda dayana bilir.

Lakin sən burada qətiyyən fikir təzadı görməməlisən. Təsəvvür et ki, sənin təfəkkürün üçün ən ali və yüksək qavrama olan bu dünyada sənin əlinin hərəkəti kölgənin hərəkətidir. Bu həm də birinci olaraq kölgənin hərəkətidir. Bunu dərk etməyən isə öz axtarışlarını dayandırmalıdır. Çünki:

Hər elmin öz adamları var,
Hər insan yaradıldığı üçün nəyisə öyrənməlidir.

II Fəsil

# İŞIĞIN, ÇIRAĞIN, ŞÜŞƏNİN, AĞACIN, QƏTRANIN VƏ ATƏŞİN OXŞARLARI BARƏDƏ

Bunları izah etmək üçün çox dərin elmi araşdırma tələb olunan iki əsas anlayış haqqında ətraflı məlumat vermək lazımdır. Lakin mən onlar haqqında mümkün qədər qısa danışacam.

Birinci olaraq ideyaların daxili aləmi ilə xarici təzahürü olan formaların əlaqəsi, bu əlaqənin üsulu, hisslər aləmi ilə bəşəri şahlıq arasındakı rabitənin keyfiyyəti, buradan intişar tapan ideyaların mənəvi mahiyyəti haqqında;

İkincisi, bizim insani ruhumuz onların işıqlıq səviyyəsi haqqında. Bu ikinci ona görə lazımdır ki, birinci anlayış daha müfəssəl şəkildə aydın olsun.

**Birinci sütun**

**Bənzədilmənin xarici təzahürü və daxili sirri**

Bil ki, dünya iki aləmdən ibarətdir – ruhi və maddi və ya istərsənsə, hisslər aləmi və ağıl aləmi və ya ali dünya və aşağı dünyadan, onlar bir-birinə çox yaxındırlar. Və onların fərqi yalnız təsvirlərindədir. Əgər sən onları mahiyyətcə təsvir edirsənsə, mənəvi və maddi dünya adlandırırsan. Yox, əgər gözlə təsvir edirsənsə, hisslər və ağıl dünyası adlandırırsan. Onların bir-birinə olan münasibəti isə ali və aşağı dünya adlandırılır.

Sən onlardan birini hökmdarlıq və şahidlik dünyası, digərini isə sirli və bəşəri şahlıq adlandıra bilərsən. Əgər onların həqiqi mahiyyətini öyrənmək istəyən bu adlar çoxluğunda çaşıb qalsa və onların hər birinə çoxsaylı ideyalar şamil etsə, heç də qəribə görünməz. Lakin bu anlayışlar altında həqiqi mahiyyəti dərk edən insan ideyaları əsas, onların söz və ifadəsini isə təzahürat sayır. Zəif təfəkkürlü insanlar üçün bu müəyyənləşmə əksini təşkil edir. Onlar üçün əsas müəyyənedici həqiqi mahiyyətin qidalandığı varlıqdır. Biz Allahın özünün də öz sözlərində bu fərqi göstərdiyini sübut edə bilərik: *«(Küfrü ucbatından) üzü üstə sürünən daha haqq yoldadır, yoxsa düz yolda düz gedən?» (Quran, 67:22).*

(1) Beləliklə, bu iki dünyanın mahiyyətini dərk etdikdən sonra sən başa düşməlisən ki, ilahi şahlıq «sirli» olandır. Çünki O, çoxlarının dərkolunmasından gizli saxlanılıb. Hisslər aləmi isə şahidlik dünyasıdır. Çünki onları çoxları görüblər. Bu dünya ağıl və zəka aləminə qalxmaq üçün başlanğıc nöqtədir. Və əgər onlar arasında əlaqə olmasaydı, ruhi dünyaya olan qapılar bağlı qalardı.

Əgər bu, qeyri-mümkün olsaydı, Allahla bütövləşmək də mümkün olmazdı. Ayağı bu dünyaya möhkəm dayanmayan heç kimsə qadir Allaha yaxın ola bilməz. Allahın dərgahı hisslər və təxəyyüllər dünyasından çox-çox üstündür. Və bu dünyaya layiq olmayan heç nəyin oraya daxil olub çıxmadığına görə biz oranı ilahi müqəddəsliyin ağuşu adlandırırıq. Biz insan ruhunu da müqəddəsliyin təzahür etdiyi məkan - *«müqəddəs vadi» (Quran, 20:12)* adlandıra bilərik.

Eyni zamanda bu ağuş və ya vadi daha kiçik vadilərdən təşkil olunub ki, biri digərindən daha dərindir. Və onlar ilahi müqəddəslik ideyaları ilə doludur.

Lakin ağuş ifadəsi kiçik ağuşları da əhatə edir. Elə düşünmə ki, bu termin daxili gözü olan ağıllı insanlar üçün əlçatmaz bir tapmacadır.

Lakin bu terminin açıqlanması məni əsas mövzudan uzaqlaşdırdığı üçün bu mövzunu bir qədər də inkişaf etdirmək istəmirəm. Terminlərin öyrənilməsi artıq sənin işindir.

[ Beləliklə, biz əvvəlki söhbətimizə qayıtmalıyıq. Deməli, ilahi şahlığa gedən başlanğıc nöqtə görünən dünyadır. Bu yol isə ruhi yüksəliş yoludur. Onu həm də «inam» adlandırırlar. Əgər bu dünyalar arasında heç bir əlaqə olmasaydı, o zaman bir dünyadan digərinə yüksəliş mümkün olmazdı.

Beləliklə, Allah-təala bu dünyaya ilahi dünya ilə müqayisədə müəyyən bir nisbilik də verib. Məhz bu səbəbdən bu dünyada hər şey ali dünyada olan nəyinsə oxşarıdır.

Çox mümkündür ki, bu dünyada olan hər hansı bir əşya ilahi şahlıqda olan bir neçə əşyanın simvoludur. Və eyni tərzdə də o dünyada olan bir əşya bu dünyada olan bir neçə şeyin simvolu olsun. Biz hər hansı bir şey başqa bir şeyi tam və ya nisbi olaraq xatırladanda onu oxşar sayırıq. ]

Bu cür oxşarları tam sadalamaq bizdən hər iki dünyada olan bütün mövcud olanları qeyd etməyi tələb edə bilər. Bu işin öhdəsindən heç bir insan həyatı gələ bilməz. Mənim gücüm yalnız bir nümunə gətirməyə kifayətdir.

Daha sonra azdan çox da yaratmaq olar. Və bilgilər qapısı sənin üçün açılmış olacaqdır.

(2) Beləliklə, dinlə. Əgər ilahi şahlıq dünyasında mübarək və ali olan işıqlı varlıqlar varsa, onlar mələklərdir.Onlardan çıxan şüalar insan ruhuna hopur. Bu baxımdan bu mələkləri hökmdarlar adlandırmaq olar. Allah isə hökmdarların hökmdarıdır. Mələklərin və ya hökmdarların müxtəlif növ şüalandırma imkanları vardır. Bu şüalandırmanm görünən dünyada təzahürləri isə günəş, ay və ulduzlardır. Yolçu (salih) bu mənəvi yolu qət edərkən ilk növbədə ulduzların səviyyəsinə qalxır. Burada isə o görür ki, bütün dünya ulduzlara baş əyərək Onun parlaqlığına qibtə edir.

Və O, bu kahkəşanda və gözəllikdə şüalanmanı görüb heyrətlənərək deyir: *«Bu, mənim Allahımdır» (Quran, 6:76)*. Bir qədər də irəli getdikdən sonra O, ay işığını görür. Və onun şüasının ulduzlardan daha parlaq olduğunu görüb belə deyir: *«Mən sönənləri sevmirəm» (Quran, 6:76)*, çünki ayla müqayisədə ulduzların işığı sönük görünür. Daha sonra O ən son mərhələ olan günəşə qədər ucalır. Və burada da o görür ki, günəş böyük və ucadır, nəinki ay və ulduzlar. Bununla belə yolçunun diqqətini də o çəkir ki, günəş özü də nəyinsə oxşarıdır *(Bax: Quran, 6:77-78)*.

Lakin kamil olmayanla hər hansı bir əlaqədə olmaq elə özü də qeyri-kamil olub sönən deməkdir. Bu səbəbdən deyilir: *«Mən, həqiqətən, batildən haqqa tapınaraq üzümü göyləri və yeri yaradana çevirdim. Mən Ona şərik qoşanlardan deyiləm» (Quran, 6:79)*. Bu ayədəki istiqamətin mənbəyi isə Haqdır, Allahdır.

Bu səbəbdəndir ki, bir çox ərəblər Allahın rəsulundan, ona Allahın xeyir-duası və salamı olsun, soruşanda ki: «Onu nəyə bənzətmək olar?» - belə bir vəhy gəlmişdir: *«De : «O – Allah birdir; Allah (heç kəsə və heç nəyə) möhtac deyildir (hamı Ona möhtacdır, O əzəlidir, əbədidir), O nə doğmuş, nə də doğulmuşdur.Onun heç bir tayı-bərabəri (bənzəri) yoxdur!»» (Quran, 112:1-4)*. Quranın bu surəsinin mənası odur ki, Allah bütün münasibətlərdən üstdə dayanır.

Və Firon Musadan soruşanda ki: *«Aləmlərin Rəbbi kimdir?» (Quran, 26:23)*. Musa Onun yaratdıqlarına işarə etdi. Çünkü arif adama bu cür işarə tam kifayət idi: *«O, göylərin, yerin və onlar arasında olanların Rəbbidir» (Quran, 26:24)*.

Bu sualı ilə Onun mahiyyətini öyrənmək istəyən Firon öz əyanlarına dedi: «Eşitdinizmi?» (Quran, 26:25). Bu cavabda elə bir məna var idi ki, guya Musa ona ünvanlanan sualdan qaçmaq istəyib. Bu zaman: *«Musa dedi: «O həm sizin də, ulu babalarınızın da Rəbbidir»» (Quran, 26:26).* Bunu eşidən Firon onu dəli sandı. O, ilahi mahiyyəti anlamaq üçün sübut-dəlil gətirilməsini istədi və Musa Onun yaratdıqlarını misal çəkdi. Bu zaman Firon dedi: *«Sizə göndərilmiş peyğəmbər, şübhəsiz ki, dəlidir». (Quran, 26,27)*

(3) İndi isə gəl bənzədilmə metodu ilə bağlı nümunəyə qayıdaq. Yuxuyozma hər bir bənzətmə haqqında bizdə olan təəssüratla bağlıdır. Və deyilmişdir: «Yuxugörmə peyğəmbərliyin bir hissəsidir». Axı aydındır ki, yuxuda günəş görünübsə, bu, şahlıq əlamətidir. Yəni ki, onların hər ikisinin eyni mənəvi ideyadan doğmasına işarədir. Çünki şahlığın hər şey üstə hökmran olması günəşin hər şeyə təsir etməsinə bərabər tutulur.

Eyni zamanda yuxuda ayı görmək də şahın nazirinə olan işarədir. Çünki günəş yerə işığı axşamlar məhz ay vasitəsilə ötürür. Elə şah da çox vaxt üzünü görmədiyi rəiyyəti ilə nazirləri vasitəsilə əlaqə saxlayır.

Eyni zamanda barmağında üzük görən insana bu yuxu ramazan ayında səhər namazına çağırış kimi yozulur.

Eyni zamanda zeytun ağacını zeytun yağı ilə sulamaq belə yozulur ki, bu yuxunu görən bilmədən kəniz olan öz anası ilə evlənəcəkdir. Lakin bu cür yuxu yozmalar, yuxuda görülənlərin həyatdakı oxşarları o qədər çoxdur ki, mən onların hamısını şərh etməkdən vaz keçirəm.

Mən yalnız onu demək istərdim ki, yüksək mənəvi dünyada bəzi anlayışların günəş, ay, ulduzlar kimi oxşarı olduğu üçün heç kəs inkar edə bilməz ki, bu oxşatmalar və ya bənzərliklər başqa anlayışlarda təzahür edə bilər.

Məsəl üçün, əgər ruh aləmində yerini dəyişməz böyük və nəhəng olan, heç vaxt kiçilməyən çeşmələrindən və çaylarından vəhylər axan bir anlayış var, onu dağa bənzətmək olar. Eyni zamanda əgər bu nemətləri qəbul edib əxz edənləri də müəyyən bölgülərə ayırsaq, o zaman onu vadiyə bənzətmək olar. Əgər bu məlumat və vəhylər insan ürəyinə çatıb oradan isə başqalarının ürəyinə sızırsa, bu ürəkləri gəmi avarlarına bənzədə bilərik. Vadilərin başlanğıcını peyğəmbərlərin ürəyi hesab etmək olar. Peyğəmbərlərdən sonra isə bu ürək anlayışı alimlərə və onların davamçılarına

aiddir. Beləliklə, əgər avar birincidən aşağıda yerləşibsə və ondan gələn su ilə dövr edirsə, bu zaman birinci vadi sağ vadi, aşağıdakı avar isə ən aşağı yerdən su götürdüyü üçün mərkəzi vadiyə toxunmuş olacaqdır.

Əgər peyğəmbərin ruhu işıqlandırılan çırağa bənzədilsə, o zaman onu alışdıran qüvvənin oxşarı kimi biz atəşi götürə bilərik. Əgər peyğəmbərlərdən dərs və örnək alan insanların bir qismi bu bilgiləri ənənəvi üsullarla əldə edirlər, digərləri isə həm də daxili aləmlərinin «gözlərinin» köməyindən istifadə edirlərsə, bu zaman birinciləri adi ocağa, mənəvi təcrübəyə malik olanları isə atəşə bənzətmək olar. Çünki təcrübəsi olanların atəşi də böyük olar. Axı insan atəşlə yalnız ona yaxın olan zaman isinə bilər. «Atəş» sözünü eşitməklə isinmək isə mümkün deyil.

Əgər peyğəmbərliyin birinci mərhələsi hiss və təxəyyüldən uzaq olub ilahi qavrama ilə ölçülürsə, bunu müqəddəs vadiyə bənzətmək olar. Və əgər müqəddəs vadiyə bəşəri və dünyəvi hisslərdən imtina edərək keçmək mümkündürsə, bunu Məkkəyə ziyarətə gəlmiş insanın ayağından hər iki ayaqqabısını çıxarmasına bənzətmək olar.

Gəl indi Allahın cizgilərinin oxşarı barədə danışaq. Əgər Allahın cizgiləri insan ürəyində hansısa üsulla əks olunubsa, gəl onu kəlam kimi qəbul edək. Bu ürəyi isə kitab kimi də qəbul etmək olar.

Əgər kəlamın sahibi olan nəsə varsa, bunu əl kimi qəbul edə bilərik. Və ümumiyyətlə, Allaha məxsus olan cizgilərin forma və obrazı olmalıdır və əgər nəzərə alsaq ki, insanın da simasının forma və obrazı var, onu «Allaha məxsus cizgilərlə yaradılmış kimi» qəbul etmək olar. Lakin unutmayaq ki, Allaha məxsus sima və ilahi sima anlayışları arasında müəyyən fərq var. Belə ki, Allah Adəmə bir obraz və forma vermişdir. Elə bir xarici görkəm ki, sanki Adəm bu dünyanın tam oxşarı idi. Və Adəmin obrazı Allahın əli ilə çəkilmişdir. Beləliklə, Adəm ilahi simaya məxsus idi.

Adəm övladı Allahını dərk etməkdə çətinlik çəkirdi. Çünki o, ilk növbədə özü özünü dərk etməli idi. Yalnız «özünü dərk edən Allahını dərk edər». Beləliklə, Allahın cizgiləri hələ ilahi cizgi demək deyil və ilahi cizgi şaha məxsus cizgi deyil. Bu baxımdan o, bizə müdafiə üçün hər cizgiyə ayrıca müraciət etməyi tövsiyə edir: *«De, pənah aparıram insanların Rəbbinə, insanların ixtiyar sahibinə, insanların tanrısına» (Quran, 114:1-3).* Əgər bu ideya «Allah öz vəhyi ilə insanları yaratmışdır» fikrinə uyğun gəlməsəydi, bu zaman

bu ifadə öz hərfi mənasında yox, başqa formada səslənməliydi. Yəni belə: «Allah insanları öz oxşarı kimi yaratmışdır».

(4) Xahiş edirəm bu bənzətmə metoduna əsaslanaraq qətiyyən xarici formanı lazımsız və yaxud da həddən ziyadə lazımlı olaraq qəbul etmə.

Heç bir fərqi yoxdur ki, məsələn, mən Musa Peyğəmbərin ayaqqabısının olmamasını düşünməklə bərabər, Allahın ona müqəddəs kəlamlar göndərdiyinin heç fərqinə varmayım: *«Ayaqqabılarını çıxar!» (Quran, 20:12).* Allah saxlasın! Xarici aləmdən, bu dünyadan imtina etmək, hətta Quranın hərfi mənasını yox, onun yalnız gizli məqamlarının ardınca düşmək yalnız gizli dünyaya nəzər dikib, bu dünya ilə ilahi dünya arasındakı əlaqəni inkar etmək böyük səhv olardı. Batinilər bu yolu tutaraq axıra kimi heç nəyi dərk edə bilmədilər. Eyni zamanda daxili dünyadan imtina edib, yalnız xarici aləmə bağlanmaq materialistlərə məxsus olandır. Başqa sözlə, kim ki xarici obrazı bütövdən ayırır, o, materialistdir. Və kim ki daxili aləmi bütövdən ayırır, o, batinidir. Amma hər kim ki bu iki aləmi bütöv halında götürür, o, kamildir. «Quran daxili və xarici aləmə, əvvələ və axıra malikdir» (Hədis, güman ki, Əli ibn Əbu Talibdən gəlir).

Mən belə düşünürəm ki, Musa «Ayaqqabılarını çıxar» əmrini həm hərfi, həm də daha dərin olan daxili mənada başa düşüb yerinə yetirmişdir. O, bir tərəfdən ayaqqabılarını çıxarmış, digər tərəfdən hər iki aləmdən imtina etmişdir. Burada sən elə indicə hər iki dünyanın bir-biri ilə necə əlaqəli olmasını gördün. Yəni deyilən sözlə daxili ideyaya keçidin şahidi oldun. Düzgün və səhv mövqeni bu cür obrazlaşdırmaq olar.

Bir nəfər mübarək Peyğəmbərimiz Məhəmmədin, ona Allahın xeyir-duası və salamı olsun, hədislərindən bu sözləri eşidir: «Allahın mələkləri şəkil və it olan evə girmirlər». O, buna baxmayaraq, evdə it saxlayaraq deyir: «Eşidilənin daxili aləmdə ifadə olunmağa çalışılanla böyük fərqi var». Peyğəmbər sadəcə demək istəmişdir: «Qəlb evindən it qəzəbini qov», çünki it qəzəbi bilik üçün bir əngəldir. Bilik isə mələklərin şüasından gəlir. Qəzəb isə əqlin iblisidir».

Başqa birisi isə bu hədisdə deyilənləri olduğu kimi qəbul edib belə deyir: «İt yalnız xarici görkəminə görə it sayılmır, onun daxili aləmində də vəhşilik və azğınlıq var. Əgər mənim evim deyilən şəkildə itdən azad olmalıdırsa, atamın evi daha artıq dərə-

cədə mənəvi təmiz olub, bu heyvandan uzaq olmalıdır».

Həqiqətdə isə bu hər iki xüsusiyyəti özündə birləşdirən insan kamil insandır: «Kamil insan o kəsdir ki, bilik işığının itaət işığını zəiflətməsinə imkan vermir». Eyni zamanda bu insanlar daxili zənginlikləri daxili işıq vasitəsilə dinin hər hansı bir tələbini özlərindən uzaq etmirlər.

Bu cür əməllər böyük bir səhvdir. Bəzən özündən razı haqq yolçuları kamillik zirvəsinə qalxarkən şəriətin bəzi tələblərini müvəqqəti və yaxud da həmişəlik kənara qoyub, buna müəyyən haqq qazandırırlar. Bu, ona bənzəyir ki, kimsə lazımsız bilib, xalçanı büküb kənara qoysun. Bəzən elə insanlar olur ki, namazın vacibliyini dərk etməyib: «Mən həmişə ürəyimdə dua edirəm, bu dua mənim üçün namazdır»,- deyirlər.

Düzdür, bu səhvləri sufiyanə oyun oynayan sarsaqların etdiyi səhvlər ilə eyniləşdirmək olmaz. Onlar bəzən belə deyirlər ki, «Allaha bizim işlərimiz lazım deyil» və ya «ürək naqisliklərlə doludur və onlardan qurtulmaq qeyri-mümkündür». Onlar belə bir fikir irəli sürürlər ki, ruhlarını, qəlblərini kindən, küdurətdən təmizləmək qeyri-mümkün olduğu üçün buna heç cəhd də etmək lazım deyil.

Sonuncular, əlbəttə ki, sarsaqların sarsağı sayıla bilər. O ki qaldı birincilərə, onları axsayan bir ata bənzətmək olar və ya onlar bir yolçudurlar ki, yollarından şeytanın tələsinə düşərək sarpırlar.

Bizim bayaqkı ayaqqabı çıxarmaq məsələsinə qayıdaraq demək lazımdır ki, sözün xarici mənası daxili mahiyyət kəsb edir. Xarici mahiyyət həqiqi anlam daşıyır. Daha doğrusu, bu həqiqi anlam onun daxili mahiyyətini təşkil edir. Hər həqiqi anlam özünəməxsus həqiqi mahiyyətə malikdir. Bunu dərk edənlər şəffaf şüşə səviyyəsinə qalxanlardır (bir qədər sonra biz bu məsələyə toxunacağıq). Bu ona görə baş verir ki, gildən düzəldilmiş insana təsir edən təxəyyül öz işini görmüş olur. Gil həqiqi mahiyyəti gizlədir. O, görünməz işığı sənin üçün qapayır. Lakin sən onu təmizləsən, o, şəffaf şüşəyə dönər və işığın qarşısını almaz, əksinə, onun keçiricisi olar. Xeyr, o daha çox bu işığın qoruyucusu olub, küləklərin onu keçirməsinə imkan verməyən qaba çevrilə bilər.

İndi isə şəffaf şüşə haqqında danışmaq lazımdır. Hələlik unutma ki, aşağı dünyəvi aləm Allahın peyğəmbərləri üçün bəşəri dünyada olan bir mərhələ təşkil etmişdir. Həqiqətin görünən tərəfi öz arxasında sirr saxlayır. Bu, «dağın», «atəşin» və digərlərinin oxşarı kimi görünür.

(5) Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, deyərkən: «Mən Əbdürrəhmanın Cənnətə sürünərək daxil olduğunu görmüşəm», – elə düşünmə ki, o, bunu öz gözləri ilə görməyib. O, bunu həqiqi olaraq görmüşdür. Necə ki, bir insan yuxu görür. Bu görüntülərdə yuxunun effekti ondan ibarətdir ki, o, hissin qəlb üzərindəki hökmranlığının qarşısını alır. Qəlb isə ilahi işıq deməkdir. Hisslər isə insanın qəlbinə hakim olaraq, onu ilahi şahlıqdan bu hissi aləmə qaytarmağa çalışır.

Lakin hisslərə hakim olmaqla peyğəmbərlik şüaları elə güclənə bilər ki, hisslər bir daha onun diqqətini çəkib bu dünyanı geri qaytara bilməz. Bu baxımdan o, başqalarının yalnız yuxuda gördüyünü həqiqi olaraq görə bilir. Əgər ruh mütləq kamilliyə çatıbsa, o yalnız formanı dərk etməklə qalmayıb, birbaşa ideyaya da müdaxilə etməyi bilir. Və məhz bu cür qəlb Əbdürrəhmanın Cənnətə düşdüyünü görə bilər. Var-dövlət isə insan hissini daim aşağı çəkir. Əgər insanı dünyəvi əməllərə çəkən hisslər insanı görünməz aləmə çəkən hiss və işıqdan daha güclüdürsə, bu zaman qəlb Cənnətə olan yolçuluğundan geri dönə bilər.

Yox, əgər dinə olan inam güclüdürsə, ruh, sadəcə olaraq, öz yolunda bir qədər çətinliklərlə qarşılaşır. Lakin nəyin bahasına olursa-olsun öz yolunu davam etdirir. Bunu bu fani dünyada sürünməyə bənzətmək olar. Bax bu cür təxəyyülün şəffaflığı ilə sirləri açmaq mümkündür.

Peyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, gördüklərini yalnız Əbdürrəhmanla kifayətləndirmək olmaz. O, dini və imanı güclü, ruhu sağlam olan hər bir insan haqqında mühakimə yürüdə bilir. Lakin kimin ki var-dövləti çoxdur və onlar maddiyyata bağlı olsalar da, öz yollarından çəkinmirlər. Demək, belə insanların inamı həddən artıq güclüdür.

Bu misal göstərir ki, peyğəmbərlər hansı üsulla konkret obyektlərə baxaraq onların arxasındakı ideyaları görə bilirmişlər. Daha çox ideyalar onların daxili aləminə görsənir, lakin daha sonra oradan təxəyyül ruhuna eniş baş verib, ideyaya bənzər hər hansı bir konkret obyektin obrazı yaranırdı. Bu baxımdan yuxular mütləq yozulmalar tələb edir.

### İkinci sütun
### Quranın mahiyyətini anlaya biləcəyimiz bilgilərə görə nura sahib insan qəlblərinin dərəcələri

Onlardan birincisi hiss ruhudur. O, informasiyanı qəbul edir. Bu informasiya isə hiss orqanlarına əsasən əldə edilir. Beləliklə,

o, heyvani ruhun əsasını təşkil edir ki, buna görə heyvan heyvan kimi mövcud olur. Bu hiss yeni doğulmuş uşaqda da var.

İkinci, təxəyyül ruhudur. O, informasiyanı qeydə alaraq özündə saxlayır. Bu informasiya hiss orqanlarına əsasən əldə edilir. Hiss ruhu lazım gəldikdə əldə etdiyi informasiyanı özündən daha yüksək mövqedə dayanan ağıl ruhuna ötürür. Uşaq doğularkən o, bu hisslə doğulmur. Bu səbəbdəndir ki, uşaq nə isə gördükdə onu götürmək istəyir. Bu əşya onun gözünün qabağından itdikdən sonra onu unudur. Və onun ürəyi görmədiyini istəmir. Bir qədər böyüdükdən sonra isə o, gördüyü əşyaları ağlayaraq tələb edir. Çünki bu əşyalar onun təxəyyülündə qalır.

Bəzi heyvanlarda bu xüsusiyyət var. Başqalarında isə yoxdur. Məsələn, şamda yanan kəpənəkdə bu xüsusiyyət olmur. O, elə fikirləşir ki, işıq bir şüşədir. Və ona doğru can atır və əgər o, qaranlığa tərəf uçursa, yenidən bu atəşə doğru geri dönür. Və əgər onun yaddaşı olsaydı, o, atəşin ona verdiyi ağrı və acını xatırlayıb, bir daha geri dönməzdi. İt isə taxta ilə bir dəfə vurulduqdan sonra bunu xatırlayır və hər dəfə bu adamı gördükdə ondan qorxub qaçır.

Üçüncü ruh ağıl ruhudur. O, hiss və təxəyyül aləmindən uzaq olan ideyaları qəbul edir. Bu xüsusiyyət yalnız insana məxsusdur, hətta körpə uşaqlarda da olmur.

Ağılın əsas silahı dərketmədir. Biz bu haqda ağıl işığının göz işığından üstünlüyü haqqında danışarkən qeyd etmişik.

Dördüncü, mühakimə ruhudur. O, ağıldan məlumatları götürərək müəyyən fikirlər formalaşdırır. Burada müqayisə əsas rol oynayır. Daha sonra o, məsəl üçün, iki su götürüb, onları müqayisə edib və yeni fikir əldə edərək mühakimə yürüdür. Və bu, sonsuzluğa qədər davam edə bilər.

Beşinci, peyğəmbərlik ruhudur. Bu ruha peyğəmbərlər və övliyalar məxsusdur. Onun vasitəsilə o biri aləmin qanunları aydınlaşdırılır, elə bu dünyaya məxsus anlayışlar da işıqlığa qovuşdurulur. Kəlam, ilahi elmlər, adi ağıl və pak qəlblə aydınlaşdırıla bilinmədiyi halda, bu, ruhla işığa qovuşdurulur. Allah buna işarə ilə bildirmişdir: *«Sənə də beləcə əmrimizdən olan bir vəhy göndərdik. Sən kitab nədir, iman nədir bilməzdin. Lakin Biz onu bəndələrimizdən dilədiyimizi haqq yola qovuşdurmağımız üçün bir nur etdik. Sən (onunla insanları) düz yola yönəldirsən» (Quran, 42:52)*

Ağıl müstəvisindən yüksəkdə müstəvi yoxdur. Bütün şeylər bu müstəvidə təzahür edir. Hiss müstəvisi isə ağıl müstəvisindən daha aşağıda yerləşir.

Özünü kamillik zirvəsi saymaqdan çəkindir. Məsəl üçün, bəzi insanlarda anadangəlmə poeziyaya meyillilik var. Bu bacarıq bir növ vergidir. Bu isə seçilmişlərə verilmiş xüsusiyyətdir. Qeyri-seçilmişlərə isə belə xüsusiyyət verilmir. Seçilmişlərdə bu xüsusiyyət o qədər güclü olur ki, sevinc, kədər, göz yaşı, çılğınlıq, hətta insan öldürməyə gətirə biləcək ekstaz səviyyəli mahm, musiqi, poeziya nümunələri yarada bilirlər. Bu effektlər anadangəlmə vergisi olanlarda daha güclü təzahür edir.

Bu xüsusiyyətdən məhrum insanlar musiqini başqaları kimi eşitsələr də, emosional effektə nail ola bilmirlər və yaxud bu effekt onlarda çox zəif olur. Və onlar bu effektdən huşunu itirən insanlar gördükdə təəccüblərini gizlətmirlər və hətta bu effekti yarada bilən ən güclü insanlar da ona nəyi isə başa salmağa çalışsalar da, o, heç nə anlamayacaqdır.

Bütün bunları başa düşmək üçün sənə ən adi bir misalı göstərmək istərdim.

Bunları başa düşmək üçün peyğəmbərlik duyğusunu təsəvvür et. Övliyalarda bu xüsusiyyət mövcuddur. Əgər sən bu həddə çata bilməsən, müəyyən məşğələlər və sillogizmlər vasitəsilə bu haqda məlumatı olanlardan biri ola bilərsən. Lakin əgər bu da sənin imkanların xaricindədirsə, onda buna inananlardan biri ola bilərsən: *«Qalxın ki, Allah sizlərdən iman gətirənlərin və elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın»(Quran, 58:11).*

Bilik dindən üstündür, mistik duyğu isə elmdən. Mistik hissin obyekti hissdir, elmin obyekti isə məntiqi düşünməkdir, dinin obyekti isə ilk öncə qeyd edilən iki anlayışa etibarlı münasibətlə bərabər, ataların düşüncələrini kor-koranə qəbul etmək.

İndi isə sən insan ruhunun beş məqamını bilirsən. Və onların hər biri işıqdır. Onların vasitəsilə hər şey, hətta hiss və təxəyyül də təzahür edir. Heyvanlarda da hiss təzahürü var. Lakin insan daha təmiz, daha yüksək nümunələri dərk edə bilir. Heyvanlar üçün bu xüsusiyyət insanlara qulluq və qida əldə etmək üçün verilir. İnsanlara isə bu xüsusiyyət ona görə verilib ki, onlar ali məqsədlərə xidmət etsin və dinin əsas prinsiplərini həyata keçirmək mümkün olsun.

Misal üçün, adi baxışla hər hansı bir insanı görən bəndə ağılın köməkliyi ilə universal və mütləq ideyanı tuta bilər. Bu haqda biz Əbdürrəhman ibn Əvfa barədə olan misalda məlumat vermişik.

III Hissə

# NUR (İŞIQ) HAQQINDA AYƏYƏ VƏ PƏRDƏ HAQQINDA HƏDİSƏ ƏLAVƏ

İndi isə biz qeyd olunan ayədəki bənzətmə haqqında düşüncələrin nədən ibarət olduğuna yaxınlaşdıq.

**İşıq haqqında ayədə olan bənzətmələr haqqında**

Ruh haqqında olan beş fəslin paralelləri və beşlik (şüa, şüşə, çıraq, ağac və qətran) haqqında deyimlər uzun sürə bilər. Lakin biz bənzətmə metodunu istifadə edərək qısa olmağa çalışacağıq.

1. Ruhu təsəvvür edin. Sən görürsən ki, onun şüaları göz, burun, qulaq və s. deliklərdən daxil ola bilir. Bizim dünyada olan ən gözəl bənzətmə isə divardakı çıraq üçün olan şüadır.

2. Gəl ikinci ruhu – təsəvvür ruhunu götürək. O, üç xüsusiyyətə malikdir. Birincisi, o, bu dünyanın yaradıldığı kobud məmulatdan hazırlanıb. Çünki onun obyekti müəyyən ölçü və formaya malikdir. Və onlar baxış məsafəsində subyektə uyğun gəlirlər.

Kobud substansiya üçün əsas xüsusiyyətlərdən biri də odur ki, o, işıqlı və təmiz ağıl üçün qeyri-şəffafdır.

İkincisi, əgər bu substansiya təmizlənib cilalansa, o, çıxan şüa üçün şəffaf olacaqdır.

Üçüncüsü, ilk dönəmdə təsəvvür ona görə vacibdir ki, onun köməkliyi ilə dərrakəni nəzarətdə saxlamaq mümkün olsun. Bu yolla biliklərin qarışması və itməsinin qarşısını almaq olar. Təsəvvürlər vasitəsi ilə təqdim edilən obrazlar ağılın təqdim etdiyi biliklərlə bir saxlanılır. Beləliklə, bu üç xüsusiyyət şüşəni təşkil edir. Çünki şüşə də qeyri-şəffaf olur. Lakin o, təmizlənib cilalandıqdan sonra çıraq üçün yararlı vəziyyətə düşür və işıq ondan keçir. Və eyni zamanda şüşə çırağın küləkdən sönməsinin qarşısını ala bilir. Təsəvvürü bundan da gözəl nə ilə bənzətmək olar.

3. İlahi ideyaları qavrayan ağıl ruhu: onun bənzəri sənin üçün aydın olmalıdır. Əvvəlki izahlardan sən artıq bilirsən ki, peyğəmbərlər «işıq saçan çıraqdır».

4. Dərrakə ruhu; onun xüsusiyyəti odur ki, o, hər hansı bir fikri götürüb, ondan iki fikir düzəldir. Daha sonra isə bu iki də

dörd olur. Bu proses çoxsaylı məntiqi bölmələrə qədər davam edə bilər. Nəticədə isə müəyyən mühakimələr yürüdülür. Bu mühakimələri də bölünmə ardıcıllığı ilə çoxaltmaq mümkündür.

Bizim dünyada bunun oxşarı ağacdır. Daha sonra əgər biz nəzərə alsaq ki, dərrakə üçün material bölünən fikir olur, bu zaman onu heyva, alma, nar kimi ağaclarla eyniləşdirə bilmərik. Bu bənzətmə ağacı yalnız yağlı bitkilər ola bilər. Çünki yağ çırağı işıqlandıra bilir və çıraqdakı işığı çoxaldıb paylaya bilir.

Yenə də qeyd etmək lazımdır ki, əgər insanlar hər hansı bir ağacı bərəkətli ağac sayırlarsa, bu yalnız onun bəhərinin mütləq olaraq əbədi olmasından irəli gələ bilər.

5. Övliyalarda olan müqəddəs peyğəmbər ruhu; bu yalnız o zaman baş verir ki, ruh müəyyən təmizlik və parlaqlıq səviyyəsinə çatsın. Düşünmə ruhu öyrədilməli və təlim olan hissəyə ayrılır. Bunun üçün xaricdən müdaxilə tələb edilir. Bu müdaxilə nəticəsində ruh daim biliklər əldə edir. Ruhun digər hissəsi isə özü-özlüyündə mütləq olaraq təmizdir. Xaricdən müdaxilə edilmədən də parıldaya bilir. Bu düşüncələri tətbiq edərkən Qurandakı bu ayənin nə qədər dürüst olduğuna əmin oluruq: *«Onun yağı hətta atəş toxunmadan da yanmağa hazırdır» (Quran 24: 35)*. Elə övliyalar var ki, onların ziyası sanki peyğəmbərlərdən gələn atəş onlara toxunmadan da işıqlanmağa hazırdır. Peyğəmbərlərin ziyası isə öz növbəsində mələklərin atəşi onlara toxunmadan işıqlanmağa hazır vəziyyətdədir. Bu bənzətmə ruhun yalnız bu xüsusiyyətdə olanlarına aiddir.

Çünki insan ruhu müxtəlif səviyyə və dərəcələrə bölünür. Birinci, hiss təxəyyüldür. Ağıl və düşüncə ruhu isə onlara dayanır. Bu izah edir ki, nə üçün şüşə çıraqda yerləşir. Şüa isə şüşənin içində. Başqa cür desək, atəş şüşədə, şüşə isə şüa ilə əhatə olunmuş vəziyyətdə yerləşir.

Ən nəhayət, biz görürük ki, *«işıq içində işıq!» (Quran 24: 35)* ifadəsi işığın birinin digərinə olan əlaqəsini göstərir.

**Zülmət haqqında ayədəki bənzətmələr**

«İşıq» anlamına olan bənzətmə yalnız inanan qəlblərə aid edilə bilər. Yəni peyğəmbərlərə, övliyalara aid olunması mümkündür. İnanmayanlar üçün isə işıq anlamı yalnız dürüst yol mənasını daşıyır.

Kim ki haqq yolundan dönüb, o səhv edib. Və onu zülmət gözləyir. Çünki zülmət insanı heç bir yana aparmır. İnanmayanla-

rın ağlı isə zülmətə büründüyü üçün öz sahiblərini də haqqa çatdıra bilməzlər. Onlar sanki *«əngin dənizin zülmətinə bənzər. Onu bir dalğa, o dalğanın üstündən bir dalğa, onun da üstündən bir bulud (dalğa) – zülmət üstündən zülmət örtər» (Quran, 24:40).* Bu dəniz təlatümü bəşəri həyatdır. Yəni ölümcül təhlükələrin, zülmün baş verəcəyi, insanın gözünü tutan problemlər dünyasıdır. Birinci dalğa dənizdir. Bu, insanın arzularının təxəyyülünün oxşarıdır. Ruh hissi əyləncələrə uyaraq bəşəri məqsədlər dalınca qaçır: *«Səfa sürər, heyvan kimi yeyib-içərlər. Cəhənnəm odu onların məskəni olacaqdır!» (Quran, 47: 12).* Bu, dəniz təlatümünü ifadə edir. Çünki bütün bu insanı ehtiraslara bağlayan anlayışlar ruhu kar və kor edir. İkinci dalğa heyvani atributlar olub insanın ruhunu düşmənçiliyə, nifrətə, paxıllığa, lovğalığa, özündən razılığa çəkir. Bu, özü də bir növ zülmətdir. Çünki qəzəb insan ağlı üçün bir iblisdir. O həm də yüksək bir dalğadır. O, insanın təxəyyülündən də güclü qüvvəyə malikdir. Artan qəzəb isə insanı təmiz hisslərdən alıb aparır.

Nəhayət, «bulud» insanı əhatə edən yanlış fikirlər, səhv dini fikirlərdir. Bu bulud Qurandan gələn günəş şüalarının insanın qəlbinə daxil olmasının qarşısını alır. Çünki bulud da günəşin şüalarının qarşısını almaq xüsusiyyətinə malikdir. Bu baxımdan bu üç anlayış bir ifadə ilə çox mükəmməl təsvir olunub: *«...onun da üstündən bir bulud (dalğa) – zülmət üstündən zülmət» (Quran, 24:40).* Onlar yaxında olanı gizlədir. Kafir üçün yaxında olan peyğəmbərin dedikləridir. Bu insanlar haqqında yaxşı deyilib: «O, əlini uzadanda heç öz əlini də görmür».

Və ən nəhayət, bütün bu şüaların öz başlanğıcını ilkin və vahid olan başlanğıcdan alması haqda fikirlərə insanlar inansalar, o zaman haqlı olaraq düşünmək olar ki: *«Allah bir kəsə nur bəxş etməsə, onun nuru olmaz» (Quran, 24: 40).* İndi isə sən bu ayənin sirləri haqqında məlumata malik oldun.

### Yetmiş min pərdə haqqında olan hədisin bənzətmələrinə izahat

«Allah yetmiş min işıq və zülmət pərdəsinə malikdir» hədisi hansı məna daşıyır. «Əgər O, bu pərdələri açsaydı, Onun simasının parlaqlığı hər baxanı yandırıb-yaxardı» (Bəzi mənbələrdə yeddi yüz, bəzilərində isə yetmiş min pərdə göstərilir). Mən bunu belə izah edərdim. Allah özü özlüyündə parıldayıb işıq saçır. Pərdə şüa

gizlədilən insanlar üçün nəzərdə tutula bilər. Beləlari isə insanlar arasında üç cür ola bilər. Bu pərdələr isə onlar üçün ya zülmət, ya yarı zülmət, yarı işıqlıq və yaxud təmiz işıqlıq yarada bilər.

Şübhəsiz demək olar ki, bu üç cür kateqoriya arasında müxtəlif ölçülər mövcuddur. Mən, şübhəsiz ki, müəyyən mərhələləri sadalaya bilərdim. Lakin heç kəs bu sıralanmanı dəqiq və dürüst olaraq bilmir.

Bu pərdələrin yeddi yüz və ya yetmiş min olduğunu bilmək isə yalnız peyğəmbərlərə məxsusdur. Mənim zənnimcə, burada konkret ifadə mütləq olaraq sayı ehtiva etmir. Çünki bəzi hallarda sayın çoxluğu məsələyə baxışın böyüklüyünü göstərmək üçün tətbiq edilir. Hər halda Allah daha yaxşı bilir. Bu məqam, əlbəttə ki, mənim səlahiyyətimdən yüksəkdə dursa da, bu üç kateqoriya haqqında müəyyən fikir söyləyə bilərəm.

### 1. Pərdə ilə zülmətin örtülməsi

Birinci kateqoriyaya allahsızlar aiddir və onlar təmiz zülmətə bürünüblər. *«Allaha, onun mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə inanmayan şəxs, şübhəsiz ki, (doğru yoldan) çox azmışdır» (Quran, 4:136).*

Bunlar o şəxslərdir ki, dünyanın yaranışının səbəbi kimi təbiəti görürlər. Lakin təbiət maddi substansiyadır. Və o nə biliyə, nə bacarığa, nə qavramaya, nə dərrakəyə, nə özünüdərkə, nə də işığı fiziki imkanlarla qəbul etməyə malikdir.

İkinci, bunlar o kəslərdir ki, özləri ilə məşğul olub, gerçəkliyin ilkin səbəbini araşdırmaq istəmirlər. Onlar heyvan kimi yaşayırlar. Onların pərdəsi şəxsi eqoizmləridir. Eyni zamanda onlar üçün şəxsi arzular və özündən razılıq zülmət pərdəsini təşkil edir. Allah onlar haqqında belə buyurub: *«Nəfsini özünə Tanrı edəni gördünmü? Onun vəkili (zamini) sənmi olacaqsan?» (Quran, 25:43).* Və Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Cismani ehtiras insanların yerdə itaət etdikləri yalançı Allahdır».

Sonuncu kateqoriyanı isə ən son sıraya qoymaq olar. Bu qrupa daxil olan insanların fikrincə, bu dünyada ən ali məqsəd şəhvət, qidalanma, yemək və heyvani hisslərə üstünlük verməkdir. Onlar həzz qullarıdır. Həzz onların Allahıdır. Həzz onların məqsədidir və onlar buna çatdıqda belə düşünürlər ki, xoşbəxtliyə və kamilliyə yetişiblər. Öz iradələrindən onlar özlərini nəinki hey-

vanla bir və hətta heyvandan da aşağı sıraya qoyurlar. Bundan da qaranlıq bir zülmət təsəvvür etmək olarmı?

Bu insanlar əsl zülmətə bürünüblər.

Digər qrup insanlar isə həyatın mənasını müharibədə, işğalda, qan töküb qənimət, qul ələ keçirməkdə görürlər. Belələrinə kürdləri və ərəbləri daxil etmək olar. Onlar hətta aşağı səviyyədə olmaları ilə fəxr edənlərdir.

Üçüncü qrup isə belə düşünür ki, ən ali məqsəd maddi rifah əldə etməkdir. Onların fikrincə, maddi rifah insanı xoşbəxtliyə apara bilər. Onlar çoxlu torpaq, malikanə, cins atlar, otlaq yerləri və s. əldə etməklə həyatlarını keçirirlər.

Bu insanlar quruda, suda əzab-əziyyətə qatlaşaraq ömürlərini ağır əməyə sərf edirlər. Onlar hətta öz qazandıqlarını da nəinki başqlarına, heç özlərinə də sərf etmirlər. Onlar haqqında Peyğəmbərimiz, ona Allahın xeyir-duası və salamı olsun, belə demişdir: «Bədbəxt, pulun qulu! Bədbəxt, qızılın qulu!». Əlbəttə ki, bundan da qaranlıq bir zülmət hesab etmək olarmı ki, qızıl və gümüş kimi dəmir parçası insan üçün ali məqsəd olsun. Qızıl və gümüş müəyyən məqsədlərə nail olmaq üçün bir vahid kimi qəbul olunmasaydı, ən adi dəmir olardı.

Dördüncü qrup axmaqlar isə şan-şöhrəti həyatın əsas məqsədi hesab edirlər. Onlar üçün cəmiyyətdə yüksək mövqe qazanmaq, başqalarına təsiretmə gücünə malik olmaq ən ali və yüksək qiymətdir. Onlar hətta güzgüyə də baxanda özlərindən zövq alırlar.

Onlar hətta ən sonuncu pulunu paltara xərcləyib, ac qalmağa razıdırlar, təki küçədə gəzərkən insanlar ona baxsın.

Bu cür axmaqların sayı-hesabı yoxdur. Və bütün onlar pərdə ilə Allahdan ayrılmışlardır. Onlar özlüyündə zülmətin mahiyyətini təşkil edənlərdir.

Bir qrup insanlar da vardır ki, «Allahdan başqa Allah yoxdur» ifadəsi onlar üçün heç nə ehtiva etmir. Onlar bu kəlamı ona görə dillərinə gətirirlər ki, ya müsəlmanlardan maddi dəstək alsınlar, ya da kor-koranə də olsa, atalarının yolunu tutduqlarını ətrafdakılara nümayiş etdirsinlər.

Əgər təkallahlılığa inam onların əməlində büruzə verilməsə, onlar heç vaxt zülmətdən işığa yüksələ bilməyəcəklər.

Onların müəllimləri onları zülmətə sürükləyən şeytanlardır. Lakin əgər bir insan təkallahlılığa gəlib bəd əməllərdən üz döndərirsə, böyük günahkar da olsa, zülmətdən işığa addımlayanlardan sayılar.

**2. Yarıya qədər zülmətə, yarıya qədər isə işıq pərdəsinə bürünənlər haqqında**

İkinci kateqoriyaya daxil olanlar yarıyacan zülmət, yarıya qədər isə işıq pərdəsinə bürənənlərdir. Buraya üç qrup daxildir: birincilər zülməti hissləri ilə yaradanlardır. İkincilər təxəyyüldən zülmətə düşənlərdir. Üçüncülər isə yalnış düşüncələrlə zülmətə qərq olanlardır.

Beləliklə, birinci qrupa daxil olanlar hisslə zülmətə düşənlərdir. Buraya daxil olanlardan bütpərəstlər və dualistləri göstərmək olar. Hərçənd ki, onların da arasında müxtəlif mövqelərdə duranlar var.

Bütpərəstlər belə düşünürlər ki, onların Allah bilib tapındıqları hər şeydən və hər kəsdən qüdrətli olan varlıqdır. Onlar qiymətli metallardan – qızıldan, gümüşdən müxtəlif fiqurlar düzəldib, onu zinət əşyaları ilə bəzəyirlər. Daha sonra isə bu fiqurları Allah kimi qəbul edib, ona sitayiş edirlər. Bu insanlar Allahın böyüklüyü və gözəlliyini daşıyan şüaların qarşısını alan bir zülmətə bürünənlərdir. Çünki onların ilahi axtarışlarının əsasını hissi aləmləri təşkil edir. Hiss isə insanın daha yüksək məqamları və ruhi vəziyyəti ifadə edən Allahın mahiyyətini dərk etmək üçün bir maneədir. Əvvəldə qeyd etdiyimiz kimi, hiss ruh dünyası ilə müqayisədə zülmətdən başqa, bir şey deyil.

İkinci qrupa daxil olanlar isə ayrı-ayrı türk tayfalarını təşkil edənlərdir. Onların mütəşəkkil nəzəri hazırlığı olan dini təsəvvürləri yoxdur. Onlarda hətta dini qanunlar da yoxdur. Beləəri, sadəcə olaraq, inanırlar ki, onların Allahları var və bu Allah çox gözəldir. Onlar gözəl insan, ağac, ad və s. gördükdə onu özlərinə Allah seçib sitayiş edirlər. Beləəri gözəlliklə həmahəng təşkil edən zülmətə bürünənlərdir. Lakin onlar bütpərəstlərə nisbətən işıqlı dünyaya, onu müəyyən etməyə doğru bir qədər irəliləmişlərdəndirlər. Çünki onlar gözəlliyə fərdi yox, mütləq mənada yanaşırlar. Onlar üçün Allahlarının təzahürü konkret nədə və yaxud kimdə isə olmayıb, gözəlliklə bağlanaraq dəyişkən xarakter daşıyır. Onlar öz əlləri ilə yaratdıqlarına yox, təbiətin gözəlliyinə sitayiş edirlər.

Üçüncü qrup isə belə deyir: «Bizim Allahımız mahiyyətində olduğu kimi parıldamalı, siması şəfəq saçmalı, qüdrətli olmalı, qorxunc görsənməli, yaxınlığı qəbul etməməli və eyni zamanda hissi olaraq da qavranmalıdır». Beləəri bu xüsusiyyəti atəşdə görərək, ona sitayiş edirlər. Onlar hakimiyyət və şöhrət pərdəsinə bürünənlərdir.

Dördüncü qrup isə belə düşünür ki, əgər insan atəşi həm yandıra, həm də söndürə bilirsə, ondan Allah çıxmaz. Yalnız çox-çox yüksəkdə dayanan şöhrət və hakimiyyət xüsusiyyətinə malik olan Allah adlandırıla bilər. Bəzi xalqlarda astrologiya din səviyyəsində təbliğ edilir. Və bəziləri hər ulduza malik olduğu xüsusiyyətə görə Allahlıq məxsus edirlər. Bəziləri qütb ulduzuna, bəziləri Yupiterə, digərləri isə ümumiyyətlə, hər hansı göy cisminə sitayiş edirlər.

Belələri işıq, daha doğrusu, yüksək işıq, parıltı və qüdrət pərdəsinə bürünənlərdir.

Beşinci qrup da onlar kimi düşünsə də, belə deyirlər: «Bizim Tanrımız kiçik bir parıltıdan ibarət ola bilməz. O, çox böyük olmalıdır». Bu səbəbdən onlar günəşə sitayiş edirlər.

Altıncı qrup isə belə düşünür ki, əgər günəş, ay və ulduzlar ayrılıqda Allahdırsa, deməli, Allaha şəriklər çoxdur. Bu isə qeyri-mümkündür. Onların fikrincə, Allah işıqdır və bu işıq mütləq işıqdır. O, heç nədən yaranmayan, özü özlüyündən doğan işıqdır.

Daha sonra onlar belə düşünürlər ki, bu dünyada zülm də olduğu üçün, deməli, onların Allahı, yəni işıq bu zülmə qarşı çıxır. Onlar bu iki ilahi varlığı Əhrimən və Yəzdəkir kimi adlandırırlar. Bu qrup dualistlərdir.

Yuxarıda qeyd olunan bölgü son hədd deyildir. Bundan da başqa bölgülər aparmaq olar.

İkinci mərhələdə olanlar isə yarı işıq, yarı isə təxəyyüldən gələn zülmət pərdəsinə bürünənlərdir. Onlar hisslər aləmindən daha üstün bir aləmin olduğunu qəbul etsələr də, təxəyyül aləmini aşa bilməyənlərdir. Bu baxımdan onlar taxta əyləşən varlığa inananlardır. Onların ən aşağı səviyyədə olanları belə düşünür ki, Allah hansısa cisimdə öz ifadəsini tapa bilir. Bu qrup insanlar haqqında biz çox danışmayacağıq. Çünki onların fikirlərini burada yazmağın heç bir mənası yoxdur. Bu qrupa daxil olanların ən yüksək mövqedə duranları isə Allahın maddi olmasını rədd edib, yalnız ona istiqaməti qəbul edənlərdir. Onların fikrincə, Allaha doğru yalnız bir istiqamət var ki, bu da yuxarıdır.

Üçüncü qrupa daxil olanlar isə əqlin yalançı fikirlərinə uyanlardır. Onlar «eşidən, görən, bilikli, güclü, iradəli və həyati olan» Allaha inanırlar. Lakin onların Allah haqqında olan bu düşüncələri daha çox əxsi təxəyyülləri ilə bağlıdır. Yəni onlar insanda olan xüsusiyyətləri Allaha şamil etməkdən çəkinmirlər.

Bu səbəbdən onlardan bəziləri belə deyir ki, guya Allah da insanlar kimi səs çıxardıb, hərflərlə danışa bilir. Lakin onlardan bəziləri həqiqətə bir addım da yaxınlaşaraq belə deyirlər: «Xeyr, o daha çox bizim düşüncələrimizdə canlandırdığımız səssiz və hərfsiz nitqə malik ola bilər».

Beləliklə, bu qrupa daxil olanlara bildirdikdə ki, «eşitmə, görmə, həyatilik» və s. xüsusiyyətlər Allaha məxsus olan xüsusiyyətlərdir, onlar, sözün əsil mənasında, antropomorfizmə düçar oldular. Hərçənd ki, bunu tam qətiyyətlə inkar edirlər.

Beləliklə, onlar belə bir fikir irəli sürürlər ki, Allah təsadüfi xüsusiyyətlər daşıyır. Əvvəli və axırı var, ehtiyacı olandır və insanlara məxsus məqsədi var. Bütün bu mülahizələr bizə yaxşı tanış olduğu üçün elə də dərinə getmək fikrində deyilik. Gördüyümüz kimi, belələri yalançı qarışıq düşüncələr pərdəsinə bürünmüşlərdir. Bütün bu qruplar ikinci kateqoriyaya daxildirlər və onları bürüyən pərdə zülmət və işıqdan ibarət olmaqla iki hissəlidir.

### 3. Təmiz işıqla örtülənlər

Üçüncü qrupa daxil olanlar təmiz işıqdan ibarət olan pərdəyə bürünmüşlərdir. Onlar çoxsaylı qrupa bölünüblər. Mən bunlardan yalnız üçünü qeyd edəcəyəm.

Birinci qrup Allahın həqiqi xüsusiyyətlərini və mənasını başa düşərək müəyyən edənlərdir. Onlar anlayırlar ki, Allaha məxsus «nitq, iradə, güc, bilik» və s. xüsusiyyətləri insanlara aid olan eyni xüsusiyyətlərlə səhv salmaq düzgün deyil. Buradakı eyniyyət yalnız terminlərdədir.

Bunun nəticəsində onlar bu xüsusiyyətləri Onun əlamətləri və Onun yaratdıqlarını Onun təzahüratı kimi qəbul etmişlər. Musa da Fironun suallarına cavab verərkən eyni ilə belə etmişdir. *«Aləmlərin Rəbbi kimdir?» (Quran, 26:23), «Əgər yəqin inanacaqsınızsa, (bilin ki) O, göylərin, yerin və onların arasında olanların Rəbbidir » (Quran, 26:24).*

İkincilər isə daha yüksəkliyə qalxıblar. Onlar başa düşüblər ki, göy çoxsaylıdır. Və mələklər bu göyləri hərəkət etdirir. Və mələklər də çoxsaylıdır və onların başqa şüalara olan münasibəti ulduzların digər görünən şüalara olan münasibəti kimidir. Daha sonra onlar dərk etdilər ki, göylər başqa bir sfera ilə əhatə olunmuşdur. Onun hərəkəti isə 24 saat ərzində hər şeyi fəaliyyətdə saxlayır. Və bu yüksək sferanı idarə edən Allahdır. O isə təkdir. Çox ola bilməz.

Üçüncülər isə ikincilərdən daha yüksəyə qalxmışlar. Onların fikrincə, göy cisimlərinin hərəkəti Allaha olan sitayiş aktıdır. Bu akt isə Onun yaratdıqlarından biri olan mələklər tərəfindən həyata keçirilir. Mələklər, Ay digər görünən şüalar altında yerləşdiyi kimi, İlahi şüalar altında yerləşmişdirlər. Onların fikrincə, Allah itaət olunandır. Və bütün bu akt Onun fəaliyyəti ilə deyil, əmri ilə həyata keçirilir.

Bu əmrin necə olduğunu, hansı yolla həyata keçdiyini izah etmək çox çətindir. Bir çox ağıllar bu fikri tam açıqlaya bilməz. Buna şərh vermək üçün isə insanın ağlı bu kitabın səviyyəsini üstələməlidir.

Beləliklə, bu mərhələdə olanlar zülmət pərdəsinə bürünməyənlərdir.

**4. Tədqiqatın məqsədi**

4-cü mərhələ sahibi olan inananlar belə hesab edirlər ki, insanların ibadət etdiyi Yaradan onların düşündükləri kimi təklik və kamillik ifadə etmir. Bunun sirri isə bu kitabın sərhədlərindən çox-çox uzaqda yerləşir. Və ibadət edilənin həqiqi varlığa olan münasibəti günəşin işığa olan münasibəti kimidir.

Bu səbəbdən onlar üzlərini göyləri hərəkət etdirəndən, yüksək sferanı fəaliyyətə gətirəndən *çəkib, «Göyləri yaradana» (Quran 6:73)* , yüksək sferanı yaradana, hər şeyi hərəkətə gətirənə, insanın daxili və xarici gözü ilə dərk olunması qeyri-mümkün olana çevirdilər. Onlar belə fikrə gəliblər ki, O, ona aid edilən bütün xüsusiyyətlərdən çox-çox yüksəkdir.

Bu sonuncular da müxtəlif səviyyəyə bölünürlər. Onlardan bəziləri belə hesab edirlər ki, bütün hiss olunanlar məhv olub gedir. Və yalnız ruh qalır. O isə mütləq gözəlliyi və işıqlığı ifadə edir. Bu gözəllik və işıqlıq isə Allaha məxsus xüsusiyyətlərdir.

Ruhda bütün görünən anlayışlar məhv olub gedir. Yalnız görünməyənlər qalır.

Daha yüksək məqamlara isə seçilmişlərin seçilmişləri nail olmuşlar. Lakin onlar Qadir Allahın gözəl simasında «batıb getmişlər». Onları İlahi şöhrət məhv etmişdir. Onlar özləri özlərini yox etmişlər.

Bir Olandan və həqiqətdən başqa, heç nə qalmamışdır. Və onların *ruhu «Allahdan başqa hər şey məhvə məhkumdur» (Quran, 28:88)* sözünü, həqiqətən də, dərk etmişdir. Birinci fəsildə

biz bu məsələyə toxunmuşuq. Xüsusən «bütövləşmə» haqqında danışılarkən bu anlayış geniş şəkildə şərh edilmişdir.

Bu dərk edənlərin ən yüksək məqamıdır. Bəziləri yüksək məqama addım-addım, mərhələ-mərhələ deyil, vaxt itirmədən nail olmuşlar. Onlar isə ilk «ucunda» müqəddəslik biliklərinə yiyələnərək, Onun hər şeydən üstün olduğunu müəyyən etmişdilər.

Onlar başlanğıcda dediklərimin ən sonda əldə etdiklərinə yiyələnənlərdir. Güman etmək olar ki, bu yolun birinci yolçusu İbrahim əleyhissəlam, sonuncu yolçusu ilə Məhəmməd, ona Allahın xeyir-duası və salamı olsun, olmuşdur.

Yalnız Allah bu sirlərdən agahdır. Və onların işığa doğru gedən yoldakı mərhələlərini bilir.

Pərdə ilə örtülmüş kateqoriyaların növləri budur. Heç də təəccüblü olmazdı, əgər bütün bu məqamlar bu yolçuluqda səyyahları örtən pərdələr öyrənilib tədqiq edildikdən sonra onların sayının 70 min olduğu müəyyən edilsə idi. Hər halda sən diqqət etsən görərsən ki, onlardan heç biri bizim göstərdiyimiz səviyyədən kənara çıxmır. Çünki onlar bizim göstərdiyimiz kimi, ya öz insani atributları pərdəsi ilə, ya hisslərlə, təxəyyül, düşüncə və yaxud təmiz işıqla örtülməlidirlər.

Mənim fikrimin başqa yerə yönəlməsinə, dağınıq olmasına baxmayaraq, sənin sualına olan cavabım bax belədir. Mən güman etmək istərdim ki, mənim kəlamlarımın yanlış olduğu, ayaqlarımın büdrədiyi yerlərə görə sən mənim üçün mənim yerimə Allahdan üzr istəyəcəksən. Çünki İlahi sirlərlə dolu dəryaya baş vurmaq və burada ilahi işığı tapıb, onun haqqında danışmaq çox çətin və məsul bir işdir.

# MÜQƏDDİMƏ

## Sufi mənəviyyatı və rasionalizm

Əl-Qəzali elmin qızğın tərəfdarı, ağılın müdafiəçisi idi. Bu səbəbdən «Dini elmlərin dirçəlişi» kitabının əvvəli «Kitab əl-ilm» («Biliklər kitabı») ilə başlanır. Əl-Qəzalinin fikrincə, həqiqi bilik «vacib fəaliyyət» haqqında olan bilikdir. Kim ki onun mahiyyətini və zamanını dərk edə bilib, buna daha çox ehtiyac duyur. Yəni bilik vacib fəaliyyət ehtiyacından yaranır. Bu isə mahiyyət, səbəb, üsul, problemlərin həlli kimi məsələlərin aydınlaşdırılmasını tələb edir. Zülmlə qarşılaşmayan ona qərq olur. Bu problemi yalnız əks fəaliyyətlə həll etmək olar. Əks fəaliyyət isə mahiyyətlə əks səbəbdən yaranır. Bəs bu səbəbin mahiyyətini və bu zülmün kim tərəfindən yaradıldığını bilmədən və bu biliklərə sahib olmadan bunu əldə etmək mümkündürmü? Əl-Qəzali dəfələrlə qeyd etmişdir ki, onun analiz vaxtı tətbiq etdiyi metod digər sferalarda da tətbiq edilə bilər. Onun diqqətini daha çox cəlb edən isə din haqqında elm olan müəmmadır. O, ağıla münasibətdə də məhz bu nöqtədən çıxış edir. Əl-Qəzali tədqiq etdiyi digər mənəvi problemlər kimi, bu problemi də inkişaf etdirərək onun evolyusiyasına səbəb olmuşdur.

Əvvəl qeyd edildiyi kimi, əl-Qəzali bir çox əsərlərində ağılın və dərrakənin sərhədlərini müəyyənləşdirmişdir. O, «Dini elmlərin dirçəlişi» kitabının «İlm» adlı 7-ci başlığını ləyaqət, ağılın mahiyyəti və hissələri kimi problemlərə həsr etmişdir. Bu kitabın bütün hissələrində irəli sürülən fikirlərin rasional ifadəsi olan çoxsaylı mülahizələrə rast gəlmək mümkündür. Əl-Qəzalinin heç bir əsərində onun «ağılın mahiyyəti» adlandırdığı anlayışı əks etdirən heç bir fakta rast gəlinmir. Düzdür, buradakı rasionalizm dövrün irrasionallığından da uzaq olmamışdır. Məlumdur ki, hər dövrün özünəməxsus irrasional təsəvvürləri olmuş və onlar yalnız daha sonrakı dövrlərdə aydınlaşdırılmışdır. O hətta ağıldan yuxarı və yaxud ağıldan sonra gələn hər hansı bir mərhələ (məsələn, vilayə) haqqında məlumat verərkən də onu ağıla əks qoymaqdan çəkinmişdir. Belə ki, «Dərketmənin mübarək məqsədləri»ndə o qeyd edir ki, «vilayə mərhələsində əqlə uyğun heç bir şey ola bilməz.

Sadəcə, burada müəyyən məqamlar var ki, onu yalnız ağılla dərk etmək olmur. Ağılla dərk ediləni və dərk edilməyəni fərqləndirməyən insandan isə heç həmsöhbət olmaz». Ağıl fikrin bütün paradokslarını qəbul edə bilir. Lakin ağılın özünün də təzadları və məhdud imkanları var. O, dərk etmədə müəyyən sərhədə və məhdudiyyətə malikdir. Lakin ağılın bu «bacarıqsızlığı» irrasionallığın qəbul edilməsi kimi qavranmamalıdır. Əl-Qəzalinin əqli evolyusiyası onu elə bir mərhələyə gətirmişdir ki, o, buradan nəzəriyyənin «praktikliyini» praktikanın nəzəriyyəsi ilə dəyişməyə üstünlük vermişdir. Buna sübut kimi onun ağıl haqqında verdiyi bölgünü göstərmək olar.

O göstərirdi ki, ruh hisslə yox, ağılla dərk edilir. Ağılın ruha olan münasibəti isə ağanın qula olan münasibəti ilə bərabərdir. Ağılın gücü isə insana məxsus xüsusiyyətdir. Ağılla ehtiras arasında mübarizə olduqda isə «Allahdan gələn işıq ağıla kömək edir». Ağıl fəaliyyətin səbəbini də müəyyən edir. «Ehtiras məhdud ağıla malik olanları – sultan və dövlətliləri, ağıl isə müqəddəsləri - mömin, müdrik və alim insanları idarə edir». Ağılı ən yüksək xüsusiyyət kimi qəbul edən əl-Qəzali hətta belə bir fikir irəli sürürdü ki, ağıl olmadan ilahi vəhy də gələ bilməz. Həmçinin o, «İlahi yol», «İlahi öyüd», «İlahi yardım» kimi anlayışları da ağılla əlaqələndirərək ağıl olmadan bu anlayışların şərhini qeyri-mümkün sayırdı. Bu anlayışlar «ağılın daxilindən» və daxili ağıldan gəlir. Əl-Qəzali «fəaliyyətlərin ölçüsü» əsərində sübut edirdi ki, ağılın gücü özünü hiss və dini inamda təzahür etdirir. «Dini biliklərin dirçəlişi» kitabında o yazır ki, ağıl «biliyin əsası, başlanğıcı və mənbəyidir. Bilik ondan meyvə - ağacdan, işıq – günəşdən, baxış – gözdən ayrılan kimi ayrılır». Ağıl – həm bu, həm də o biri dünyada xoşbəxtlik əldə etmə yoludur. Əl-Qəzali ağılı bilikləri dərketmə qabiliyyətinə görə kateqoriyalandırır. Həmçinin onun fikrincə, ağıl intuitiv biliyi, praktik biliyi, praktik mənəvi biliyi dərketmə səviyyəsinə görə də qruplaşdırıla bilər. Biliyin bu dörd növü isə bir-biri ilə əlaqəlidir. Belə ki, bilik – əsas olandır. İntuitiv bilik onun törəməsidir. Praktik bilik isə hər ikisinin törəməsidir. Praktik – mənəvi ağıl isə onların nəticəsidir.

Əl-Qəzali onun ağılı bu cür müdafiə etməsinə qarşı çıxanlara hər zaman cavab verirdi. Onun fikrincə, Allahın və mövcud olan hər şeyin mahiyyətini kəsb edən «daxili ağıl işığını» necə inkar etmək olar? Axı insanı heyvandan fərqləndirən əsas xüsusiyyət onun dərrakəsidir.

Daxili «ağıl işığı» olmadan isə dərrakə qeyri-mümkündür. Hətta «İman işığı» (Nur əl-iman), «yəqinliyin mahiyyəti» (əyn əl-yəqin) kimi anlayışlar da həqiqi ağıl olmadan heç bir əhəmiyyət daşımırlar. Bəzilərinin «əyn əl-yəqin» və «nur əl-iman» deyərək başa düşdükləri isə elə əsl ağıldır.

Əl-Qəzali mənəvi davranış praktikasını sufilərin «daxili ağıl işığı» ilə birləşdirmək istəmişdir. Onlar bir-birinə çox oxşardırlar. Bu isə ağılın nəzəriyyəliyi ideyasının dəyişilməsi və sufi təsəvvürü və praktikası çərçivəsində mənəvi təsəvvür və davranışlarla bütövləşib, yeni şəkildə inkişaf etməsi deməkdir. Buna görə əl-Qəzali belə bir fikir irəli sürürdü ki, vəhylərin növləri və məqamları haqqında bilikləri peyğəmbər səviyyəsinə ucalmadan da öyrənmək olar. Xəstə həkim xəstəliyin səviyyəsi haqqında məlumatlı ola bilər. Saxta alim isə onun üçün tamamilə yad olan həqiqətin dərəcələri haqqında danışa bilər.

«Bilik – başqa bir şey, bilinənin mövcudiyyəti isə tamam ayrı anlayışdır. Peyğəmbərlik və müqəddəslik haqqında məlumata malik olan şəxs nə peyğəmbər, nə də mömin deməkdir. Və yaxud iman və ibadət haqqında məlumatı olan hələ iman əhli demək deyildir».

O, praktikliyin vacibliyini maksimum səviyyədə görürdü: «Bacardığın qədər yaşa – onsuz da öləcəksən; kimi istəyirsən sev – onsuz da ayrılacaqsan; istədiyin kimi davran – onsuz da sorğu-sual günü yaxınlaşır!». Lakin bu zülmləri qeyri-sufi anlayış kimi qavramaq olmaz. «Ey övlad!» əsərində o, dərk olunmayanın dərki üçün fərdi praktikanın vacibliyini göstərmişdir. Bu fikir özünün ən yüksək zirvəsini sufi anlayışı olan «ruha əlavə»də tapmışdır. Bu halda Zu-n-Nun əl-Misri belə demişdir: «Əgər sən ruhuna əlavə etmə bacarığına maliksənsə, et. Yox, əgər bacarmırsansa, sufi sərsəmləməsi ilə məşğul olma». Əl-Qəzali həqiqətin mütləq sərhədlərini biliyin və fəaliyyətin bütövlüyündə görmüşdür. O, onları konkret bir məkana aid etməyib. Mütləq və nisbi dialektikaya əməl edərək o, praktik dərrakənin əbədi formasını axtarmış və bunu qeyri-maraq sahəsinə daxil olan mütləq kriteriyalarda görmüşdür. O, mütləqliyə doğru olan «maraq və fayda axtarışını» inkar etmir və hərisliksiz ağılın, təmiz mənəviyyatda isə hərisliyin olmadığını göstərirdi. Ağıl dünyəvi ehtiraslar qarşısında hər zaman zəiflik göstərir və bu zəiflik də günahların işlədilməsinə səbəb olur.

Qəzalinin etikasının əqlə uyğunluğu yalnız ağılın əməllərin hakimi olması, onların mənəvi və təbii şərtlərinin müəyyənləşdirilməsi ilə yekunlaşmır. Ağıl həm də bir başlanğıcdır. O yalnız hakim olmayıb, həm də məhkəmə icraçısıdır. Sufilər isə qəlbə bu dünyanın keçici hisslərindən qurtulmağı öyrədirlər. Xəsislik və bədxərclik bu dünyanın ən pis xüsusiyyətlərindəndir. Və ürək ondan uzaq olmalıdır. O, nə pula can atıb onun qeydinə qalmalı, nə də əksinə, onların necə xərclənməsi barədə düşünüb bədxərcliyə yol verməlidir. Lakin bu dünyada bu qurtuluşun faktiki olaraq qeyri-mümkünlüyünü nəzərə alaraq, insan öz ürəyində bu dünyadan tam uzaqlaşmış olmasa da, müəyyən təmiz və pak məkan yaratmalıdır. Yəni onların orta məkanını əl-Qəzalinin sözü ilə desək, «qızıl orta» olan fəlsəfi əqlə uyğunluqla sufi qəlb təmizliyini əlaqələndirmək gərəkdir.

**Elmin «axmaq cahillər ilə» çoxalmasının mənəvi səbəbləri**

Əl-Qəzali dəfələrlə qeyd etmişdir ki, insan irəli sürdüyü ideyanı bilmədiyindən yox, bildiyindən irəli sürməlidir. Bu prinsip yalnız əqlə uyğun polemika metodunu ifadə etməyib, həm də biliyə və elmsizliyə dayanan mühakimələr arasında da bir sərhəd yaradırdı. Əl-Qəzali «Fəaliyyətlərin ölçüsü» əsərində ilk dəfə olaraq bilik və fəaliyyət münasibətini əsas problem kimi nəzərdən keçirmişdir. Bu işdə irəli sürdüyü mühakimələri «Məntiq haqqında elmi biliklərin meyarları» əsərində tətbiq etdiyi «estetik rasionalizm»in inkişafına xidmət etmişdir. Rasionalizm isə daha sonrakı mərhələsində etik refleksin inkişafına səbəb olmuşdur.

Fəqihlərin mənəvi dünyasını şərh edən əl-Qəzali onların insanın daxili aləmi haqqında fikir söyləməsini rədd edir. Əl-Qəzali yazır ki, fəqihlər elə problemlərin şərhinə can atırlar ki, bu məsələlər Qiyamət gününə qədər həll olunmayacaqdır. Pərvanəni atəş cəlb edən kimi pul və dövlət onları özünə çəkir. Təbii elmlərlə, xüsusən də insanları müalicə etmək üçün tibblə məşğul olmaqdansa, onlar vəzifədən istifadə etmək üçün bura can atırlar. Onlar həm həyatda, həm də elmdə iradəsiz və qorxaqdırlar. Onlar zəiflərlə mübarizə aparırlar ki, qalib ola bilsinlər. Bu zaman onlar öz opponentlərinə qarşı ən alçaq üsullardan da istifadə etməkdən çəkinmirlər. Onlar bəzən bir-biri ilə də «keçi kimi» dalaşırlar. Onları ən çox hövsələdən çıxaran isə rəqiblərində olan haqq və ədalətdir. Onların şəxsi mülahizələri və bəlığət bacarıqları yoxdur.

Ümumiyyətlə isə onlar boşboğazlıq, alçaqlıq, zəhlətökənlik, ...pərəstlik kimi xüsüsiyyətlərin daşıyıcısıdırlar. Bu xüsusiyyətləri hakimiyyətdə olan fiqhlərə də şamil edən əl-Qəzali bütün hakim ideologiyasını və elitanı da tənqid atəşinə tuturdu. Lakin o, sadəcə, fiqh və fəqihləri tənqid etməklə qalmayıb, yeni fiqh yaradılmasını da qarşısına məqsəd qoymuşdur. Məsələnin bu cür qoyuluşu onu islamın ilkin dönəminin yenidən qaytarılmasına təşfiq etmişdir. Çünki bu dövr onun üçün «qəlb fiqhi» mənası ilə birgə aydınlaşır. Onun məqsədi bütün insanları «qəlblərin fakihi» etmək idi. Hərçənd o başa düşürdü ki, bu qeyri-mümkündür. Fakihlərin müstəqil ictimai qrup kimi mövcudluğunu vacib sayan Əl-Qəzali onlardan dövlət hakimiyyətindən uzaq olmağı, yüksək prinsip və mənəviyyata sadiq qalmağı tələb edirdi.

Əl-Qəzali fiqhə mütləq etika qapılarını açdığı üçün onlardan adi insanlardan tələb olunandan daha artığını gözləyirdi. Onun islamın «yaramaz alimlərinin» qəzəbi tənqidi də məhz buradan irəli gəlirdi.

Əl-Qəzalinin «yaramaz alimlərə» olan ilk tənqidi münasibəti onun «Din haqqında elmlərin dirçəlişi» əsərində qələmə alınmışdır. Bu problem digər əsərlərdə də müxtəlif səviyyələrdə qabardılmışdır. Yaramaz alimlərə qarşı həqiqi alimləri qoyan müəllif sonuncuları peyğəmbərin varisləri adlandırır. Bu təsəvvürlərdə əl-Qəzali sufi ənənələrindən çıxış etmişdir. Məsələ bundadır ki, müsəlman mədəniyyətində heç kim bu cür sərt şəkildə «yaramaz alimlər»i tənqid etməmişdir. Lakin onlar cəmiyyətdəki yüksək mənəvi statuslarından və təriqətin praktikasını mənimsədiklərindən bunu cəsarətlə etmiş və bu tənqidin digər tərəfi kimi etik normaların müəyyənləşdirilməsini görmüşlər.

Eyni zamanda sufilər «yaramaz alimlər» haqqında olan tənqidi fikirlərinə özlərindən əvvəlkilərin görüşlərini də əlavə etmişlər. Düzdür, buradakı fikirlər birbaşa alimlərə aid edilməsə də, dövlət qulluğunda olanların əxlaqsızlıqlarını tənqid atəşinə tutmaqla məşğul idi.

Heç də təsadüfi deyildir ki, sufilər Həsən əl-Bəsrini (728-ci ildə vəfat edib) özlərinə ruhi müəllim seçmişlər. Guya Həsən əl-Bəsri hər zaman deyərmiş: «Axmaqlar təkrarla, alimlər isə diqqətlə məşğuldurlar». Bu fikri birinci nəsil sufilərin nümayəndəsi olan Fudayi ibn İyaz (802-ci ildə ölüb) da səsləndirmişdir. O, alimləri iki qrupa bölürdü:

'ünyəvi həyatın alimləri; əbədi həyat alimləri. Birinci... ha... çün məlum olan biliklərə, ikincilər isə gizli, sirli bilgilərə mal... rlər. Birinci və ikincilərin münasibətini və fərqini göstərərkən ... diqqətli və ehtiyatlı olmaq lazımdır. Bənzər fikir əl-Cüneyd (909-cu ildə ölüb) tərəfindən də səsləndirilmişdir. «Ürəksiz dil olarmı?» sualına o, belə cavab verib: «Bəli, beləlləri çoxdur». – «Bəs dilsiz ürək?» – «Bəli, ola bilər. Lakin əgər ürəksiz dil bəladırsa, dilsiz ürək səadətdir».

Əl-Qəzalinin «yaramaz alimlər»ə olan münasibəti ənənəvi baxımdan kənar olmasa da, onun həyat təcrübəsi ilə zənginləşdirilmişdir. Sufi praktikası özünə nəzarət (mürəkkəba), «Sufi yolunun» ayrılmaz elementini təşkil edirdi. Və sufidə etik özünütənqid sistemini formalaşdırırdı. Bütün bu elementlərdən əl-Qəzali müasirləri olan «yaramaz alimləri» tənqid etmək üçün istifadə etmişdir. Bu tənqid yalnız onların keçdiyi yolun inkarı olmayıb, həm də mənəvi mövqedən əvvəlki fikirlərə olan baxış idi. Heç də təsadüfi deyil ki, onun kitabı çox güclü tənqid olunan «elm fırıldaqçıları» ilə başlanır. Onlar həzzin, zövqün, keçici nailiyyətin ardınca düşənlərdir. Bunun nəticəsində isə onlar pisdə yaxşı, yaxşıda isə pis görürlər. Onlar insanları aldadırlar ki, guya dövlətin verdiyi fitvada göstəriləndən başqa, elm yoxdur. Guya elm yalnız mübahisələri həll etmək və tərəfləri razı salmaqla məşğul olmalıdır.

Əl-Qəzali bu cür «yaramaz alimlərin» mənəvi-psixoloji vəziyyətini, detallarla olmasa da, şərh etmişdir. Onun fikrincə, bunun əsas səbəbi belələrinin öz ruhlarını bilməmələrindən irəli gəlir. Və özünüdərki keçmədən kamilləşmək mümkün deyil. Əl-Qəzali «alimlərin» dini ikiüzlülüklərini kinayə ilə göstərərək, «İslamın axmaq cahillərinin» bütün formada xacəlik təzahürlərinə lənət yağdırır.

Deyilənlərdən aydın olur ki, müsəlman cəmiyyətinin problemlərinin yeganə həlli yolu kimi şəxsi kamilləşmənin, fərdi yanaşmanın təsadüfi xarakterli əsaslandırma olmadığı müəyyənləşir. Əl-Qəzalinin fikrincə, alimlər «Peyğəmbərin varisləridir». Peyğəmbərlik isə insanda maddi və mənəvinin öz tarixi və praktik aspektinə uyğun olaraq reformasını keçirir. Bunu Əl-Qəzali «qəlbin müalicəsi və ruhun bərpası» adlandırmışdır.

«Yaramaz alimlərin» tənqidində əl-Qəzali yalnız fiqh və kəlamlarla kifayətlənməyib. O hətta sufiləri də tənqid atəşinə tutmuşdur. Lakin qeyd etmək lazımdır ki, «yaramaz sufilərin» tənqidi

konseptual xarakter daşımırdı. O yalnız psevdosufilərin sufizmə gətirdikləri yamanı tənqid etmişdir. Bu baxımdan onun sufiləri tənqid etməsi özünütənqidin davamı kimi dəyərləndirilə bilər. Bunu isə biz bütün böyük sufilərdə görə bilərik. Lakin bu varislik «yaramaz alimlik təcrübəsindən daddıqdan» sonra mümkün ola bilərdi.

Bunun ifadəsini biz «Otuz qrup şirniklədirilmişlər»in tənqidində görə bilərik. Bu qruplar öz xəyallarını və uzlaşmazlıqları yaratmışlar. Əl-Qəzali üçün onlar sufizmdə biliyin və fəaliyyətin bütövlüyünə aparan təcrübə mənbəyi rolunu oynamışlar.

III Fəsil

# MÖMİN İNSANLARIN GÖZƏL HESAB ETDİYİ, ƏSLİNDƏ İSƏ BELƏ OLMAYAN ELMLƏR HAQQINDA

Burada bəzi elmlərin çirkin olması barədəki fikirlər, fiqh (dərk etmə), ilm (bilik), tovhid (təkallahlıq), zikr (Allahın zikri), təzkir (xatırlama), hikmət (müdriklik) kimi elm sahələrinin adlarının fərqli mənalarda işlədilməsi, həmçinin şəriət elmlərinin bəyənilən və bəyənilməyən tərəfləri şərh edilir.

**Bəzi elmlərin çirkin sayılmasının səbəbi**

Bəlkə də, sən deyəcəksən: «Elm nəyisə həqiqətdə olduğu kimi bilməkdir (marifa) və elm Allahın sifətlərindəndir. Bu halda bir şey elm olmaqla yanaşı necə çirkin ola bilər?»

Bil ki, elm özlüyündə yox, Allah bəndələrinə nəzərən üç səbəbdən çirkin sayılır:

**Birincisi.** Sehr və cadu kimi pislənən elm olub, sahibinə və ya başqalarına zərər gətirdikdə. Bu elmlərin mövcudluğu həqiqətdir və Quranda da cadunun ailə münasibətlərini dağıtması təsdiqlənir.

(Müslim, əl-Buxari Aişədən rəvayət edirlər) «(Bir dəfə) Allahın Rəsulu Məhəmməd Peyğəmbərə, ona Allahın xeyir-duası və salamı olsun, cadu edilir, bunun təsirindən xəstələnərək yatağa düşür. Nəhayət, Cəbrail bunun səbəbinin dərin bir quyuda daşın altında gizlədilmiş cadu olduğunu bildirir və cadunu oradan çıxarırlar»[45].

Bu, təbiətdəki şeylərin özünəməxsus cəhətlərindən və ulduzların hərəkətinin hesablanmasından bəhs edən bir elmdir.

Bəzi daşlardan onların özünəməxsus xüsusiyyətlərinə görə cadulanan adamın təsviri düzəldilir. Sonra müəyyən anda göydə ulduz və planetlərin görünməsi müşahidə olunanda həmin fiqura şəriətə zidd olan bəzi kəlmələr (küfr) deyilir. Bu kəlmələr vasitə-

[45] Müslüm, əl-Buxari; Aişədən

silə şeytan o işə kömək edir. Bütün bunlardan sonra Böyük Allahın hökmü daxilində sehrə məruz qalan insanda qəribə hallar baş verməyə başlayır. Əlbəttə, bütün bunları bilmək özlüyündə çirkinlik deyildir. Amma bunlar insanlara zərər verə bilər. Şər üçün vasitə olan isə - şərdir. Bu səbəblərdən də sehr və magiya çirkin elmlərdir.

Tutaq ki, kimsə bir vəlini öldürmək məqsədi ilə onu təqib edir və vəli özünü bir qapalı yerdə gizlədir. Təqibçi vəlinin yerini soruşduğu zaman ona vəlinin yerini söyləmək olmaz, əksinə, belə bir vəziyyətdə zalımı yanlış səmtə istiqamətləndirmək vacibdir. Gizlənənin yerini göstərmək - doğru yola istiqamətləndirmək, bildiyin bir şeyi doğru söyləmək kimidir. Amma bu, şərə xidmət etdiyindən çirkindir.

**İkinci.** Elmlər astronomiya kimi çox hallarda sahibinə zərər verdikdə.

Bu elm zərərli bir elm deyildir. Çünki iki yerə ayrılır:

1. Hesab elmi. Quranda deyilir ki, Günəş və Ayın öz orbitində hərəkəti hesabladır. Belə ki, Qadir və Böyük Allah buyurmuşdur: *«Günəş və Ay müəyyən ölçü ilə (hərəkət edər)» (Quran, 55:5). Yaxud: «Biz Ayın hərəkəti üçün mənzillər (ölçülər) müəyyən etdik. Nəhayət, o, (həmin mənzilləri başa vurduqdan sonra) dönüb xurma ağacının qurumuş əyri budağı kimi (hilal şəklində) olar» (Quran, 36:39).*

2. Ehkam elmi: Bu elmin mahiyyəti hadisələrin baş verməsəbəbini göylərlə əlaqədar dəlilərlə izah etməkdir. Həkimin nəbzi yoxlayıb, xəstəliyin gedişatını müəyyən etməsi kimi...

Səyyarələrlə bağlı elmlərin bu qismi Allahın öz yaratdıqları üzərində qoyduğu qayda-qanunların gedişatını bilməkdir. Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Əgər qismətdən danışsalar, müdaxilə etməyin. Ulduzlar xatırlasalar, müdaxilə etməyin. Səhabələrim xatırlanan zaman müdaxilə etməyin»[46]. Və yenə buyurmuşdur: «Özümdən sonra ümmətim üçün üç şeydən qorxuram: hökmdarların zülmündən, ulduzlara inanmaqdan və Allahın qəza-qədərinə inanmamaqdan»[47] (İbn Əbdulbər Əbu Mahcəndən rəvayət edir). Ömər ibn Xəttab (Allah ondan razı olsun) buyurur: «Ulduzlarla bağlı ancaq quruda və dənizdə sizə yardım olacaq hissəni öyrənin. Qalanlarını öyrənməkdən çəkinin».

---

[46] Əl Təbarani; İbn Məsuddan;

[47] İbn Əbd əl-Bir; Əbu Məhcandan

Astrologiyanı öyrənməkdən çəkinilməsi üç səbəblə bağlıdır. Birincisi, ona görə ki, xalqın əksər hissəsinə zərər verir. Çünki xalqa hadisələrin hansısa ulduzun təsiri ilə meydana gəldiyi deyildiyi zaman onların ürəyində o ulduzların qüdrət sahibi, işləri müəyyən edən tanrılar olması fikri doğacaq. Guya buna görə də onlar səmanın nəsib bəzəkləridirlər. Bunun ürəklərə təsiri o qədər böyük olacaq ki, ürəklər ona bağlanacaq və insanlar Allaha zikri qəlblərindən çıxarıb, xeyir və şəri ulduzlarda axtarmağa başlayacaqlar.

Çünki zəif olan kəs vasitəyə baxıb, o vasitənin arxasında dayanan böyük səbəbi görə bilməz. Amma bilikli alim anlayır ki, Günəş, Ay və ulduzlar Allahın (Ona həmd olsun!) hökmünə tabedir. *«...Günəşi, Ayı və ulduzları əmrinə boyun əymiş halda yaradan Allahdır» (Quran, 7:54)*. Zəif bir insanın işığı ancaq Günəş doğub ətraf işıqlandıqdan sonra görməsi qarışqanın aşağıdakı vəziyyətinə bənzəyir:

Əgər kağız üzərində olan bir qarışqaya ağıl verilsə, o, kağızın üzərində meydana gələn qara yazıların qələm tərəfindən yaradıldığını zənn edəcək. Çünki bir az yuxarı baxıb o qələmi hərəkət etdirən əli, daha da yuxarı baxıb o əli hərəkət etdirən insan iradəsini, insan iradəsindən də yüksəkdə isə yazı bacarığını, əli və iradəni yaradan Allahı görə bilmir.

Qarışqa misalında olduğu kimi, insanların diqqəti əksərən aşağı, yaxın olan səbəblərlə məhdudlaşır. Bu səbəblərin arxasındakı səbəbləri görə bilmirlər. Ulduz elminin qadağan edilmə səbəblərindən biri budur.

İkinci səbəb isə onunla əlaqədardır ki, ulduzlara baxaraq nəticə çıxarmaq – «ulduzların hökmü» təmiz falçılıqdır. Və bu vasitə ilə hər hansısa bir məsələ barədə qəti və ya təxmini bir fikir demək mümkün deyil. Buna güvənmək nadanlıqdır və bu səbəbdən astrologiyanı ittiham etmək elmi deyil, cəhaləti ittiham etməkdir.

Deyilənlərə görə, bu elm İdris Peyğəmbərə (ona salam olsun) verilmiş möcüzə olub. Lakin İdris Peyğəmbərin ulduz elmi tamamilə məhv olub getmiş, günümüzə gəlib çatmamışdır.

Bəzən təsadüfi olaraq münəccimlərin təxminləri doğru çıxır. Çünki bəzi zahiri, görünən səbəblərdən məlumatları vardır. İlkin səbəbi dərk etmək isə insanın qavraya bilmədiyi çoxlu şərtləri nəzərə almaqla mümkündür. Əgər Allah-təala bu və ya digər səbəbdən nəyisə müəyyən edərsə, onda münəccimin təxmini düz, müəyyən etməzsə, yanlış olacaqdır. Bu vəziyyət buludların toplan-

dığını görüb yağış yağacağını deməyə bənzəyir. Lakin ola bilər ki, gün çıxıb, havanı isidər və buludlar dağılar və yaxud əksinə, təbii olaraq bəzən də yağış yağar. Yağışın yağması üçün buludun sıxlaşması kifayətedici səbəb deyil, yəni bilinməyən digər səbəblər də vardır. Bunun kimi, bir dənizçinin də küləyə baxıb «gəmi batmaz» deməsi tamamilə doğru proqnoz deyildir. Çünki küləklə bağlı gəmiçiyə məlum olmayan səbəblər işə düşər və gəmiçi yanılar. Bu səbəbdən o gah doğru, gah da yanlış ehtimallar irəli sürər. Buna görə Allaha inamı möhkəm olanlar münəccimliyi qadağan edirlər.

**Üçüncü** səbəb isə onunla bağlıdır ki, ulduz elmi faydasızdır. Zərərlərindən ən azı boş, mənasız, faydasız bir işlə məşğul olmaqdır. Faydasız bir işə vaxt sərf etmək ən qiymətli xəzinə olan vaxtın boşuna xərclənməsidir.

«Bir gün Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, bir insanın başına çoxlu camaatın toplaşdığını görür. «Bu kimdir?» – deyə soruşur.

Xalq cavab verir ki, bu, böyük bir alim olduğu üçün camaat onun ətrafına toplaşıb. Peyğəmbər soruşur: «Nəyin bilicisidir?». Cavab verirlər ki, şeiri və ərəblərin əsil-nəsəbini bilir. Peyğəmbər bildirir ki, bu elm faydasızdır, onu bilməməyin isə zərəri yoxdur» (İbnu Abdulber Əbu Hüruyədən rəvayət edir). Yaxud Peyğəmbər buyurmuşdur: «Həqiqi elm ya qüvvətli bir ayə, ya qaim bir sünnə, ya da zəruri vəzifədir» (Əbu Davud Abdullah ibn Ömərdən rəvayət edir).

Astrologiya və ona yaxın elmlərə aludə olmaq faydasız yerə özünü təhlükəyə atıb cəhalətə qapılmaqdır. Allahın təqdir etdiyi yazıdan qaçmaq mümkün deyildir. Amma tibb elmi, əksinə, belə deyil. Çünki insanların əsaslı dəlillərinə görə, o elmə böyük ehtiyac vardır.

Yuxuyozma elmi də ehtimallara əsaslansa da, astrologiyadan ayrılır. Yuxuyozmada fayda vardır. Bundan əlavə, yuxuyozma nubüvvətin (peyğəmbərliyin) qırx altı parçasından biridir, onda heç bir təhlükə ola bilməz.

Beləliklə, elmin çirkin sayılmasının üçüncü səbəbi onunla məşğul olanın fayda əldə etməməsidir. Elmlərin aydın tərəflərini öyrənmədən incəliklərini, əsaslarını öyrənmədən gizli tərəflərini öyrənməyə çalışmaq və elmlərin açıq tərəflərini deyil, qapalı tərəflərini öyrənmək, ilahi elmlərin sirlərini araşdırmaq kimi... Filosoflar və mütəkəllimlər bu elmlərə nə qədər vaqif olmaq istəsələr də,

onu müstəqil olaraq qavramaqdan uzaqdırlar. Dünyanın mahiyyəti haqqında biliyə sahib olmaq yalnız peyğəmbərlər və az sayda övliyalara müyəssər olur. Buna görə də insanlar bu elmlərlə şəriət hüdudları daxilində məşğul olmalıdırlar. Allaha etiqadı olana bu, kifayətdir. Bir çox insanlar vardır ki, elmlərə aludə olmuş, lakin bu aludəçilik onlara zərər vermişdir, fəqət bu elmlər olsaydılar, onların imanları daha kamil olardı. Bu cür elmlərin bəzi insanlara zərər verdiyini inkar etmək olmaz. Necə ki bir çox quşların əti və dadlı şirniyyatlar südəmər uşaqlara zərərdir. Bundan əlavə, insanların bir çox elmləri bilməməsi daha xeyirli ola bilər.

Rəvayət edilir ki, bir nəfər həkimə gedib xanımının sonsuzluğundan şikayət edir. Həkim xanımın nəbzini yoxlayıb deyir: «Müalicəyə ehtiyac yoxdur. Çünki qırx gün sonra vəfat edəcək. Hal-hazırda nəbzinin döyüntüsü bunu göstərir». Bunu eşidən xanım dəhşətə gəlir, pərişan olur. O qadın var-yoxunu kimsəsizlərə verib vəsiyyət yazır. Qırx gün yeyib-içmir. Müddət tamam olduqdan sonra həmin şəxs təbibə arvadının ölmədiyini bildirir. Bu zaman həkim deyir ki, mən onun ölməyəcəyini bilirdim: «İndi evə get və onunla yaxınlıq et. O, hamilə qalacaq». Təbibin bu cavabından kişi heyrətlənir. «Bu, necə ola bilər», – deyə soruşur. Həkim belə cavab verir: «Müayinə zamanı qadının rəhnində piy yığıldığını və bu səbəbdən hamilə qala bilmədiyini gördüm. Bu köklüyü ancaq ölüm qorxusu aradan qaldıra bilərdi. Buna görə də onu belə bir qorxuya salmaq zəruri idi. Mən də onu etdim. Bu anda məqsəd hasil olmuş, qadın arıqlamışdır. İndi o, ana olmağa hazırdır».

Bunlar bəzi elmlərin təhlükəli olmasını sənə göstərir və eyni zamanda Allahın Rəsulu Məhəmməd Peyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, bu sözlərinin mənasını açıqlayır: «Faydasız elmdən Allaha sığınıram» (İbn Əbdül-ber Cabirdən rəvayət etmişdir).

Bu hekayədən ibrət al, şəriətin buyurmadığı elmlərdən uzaq ol və onlara aludə olma, Məhəmməd Peyğəmbərin silahdaşlarının yolu ilə get ki, Allah da bundan razı qalsın. Sünnədən bir an olsun belə ayrılma. Dini və dünyəvi əmin-amanlıq sünnə yolu ilə getməkdən asılıdır. Təhlükə isə çirkin predmetlərdə və özbaşınalıqdadır. Öz müstəqil araşdırmalarına, öz dərrakənə, öz sübut və izahlarına söykənməkdən sui-istifadə etmə.

Yəqin ki, düşünəcəksən ki, mən bəzi elmləri bilmək üçün araşdırıram. Elə isə bu elmləri düşünməkdə nə dəyər vardır? Çox

şeylər vardır ki, onu öyrənməklə sən axirətdən uzaqlaşmış olarsan. Əgər Allah sənə rəhm etməsə, sən bu fəlakətdən uzaqlaşa bilməzsən və məhv olarsan.

Bil ki, təcrübəli həkim insanın sağaldılması üçün başqalarının bilmədiyi metodları bildiyi kimi, peyğəmbərlər də qəlbin həkimi kimi axirəti əldə etməyin metodlarını bilərlər.

Onların məsləyini sən öz ağlınla mühakimə etmə, yoxsa məhv olarsan. Elə insanlar vardır ki, barmaqları yaralandığı zaman o yaranı özləri müstəqil olaraq dərman sürtməklə sağaltmağa çalışırlar. Halbuki həkim dərmandan necə istifadəni daha dəqiq bilir. Ola bilər ki, həkim dərmanı yaranın üstünə deyil, başqa bir yerə sürtməyi məsləhət görər. Damarların bədəndə nə şəkildə ayrıldığını, haradan kök atdığını və bədəni necə əhatə etdiyini bilməyən insana bu, qəribə görünə bilər.

Bunun kimi, axirətə aparan yolda da, şəriətin, sünnənin incəliklərində, ədəbdə və insanların ibadət etmək üsullarında da vəziyyət elədir. İnsanlar bunda bəzi ifadə edilə bilməyən sirlərə agah olsalar da, onların tam mahiyyətinə varmağa qadir deyillər. Məsələn, mineralların son dərəcə qəribə xüsusiyyətləri vardır ki, çox insanlar bu xüsusiyyətlərin səbəblərini bilmirlər. Məsələn, insanlar maqnitin dəmiri özünə cəlb etməsinin səbəbini bilmirlər. İmanda, dinin buyurduqlarında və onların qəlblərə verdiyi xeyirdə – qəlbin saflaşıb Allaha yaxın olması və Ondan ilham almasında isə elə möcüzə və qəribəliklər var ki, bu qəribəliklər dərmanlarda və şəfaverici bitkilərdə olanlardan qat-qat artıq və şərəflidir.

Təcrübə dərmanları öyrənməyə xidmət etsə də belə, onlar haqqında dərin biliyə sahib olmadığımız kimi, insana axirətdə nəyin fayda verəcəyini bilmirik. Özü də burada nəyisə təsrübədən çıxarmaq heç cür mümkün deyildir. Əgər ölüm dünyasından kimsə geri dönsəydi, biz ondan axirət dünyasında nəyin, hansı hərəkətlərin insanı Allaha yaxınlaşdırdığını, hansının Allahdan uzaqlaşdırdığını soruşardıq. Lakin ölüdən bu suallara cavab almaq heç kəsə müyəssər olmamışdır. Sənin ağlın səni Peyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, doğruluğuna inandırsa və onun göstərişlərinin haradan qaynaqlandığını sənə anlatsa, bu, sənə kifayətdir. Ağlında olan dar fikirlərdən qurtul və şərt qoymadan bu yolu təqib et, çünki xilas yalnız ondadır. Sənə uğur olsun.

Buna görə Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Elmin bir qismi nadanlıqdır, sözün bir qismi

susmaq» (Əbu Davud Büruyədən rəvayət edir). Elmin heç bir halda cəhalət olmadığı hər kəsə bəllidir. Lakin bəzən zərər vermək baxımından cəhalətin göstərdiyi təsiri göstərir. Yenə də Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «İmanın azı elmin çoxundan üstündür» (Əbu Mənsur əd-Dilmi Əbu əd-Dərdadan rəvayət edir). Allahın peyğəmbərlərindən olan Məryəm oğlu İsa (ona salam olsun) buyurmuşdur: «Elə ağac vardır ki, meyvəsi yoxdur. Elə meyvələr də vardır ki, yeyiləsi deyildir. Elə elmlər də vardır ki, insana heç bir faydası yoxdur».

**Dəyişdirilən elm adlarının izahı**

Bil ki, çirkin elmlərin şəriət elmlərinə qarışdırılması gözəl adların mənalarının dəyişdirilməsi ilə mümkün olmuşdur. Bunu isə imanlı sələflərimiz və İslamın ilk əsrində yaşamış adamlar heç arzu etməzdilər. Düzgün olmayan mənalarda başa düşülən elm adlarının sayı beşdir: fiqh, elm, tovhid, təzkir, hikmət.

Göründüyü kimi, bütün bu terminlər gözəl terminlərdir və onlara vaqif olan kəslər dində nüfuzlu şəxslərdir. Lakin müasir dövrümüzdə bütün bu terminlər əsl mənalarını dəyişmiş və çirkin mənalara da şamil edilmişdir. İndi bu məna altında təqdim olunanlardan ürək bulanır.

Birincisi, fiqh termini. Bu sahəni özbaşına olaraq ixtisaslar üzrə bölür və bu zaman qətiyyən ənənədən çıxış etmirlər. Onu fitvanın tərtibində lazımlı ikinci dərəcəli biliklərə parçalayır, çoxlu sözçülüyə və bu işlə bağlı detallara varırlar. Bu işlərə daha vaqif olan kəs ən böyük fiqh alimi hesab olunur.

Səhabə dövründə isə fiqh axirət yolunu, ruhun qarşılaşa biləcəyi təhlükəni, insan əməllərini nəyin korladığını öyrənən elmə deyilirdi. İnsanın özünü qoruması üçün fani dünyanın (əd-dunya) puçluğu, o dünya (əl-axirə) üçün xeyirxahlıq və qəlblərə təsir edəcək qorxu təlqin olunurdu. Bunu Allah-təalanın bu ayəsi sübut edir: *«Möminlərin hamısı birdən savaşa çıxmamalıdır. Hər qəbilədən bir dəstə din elmlərini öyrənmək üçün qalsın ki, əsgərlər (döyüşdən) geri dönərkən onları Allahın əzabı ilə qorxutsun. Ola bilsin ki, onlar Allah əzabından çəkinsinlər» (Quran, 9:122).*

İnsanlar nə ilə qorxudulurdularsa, hansı elm Allah qorxusunu qəlblərə yerləşdirirdisə, o elmin adı fiqh elmi idi. Təlaq, qul azad etmə, and vermə, nəğd pul olmadan mal alqı-satqısı, icarə kimi məsələlər isə fiqhlə əlaqəli deyildi. Çünki bütün bu xırdaçılıqlarla

insan qəlbinin qorxudulması mümkün deyil. Əksinə, bu məsələlərlə məşğul olmaq qəlbi çirkləndirir, Cəhənnəm qorxusundan onu uzaq salır. Müasir dövrümüzdə bununla məşğul olan belə insanların qəlbində Allah qorxusu olmur.

*Böyük Allah buyurur: «Biz cin və insanların bir çoxunu Cəhənnəm üçün yaratdıq. Onların qəlbləri var, lakin onunla həqiqəti anlamazlar, gözləri var, lakin onunla görməzlər, qulaqları var, lakin onunla eşitməzlər» (Quran, 7:179).*

Bu gözəl ayədə «onların qəlbi həqiqəti qəbul etməz» ifadəsində fitva deyil, iman mənası ifadə olunmuşdur. Bu terminlərin biri qədimdən işlədilmiş, digəri isə yeni-yeni istifadə olunmuşdur. Allah-təala Qurani-Kərimdə buyurur: *«Onların (münafiqlər və yəhudilər) ürəklərinə qorxu salan Allahdan çox sizsiniz. Bu isə onların (Allahın əzəmət və heybətini) anlamaz bir qövm olduqlarına görədir» (Quran, 59:13*). Allahdan Ondan az qorxulduğunu onların (fiqhi) az bildikləri ilə bağlayır. Baxın, bu, fitva elminin təfərrüatlarına varmaqla olur, yoxsa fiqhin daha əvvəl bildirdiyimiz həqiqi mənalarını dərk etməklə? Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, yanına gələn İslamı qəbul etmiş bir qism ərəb qəbiləsindən olan insanlar haqqında buyurmuşdur: «Bu gələnlər alim, müdriklər və fakihlərdir» (Əbu Naim, əl-Bəyhəki, əl-Xətib Suveyd ibn əl-Hərisdən).

Saad ibn İbrahim əz-Zöhridən soruşurlar: «Mədinəlilərin içində ən fakih insan kimdir?». O cavab verir: «Allahdan ən çox qorxan insan». Burada Saad fiqhin nəticəsinə diqqət edir. Allahdan qorxu isə fitva və qərar çıxarmağın deyil, dərin biliyin təzahürüdür. Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «Sizə fakihlərin ən yaxşısı haqqında xəbər verimmi?». Əshabələri: «Bəli, ya Rəsulallah», – dedilər. Allahın Peyğəmbəri: «İnsanları Allahın rəhmətindən ümidsiz etməyən və Allaha qarşı getməkdən saxlayan, onların Allahın rəhmindən ümidini üzməyən, Qurana tapınıb, başqa kitablara tapınmayanı» (Əbu Bəkr ibn Lal, Əli ibn Əbu Talibdən).

Ənəs ibn Malik rəvayət edir ki, bir gün Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, dedi: «Mənim üçün dan söküləndən günəş doğana qədər Allaha ibadət edənlərlə oturmaq, dörd qulu azad etməkdən daha yaxşıdır» (Əbu Davud; Ənəs ibn Malikdən). Və Zeyd ər-Rakaşi və Ziyad ən-Nəmiriyə üzün tutub dedi: «Allahı zikr sizin bugünki məclislərinizə bənzəməzdi. Sizin mə-

ıslərdə biri moizə oxuyarkən sözünü uzatdıqca uzadır. Amma Allah Rəsulunun dövründə biz bir yerə toplaşıb din mövzuları, Quranın ayələrini təhlil edər, dində fiqh sahibi olar və fiqh sahibi olduğumuz üçün Allahın bizdə olan nemətlərinə şükr edərdik». Göründüyü kimi, Ənəs Quran üzərində düşünərək Allahın nemətlərinə şükr etməyi fiqh adlandırır.

Allahın Rəsulu buyurmuşdur: «Qul (bəndə) Allah yolunda insanlara nifrət etmədikcə, Quranın müxtəlif mənalarını görmədikcə fakih ola bilməz» (İbn Əbdül-Birr; Şəddad ibn Ausdan). Əbu Dərda bu hədisi əlavə ilə aşağıdakı kimi verir: Peyğəmbər deyirdi: «Sonra nəfsinə dönəcək və hər şeydən çox nəfsinə nifrət edəcəkdir».

Fərhad ibn Yaqub əs-Sənci Həsən Bəsridən bir sual soruşub, cavabını aldı. Sonra dedi: «Fakihlər sənin verdiyin cavabı qəbul etmirlər». Bunu eşidən Həsən dedi:

- Ey Fərhad, anan sənin matəmini tutsun. Məgər sən canlı olaraq fakih görmüsənmi? Əlbəttə, görməmisən. Çünki fakih dünyada zahid, axirətdə dinini tam bilən, Rəbbinə ibadət etməkdə iradəsi olan, müsəlmanların şərəfi naminə nəfsini gözləyən, müsəlmanın malını haqsızlıqla almaqdan qaçan, Allahın əmrlərini müsəlmanlara çatdıran insandır.

Göründüyü kimi, Həsən heç bir halda fakihin «fitvaları bilən» olduğunu demir. Mən heç də iddia etmirəm ki, o vaxt fiqh ümumilikdə fitvaları bilənə şamil edilmirdi. Ancaq hamı üçün vacib, hamını əhatə edən və bununla bağlı əlavələri öyrənirdi. Bizdən öncəki alimlər fiqhi fitva elmindən daha çox axirət elminə aid etmişdilər.

Həqiqətən də, insanların yaxşı və pis elmləri bir-birinə qarışdırması, fiqh terminindən sonralar fitva elmində istifadə edilmə, insan xarakterinin qeyri-kamil olması buna yardımçı olmuşdur.

Çünki batini, gizli olan aydın deyil və ona uyğun xeyirxah əməllər edilməsi çətindir. Batin elmi insana hakimiyyət, vəzifə, yüksək rütbə və mal-dövlət qazandırmır. Bu fürsəti qənimət bilən şeytan yanlış olanı qəlblərdə şəriətin bəyənilən elmlərindən olan «əl-fiqh» adı ilə gözəl göstərməyə çalışmışdır.

İkinci termin isə əl-ilm (elm, bilik) terminidir. Bu termin səadət əsrində Allah-təalanı, Onun əlamətlərini, Öz qullarına və digər yaratdıqlarına münasibətini bildirmək üçün istifadə olunurdu. Hətta Ömər, Allah ondan razı olsun, vəfat etdiyi zaman Məsud demişdir: «Elmin ondan doqquzu öldü». O, bu sözü hərfi olaraq «əlif»

və «ləm» kimi müəyyənləşdirdi, sonra isə bu sözü uca Allah haqqında elm kimi izah etdi.

Bu termindən də onun mənasını özbaşına daraltmaqla istifadə edirlər. Hətta çox hallarda onu fiqh məsələləri və başqa mövzularda müzakirələrə aid edirlər. Və beləri haqda deyirlər: «O, həqiqi alimdir» və ya «O, elm sahəsində görkəmli şəxsiyyətdir». Bu məsələlərlə məşğul olmayan və çalışmayan insan qaranlıq və zəif adam sayılır və heç bir halda elm adamı hesab edilmir. Bu, həm də məhdudiyyətdən sui-istifadədir.

«Elm» anlayışı hamı üçün əhəmiyyət daşıyan, ümumi məsələləri ifadə etmək üçün işlədilir. Quranda və sünnədə elmin xeyirli cəhətləri və alimlər barədə deyilənlərin çoxu Allah-təalanın, Onun əmrlərinin və sifətlərinin dərki ilə məşğul olan alimlərə aiddir. İndi isə mübahisəli məsələlərə dair dialektikanın təsbit etdiklərindən başqa, Qanun *(şəriət)* elmindən heç nə bilməyənlər də alim adlandırılırlar. Belə adamlar təfsir (Quranın şərhi), əxbar (Məhəmməd Peyğəmbər və onun yoldaşlarının söylədikləri), məzhəblər haqqında (doqmatik-hüquqi istiqamətlər) elmlərdən və s. xəbərsiz olduqları halda dahi alimlər sayılırlar. Bu hal isə elmlərə yiyələnməyə can atan bir çoxlarının məhvinə səbəb olmuşdur.

Üçüncü ad – Təktanrıçılıq *(tovhid)*. İndi bu anlayış kəlam sənətini, bəhsə girişmək metodlarını bilən, mübahisə zamanı təkzibolunmaz sübutlar gətirməyi bacaran və bunu ibarə ilə ifadə edən, çoxsaylı suallar verərək insanları şübhəyə salan və susmağa məcbur edənlərin sənətini bildirir. Bu adamların çoxu özünü ədalət və tovhid əhli adlandırır, mütəkəllimləri (ilahiyyatçıları) isə tovhidin biliciləri hesab edirlər.

Halbuki bu sənətin məlzəmələri islamın ilk əsrində məlum deyildi və o dövrin adamları mübahisələrə və şübhələrə qapı açanları şiddətlə qınayırdılar. İlk eşitdikləri andan insan ağlının can atdığı Quranın aşkar dəlilləri isə hamı tərəfindən birmənalı olaraq qəbul edilirdi. Quranı bilmək hər şeyi bilmək demək idi. Tovhid o zamanlar mütəkəllimlərin başa düşmədiyi başqa mənalar kəsb edirdi. Hətta əgər onlar bu mənaları anlasalar belə, bu biliklərə layiq deyillər.

Bu Tovhid elmləri Qadir və Böyük Allahın əmrilə baş verənləri görmək üçündür. Belə baxış mömінin digər səbəb və vasitələrə baş vurmağını istisna edir və o, xeyirli və zərərli nə varsa hamısının yalnız Allahdan, Ona həmd olsun, gəldiyini görmüş

olur. Bu, ümid kitabında göstərildiyi kimi, şərəfli məqamdır və onun meyvələrindən biri də Allaha ümid bağlamaqdır (təvəkkül). Onun digər bir meyvəsi insanlardan gileyi buraxıb onlara qəzəblənməkdən imtina etmək və olanlara qane olub, özünü Allah-təalanın iradəsinə təslim etməkdir.

Digər bir meyvəsi barədə isə Əbu Bəkr əs-Siddiqin, Allah ondan razı olsun, xəstə olduğu zaman: «Sənə həkim çağıraqmı?» – sualına verdiyi cavabda danışılır: «Məni xəstəliyə düçar edən Həkimin özüdür».

Birisindən də xəstə olan zaman soruşdular: «Həkim xəstəliyin barədə sənə nə dedi?». O cavab verdi: «O dedi ki, Mən nə istəsəm, o da olacaqdır!». Təvəkkül və Tovhid kitablarında buna dəlillər vardır.

Tovhid üstü ikiqat qılafla örtülü qiymətli bir daşa bənzər. Bu qılaflardan biri özəkdən digərinə nisbətdə daha uzaqda yerləşir. İnsanlar bu qılafa tovhid adı verərək, özlərini yalnız bu qabığı qorumaq işinə sərf etmiş, özəyi isə diqqətdən kənarda qoymuşlar. Birinci qılaf sənin dillə «Allahdan başqa, allah yoxdur» deməyindir. Bu, Tovhid adlanır və xristianların bəyan etdiyi üçlüyə qarşı durur. Lakin Tovhidi bu şəkildə – dillə xarici görünüşü daxili mahiyyəti ilə düz gəlməyən münafiqlər də etiraf edə bilərlər.

İkinci qat (qılaf) «Allahdan başqa, allah yoxdur» ifadələrinə qəlbdə heç bir ziddiyyət, həqiqiliyinə heç bir şək-şübhə olmamasıdır.

Onun zahirdə ifadə olunanı qəlbdə bəslənməli və həmçinin qəlbdə Tovhidin həqiqət olduğu təsdiq edilməlidir.

Üçüncü – özək olan baş verən bütün işlərin Qadir və Böyük Allahın əmri ilə olduğunu görməkdir. Bu, mömininin hansısa vasitələrə əl atmasını istisna etməklə, yalnız öz Rəbbinə Vahid Allah kimi səcdə etməsidir.

Tovhid bir çox ehtirasları istisna edir. Çünki öz ehtirasının dalınca gedən hər kəs onu özünün pərəstiş obyektinə çevirmiş olur. Allah-təala buyurmuşdur:

*«Nəfsini özünə Tanrı edən ....kimsəni gördünmü?» (Quran, 45:23).* Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, deyib: «Yer üzündə insanların tapındığı məbudlardan Allahın ən çox bəyənmədiyi nəfsdir».[48]

---

[48] Ət-Təbərani; Əbu İmamdan, zəif.

Həqiqətən də, hər kim yaxşı düşünsə, dərk edər ki,
pınan əslində bütə deyil, öz nəfsinə pərəstiş edir. Çünki onun qəlb əcdadlarının dininə meyl edir və o da bu həvəsin dalınca gedir. Qəlbin əski vərdişlərə meyl etməsi nəfsin təzahürlərindən biridir.

İnsanlara qarşı qəzəbli olanlar da Tovhidə zidd çıxmış olurlar. Axı hər şeyin Qadir və Böyük Allahdan olduğunu bilən insan başqalarına necə qəzəblənə bilər? Həqiqətən, Tovhid məqamı düzgün insanların məqamıdır. Gör bunu necə dəyişmişlər və üzərini necə bir qabıqla örtmüşlər. Və bu qabığı da, onda tərifəlayiq heç bir məna olmasına baxmayaraq, özünütərif və lovğalıq vasitəsinə çevirmişlər. Bu, hər səhər tezdən qalxıb üzünü qibləyə çevirərək: *«Mən, həqiqətən, batildən haqqa tapınaraq (dönərək) üzümü göyləri və yeri yaradana çevirdim», - (Quran, 6:79)* deyən kimsənin etibarsızlığına bənzəyir. Qəlbinin üzünü Allah-təalaya çevirməyənin birinci yalanı hər gün Allaha müraciətindən başlayır. Çünki o, «üç» deyərkən zahiri üzünü, sifətini başqa istiqamətlərdən Kəbəyə döndərməyi deyil, qəlbinin üzünü nəzərdə tutmalı idi. Kəbə göyləri və yeri yaradanın istiqaməti deyil ki, oraya hər yönəlmiş olan Allaha yönəlmiş sayılsın. Çünki Allah istiqamət və ya tərəflərə sığmaz, O, bütün bunlardan çox yüksəkdədir.

İbadətdə mətləb qəlb ilə ibadət olduğu kimi, əgər o adam da öz qəlbinin üzünü çevirdiyini nəzərdə tutursa, onda o, ürəyi dünyəvi istəklərlə və tələbatla dolu olduğu, var-dövlət yığmağa, vəzifə tutmağa, daha çox sərvət toplamağa yönəldiyi halda, necə səmimi ola bilər? Üzünü «göyləri və yeri yaradan»a (Quran, 6:79) çevirəndə də onun bütün vücudu istəklərinə yönəlmiş olur.

Qurandakı bu mübarək kəlmələr Tovhidin həqiqi mahiyyətini ifadə edir. Tək allaha tapınan (müvəhhid) Vahidi-mütləqdən başqasını görməyən və yalnız ona üz çevirəndir. Allah-təalanın bu sözlərində buyurulduğu kimi: « (Ya Rəsulum), Sən: *«Allah!» – deyib çağır. Sonra da burax onları, düşdükləri bataqlıqda ilişib qalsınlar (özlərinin dedi-qodularında, pis işlərində və yaramaz əqidələrində davam etsinlər)» (Quran, 6:91).* Burada dillə şəhadətə işarə edilir. Çünki dil qəlbin tərcümanıdır; bəzən doğru, bəzən də yalan söylər. Halbuki Allah-təalanın nəzər yetirdiyi yer, Tovhidin əsası və mənbəsi insanın qəlbidir.

Dördüncü, yada salma (zikr) və xatırlama (təzkir) adlanır. Allah-təala buyurmuşdur: *«Sən (onlara Quranla) öyüd-nəsihət ver (xatırlat). Çünki öyüd-nəsihət möminlərə fayda verir» (Qu-*

*ran, 51:55).* Allahı zikr məclislərinin savabı haqqında çoxsaylı hədislər vardır. Onlardan birində Məhəmməd Peyğəmbərin belə buyurduğu göstərilir: «Cənnət bağlarının yanından keçdiyiniz zaman orada əylənin». Ondan soruşdular: «Cənnət bağları deyəndə (yerdə) nəyi nəzərdə tutursunuz?». Peyğəmbər buyurdu: «Zikr məclislərini».[49]

Başqa hədisdə deyilir: «Allahın (yer üzündə) insanların mələklərindən[50] başqa da mələkləri var ki, dünyanı gəzir, zikr məclisləri gördükləri zaman bir-birlərinə: «Aradığımız yer buradır, gəlin», – deyərək məclis iştirakçılarına qoşulur və dinləyirlər. Bu halda çox zikr edin və Onu özünüzə xatırladın».[51]

Bunu zamanımızda əksər vairlərin nəyə çevirdiyini sən görürsən. Onların iddiasına görə bunlar – qissələr, şeirlər, ilham anında (şəth) gələn ayələr və durmadan yanılan digər bəlalardır (təmmat).

Qissələrə[52] gəlincə, bunlar ziyanlı yenilikdir (bidət). İlk müsəlmanlara oturub qissəçiləri (qüssas) dinləməyin qadağan olunduğu məlumdur. Onlar deyirdilər: «Bu nə Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, nə xəlifə Əbu-Bəkr əs-Siddiqin, nə də Ömər ibn əl-Xəttabın, Allah onlardan razı olsun, vaxtında olub. Sonralar qarışıqlıq (fitnə)[53] düşdü və qissəxanalar (qüssaslar) peyda oldular».[54]

Rəvayət edilir ki, bir dəfə İbn Ömər ibn əl-Xəttab, Allah ondan razı olsun, məscidi tərk edir və deyir: «Məni məsciddən çıxmağa hekayəçilər məcbur etdi. Əgər onlar olmasaydı, heç bir halda məscidi tərk etməzdim».

Suriya müftisi Dəmra ibn Rəbiə ər-Ramli Əbu Əbdurrəhman məlumat verir ki, mən Sufyan əs-Sayridən soruşdum: «Üzümüzü çevirib hekayəçini dinləyəkmi?». O dedi: «Zərərli yeniliklərə arxanı çevir».

---

[49] Ət-Tirmizi; Ənas ibn Malikdən; səhih.

[50] İnsan əməllərini yazan mələklər.

[51] Müslim, əl-Buxari, ət Tirmizi; Əbu Hürcyrədən. Müslimdə «dünyanı gəzən yerinə «daim hərəkətdə olan»
(səyyar), əl-Buxaridə «gəzən», ət-Tirmizidə «yerdə gəzən» işlənib.

[52] Məscid və ya bazarlarda Məhəmməd Peyğəmbər və onun yaxınları haqqında uydurma söyləməklə pul qazanan qüssasların rəvayətləri nəzərdə tutulur.

[53] Xəlifə Əli ibn Abu Talibin 661-ci ildə qətli ilə Ərəb xilafəti tarixində uzunmüddətli və qanlı-qadalı siyasi qarışıqlıq və vətəndaş müharibəsi dövrü başlayıb.

[54] İbn Məsih; Abdullah ibn Ömər ibn Həfsə əl-Umridən, o da Nafiə ibn Ömərdən, səhih.

İbn Abn söyləyir: «İbn Səririn yanına gələndə o, məndən soruşdu: «Bu gün hansı yeni xəbərlər var?». Mən dedim: «Əl-Əmir hekayəçilərə (qüssaslara) qissə danışmağı qadağan edib». Bu zaman İbn Sərir cavab verdi: «O, çox doğru bir iş görmüşdür».

Bir dəfə alimlərdən Süleyman ibn Mehran əl-Amaş Bəsrə məscidinə girəndə qissəxanın belə bir qissə danışdığını eşidir:

«Əl-Amaş bizə belə nəql edir ki...». Bu zaman əl-Amaş camaatın ortasına gəlib, qoltuğu altındakı tükləri yolmağa başlayır. Bu vaxt qissəxan ona deyir: «Ey şeyx, sənin üçün eyib deyilmi?». Əl-Amaş cavabında deyir: «Nəyə görə? Mən sünnədə buyurulanı yerinə yetirirəm. Sən isə yalan danışırsan. Əl-Amaş mənəm və mən sənə belə bir hekayə danışmamışam».

Əhməd ibn Hənbəl demişdir: «Ən yalançılar qissəxanlar və dilənçilərdir».

Əli ibn Əbu-Talib, Allah ondan razı olsun, qissəxanları Bəsrə məscidindən qovmuşdu. Amma əl-Həsən əl-Bəsrini dinlədikdə onu qovmamışdı. Çünki əl-Həsən axirətdəki gələcək həyat, ölüm haqqında danışar, insanları qəlblərindəki qəbahətlərdən, insanı məhv edən əməllərdən, şeytanın fitnə-fəsadından qorunmağa çağırırdı. O həmçinin Allahın xeyirxah və rəhmli olduğunu, insanın – Allah qullarının isə naşükürlüyünü onlara xatırladar, yer aləminin qüsurları, faniliyi, müvəqqətiliyini göstərər və axirətdə Cəhənnəmin təhlükəsindən və dəhşətindən xəbərdar edərdi. Şəriətin bəyəndiyi və tərifə layiq olan təzkir bax budur.

Məhəmməd Peyğəmbər Əbu-Zərrdən nəql edilən hədisdə bunun gərəkliliyi barədə buyurmuşdur: «Zikr məclisində iştirak etmək min rükət namaz qılmaqdan daha yaxşıdır. Zikr məclisinə baş çəkmək min xəstəyə baş çəkməkdən daha yaxşıdır. Elm (zikr) məclisində olmaq min dəfn mərasimində olmaqdan daha xeyirlidir».

Ondan soruşdular: «Ya Rəsulallah, bu məclislərə getmək Quran oxumaqdan da xeyirlidirmi?». O cavab verdi: «Bilik (elm) olmadan Quran oxumaq xeyir verərmi?!».

Əbu Məhəmməd Ata ibn Əbu Rəbbah, Allah ondan razı olsun, deyib: «Bir zikr məclisində iştirak etmək yetmiş işrət məclisinə getməyin günahını silər».

Bəzəyi, zahiri sevənlər bu hədisləri nəfslərinin təmizlənməsinə dair dəlil kimi qəbul etmiş və öz uydurmalarına da təzkir adı vermişlər. Onlar bəyənilən zikr yolundan çıxmış, cəfəngiyatla məşğul olaraq ziddiyyətlər yaratmış, hər şeyi qatıb-qarışdırmışlar.

Onlar uydurmalarında bəzi yerlərə əlavələr edir, bəzi yerləri ixtisara salır, Quranda olan hekayətlərdən uzaqlaşır və onlara istədiklərini daxil edirlər. Bəzi qissələrə qulaq asmaq xeyirli, bəzilərinə isə, onlar həqiqət olsa belə, qulaq asmaq ziyanlıdır. Kim bu qapını açsa, doğru ilə yalanı, xeyirlə ziyanı qarışdırmış olacaq. Buna görə də Əhməd ibn Hənbəl, Allah ona rəhmət eləsin, demişdir: «İnsanların həqiqəti danışan hekayəçilərə nə qədər ehtiyacı varmış!».

**İcazə verilən hekayələr**

Əgər hekayət peyğəmbərlərdən, onlara salam olsun, dindəndirsə və söyləyici onu dürüst, ötürüldüyü kimi nəql edirsə, mən burada heç bir qəbahət görmürəm. Qoy yalan söyləyən və peyğəmbərlərin səhvlərindən və ya özlərini necə çəkməklərindən danışan hekayəçilər narahat olsunlar. Onların hekayələrinin mənasını sadə dindar adamlar dərk edə bilmirlər. Peyğəmbərlərin nadir səhvlərindən, bundan sonra əfv edilib, yenidən xeyirxah əməllərinə davam etməsindən bəhs olunan qissələrlə sadə adamlar öz günahları və səhlənkarlıqlarına haqq qazandırırlar.

Sübut etməyə çalışırlar ki, bəs filan şeyx və ya filan böyük adam haqqında da deyilənlərə görə, onlar və həm də elə biz hamımız itaətsizliyə meylliyik və mən xəta etdiyim kimi, məndən daha fəzilətli və böyük insanlar da Allah-təalaya itaətsizlik göstərmişlər. Beləları nə etdiklərini bilmədən, Allah-təalaya qarşı cürət etmiş olurlar.

Əgər bu iki xəbərdarlıq nəzərə alınsa, hekayə söyləməkdə bir zərər yoxdur. Onda Qurandakı bəyənilən qissələrə və «Səhih» toplusunda həqiqiliyi təsdiq olunan hədislərə qayıdış baş verər.

Bəziləri insanları Allaha itaətə çağıran rəvayətlər düzəltməyi məqbul hesab edir və iddia edirlər ki, onların məqsədi xalqı Allah-təalaya yönəltməkdir. Amma bu şeytan fitnəsidir. Həqiqətin yalana ehtiyacı yoxdur. Allah-təalanın Quranda buyurduqları və Onun Rəsulu Məhəmməd Reyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, hədisləri kifayət qədər çoxdur və bu məsələdə özündən nəsə qoşmağa və uydurmağa ehtiyac yoxdur. Bu, nəsrin süni qafiyələndirilməsi (səc) kimi qəbuledilməzdir və qeyri-təbii, saxta dəyərləndirilməlidir. Sad ibn Əbu Vəqqas, Allah ondan razı olsun, oğlu Ömərin qafiyəli nəsri necə işlətdiyini eşitdikdə ona demişdir: «Bu, məni sənə qarşı çox hiddətləndirdi. Sən bu işə tövbə

etməyincə mən sənin heç bir istəyini yerinə yetirməyəcəm». Oğlu isə bu zaman onun yanına xahişə gəlmişdi.

Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, Abdullah ibn Rəvahaya səc barəsində bu iki kəlməni demişdir: «Ey İbn Rəvaha, səcdən uzaq ol!». Halbuki tənbeh olunan süni qafiyəli nəsrdə iki sözdən artıq qafiyə olmamışdı.

Buna görə də öldürülmüş hamilə qadının uşağının qanbahası (diyə) ilə bağlı Peyğəmbərə: «İçməyən, yeməyən, anadan olanda qışqırıb-çığırmayana diyə düşürmü? Axı bu, qisas olmur?» – sualı verən birisinə Məhəmməd Rəsulallah, Allahın ona xeyir-duası və salamı olsun, söyləmişdir: «Sən bədəvi ərəblər kimi səc demək istəyirdin?».[55]

Şeirlərə gəlincə, öyüd və nəsihətlərdə onların çox olması pis haldır. Allah-təala buyurmuşdur: *«Şairlərə gəlincə, onlara yalnız azğınlar uyar! Məgər görmürsənmi ki, onlar hər bir vadidə sərgərdan gəzib dolaşırlar?» (Quran, 26:224-225).* Böyük Allah, həmçinin buyurub: *«Biz ona şeir öyrətmədik və bu, ona heç yaraşmaz da (lazım da deyildir)» (Quran, 36:69).* Vaizlərin oxuduğu şeirlərin çoxu eşq, məşuqənin gözəlliyi, vüsalın şirinliyi və ya ayrılıq əzabı barədə olur. Onların məclislərini qəlbi ehtirasla dolu, özləri isə daim gözəl obrazlara meyl edən qaba adamlar təşkil edər. Bu halda şeir onların qəlbində yuva qurmuş şəhvəti oyadar və onları ehtiras oduna yandırar. Bu məclislərə yığılanlar qeyri-ixtiyari çığırıb-bağıraraq, eşqin şövqündən rəqs etməyə başlarlar. Bunların çoxu və ya hamısı əxlaqsızlığın və qəbahətin növləridir.

Beləliklə, poeziyada yalnız öyüd və hikmət dolu şeirlərdən sübut və əyani vasitə kimi istifadə etmək lazımdır.

Məhəmməd Peyğəmbər, Allahın ona xeyir-duası və salamı olsun, buyurmuşdur: «Həqiqətən, poeziyada hikmət də vardır».[56]

Əgər məclisdə ürəklərində Allaha saf məhəbbətlə dolu seçilmiş adamlar olsa və onlara başqaları qoşulmasa, belələri üçün hərfi mənada insan bədəninin gözəlliyini vəsf edən şeirin heç bir zərəri olmaz. Çünki belə dinləyici «Səma kitabı»nda deyildiyi kimi, eşitdiyi hər şeyi pis mənada deyil, ürəyinin məhəbbəti ilə qəbul edir. Bu səbəbdən əl-Cüneyd, Allah ona rəhmət etsin, həmişə təxminən on nəfərlik məclislərdə fikirlərini izah edərdi. Çox

---

[55] Müslim; əl-Mühirdən.
[56] Əl-Buxari; Əbu ibn Kəəbdən.

adam olanda o danışmazdı. Onun məclisində heç vaxt iyirmidən artıq adam olmayıb. Bir dəfə bir qrup kişi İbn Səlimin qapısına gəldi. Ona dedilər: «Yoldaşların gəlmişlər, çıx onlara bir söz söylə». İbn Səlim cavab verdi: «Onlar mənim yoldaşlarım deyil, mənimlə daimi məclisə gələnlərdir. Mənim yoldaşlarım – Allahın seçilmiş bəndələridir *(həvas)*».

Şəthə gəlincə, burada biz sufilərin əlavə etdiyi iki xüsusu nəzərdə tuturuq.

Onlardan biri Allah-təalaya məhəbbətdə və Ona qovuşmada çox irəli getmiş iddiaların təsdiqidir. Bu, onları vacib dini göstərişlərin icrasından azad edir. Hətta bəziləri hərfi mənada Allahla qovuşmaq (ittihad), Onun üzərindəki pərdəni qaldırmaq, Onu qeyd etmək və Onunla dillə ünsiyyət qurmaq kimi iddialara qapılmışlar. Və onlar deyirlər ki, bizə Allah belə dedi, biz də belə dedik... Bu halda onlar bu cür sözlər söylədiyinə görə, edam edilmiş əl-Hüseyn ibn Mənsur əl-Həllaca bənzəmək istəyirlər. Onlar bu xüsusda əl-Həllacın «Həqq mənəm!» sözlərinə və həmçinin guya ki, Əbu Yəzid əl-Bistaminin söylədiyi «Sübhani! Sübhani» («Mənə eşq olsun! Mənə eşq olsun! Mən nə qədər böyükmüşəm!») kəlmələrinə istinad edirlər.

Həmin kəlamın bu mənası sadə mömin adamlara ziyanlıdır. Çünki kəndlilərin bir qismi hətta əkinçiliyi buraxıb, bu cür quru iddiaların dalınca düşmüşlər. Həqiqətən, bu cür fikirlər insanlara cazibədar görünür. Belə ki, xeyir işlərdən imtina edib Allaha gedən yolun mərtəbələrinə (məqamət) və vəziyyətlərə (əhval) çatmaq sayəsində qəlbin təmizlənməsi ifadə olunur. Cahillər hələ də buna yiyələnmək kimi iddialar irəli sürməyə cəsarət edirlər, hələ də bu kimi dəbdəbəli və ibarəli ifadələrdən yapışmağa çalışırlar. Hər dəfə onları məzəmmət edəndə isə özlərini saxlaya bilməyib belə deyirlər: «Sizin bu məzəmmətlərinizin səbəbi adi biliklər verən elminizdən və dialektikaya əsaslanmanızdan doğur. Elm – həqiqi biliyin önünü kəsən pərdədir, dialektika isə nəfsin işidir. Şəth isə yalnız İlahi Nuru kəşf edib, gizli (batini) biliklərə yiyələnməklə gəlir».

İndi qığılcımları bir sıra ölkələrə səpələnən bu kimi fikirlərin adi möminlərə zərərli təsiri artmışdır. Din yolunda bu kimi fikirlər söyləyənlərin öldürülməsi on adama can verməkdən daha xeyirlidir.

O ki qaldı Əbu Yəzid əl-Bistamiyə, Allah ona rəhmət eləsin, deyim ki, onun adına bağlanan sözlər uydurmadır. Ola bilsin ki, o,

bu sözləri öz nitqində Qadir və Böyük Allahın adından, qəlbində onu xatırlayaraq demişdir. Hətta siz əgər onun «Allah mənəm, məndən başqa, Allah yoxdur. Mənə ibadət edin» dediyini eşitsəniz, bunu yalnız məcazi mənada başa düşmək lazımdır.

Şəthin digər növü mənası anlaşılmayan xüsusi kəlmələrdir. Bu kəlmələr zahirən çox gözəldir, səslənəndə heyrətləndirici görünür, lakin heç bir əhəmiyyət daşımır. Onlar hətta bu kəlmələri söyləyənlər üçün də anlaşılmaz olur. Çünki çox halda ağlını itirmiş vəziyyətdə, söylədiklərinin mənasını təsəvvür etməkdə pozğunluq yaranması ilə əlaqədar çətin anladıqları vəziyyətlərdə söyləyirlər.

Ən çox ehtimal edilən fərziyyə budur. Ya da bu sözlər onlara aydındır, lakin elmlə az məşğul olduqlarından və incə hikmətləri ibarəbazlıq etmədən söyləməyi öyrənmədiklərindən onları izah etməyi və onların gizli mahiyyətini göstərən mənaları açmağı bacarmırlar.

Bu sözlərin ürəkləri həyəcana salıb, ağılları başdan çıxarmaq və əqli mühakiməni itirməyə səbəb olmaqdan başqa, heç bir əhəmiyyəti yoxdur. Bu sözlərdə bəzi adamlar əslində həmin kəlmədə nəzərdə tutulandan fərqli mənalar axtarıb, onu öz istəklərinə və əxlaqlarına uyğun şəkildə başa düşür. Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «İnsanlara onların başa düşmədiyi bir tərzdə xitab edənlər onlar üçün mütləq fitnə-fəsad mənbəyinə çevriləcəklər».

O, ona Allahın xeyir-duası və salamı olsun, həmçinin buyurub: «İnsanlara anladıqları şeylərdən danışın. Onların anlamadıqlarından danışmaqdan çəkinin. Məgər siz Allahın və Onun Rəsulunun yalançı olmasınımı istəyirsiniz?» [57]. Bunlar söyləyicinin özünün başa düşdüyü, lakin dinləyicinin ağlı kəsmədiyi söhbətlər haqqındadır. Öz dediyini özü belə anlamayanlar haqqında isə nə demək olar?!

Söyləyənin başa düşdüyü, lakin dinləyicinin anlamadığı tərzdə danışmaq yolverilməzdir.

İsa Peyğəmbər (ona salam olsun) buyurub: «Nalayiq kimsəyə hikmətdən söz açmayın. Çünki haqsızlıq etmiş olarsınız. Buna layiq olanı da bu haqdan məhrum etməyin, yoxsa yenə ədalətsizlik etmiş olarsınız. Məlhəmi ağrıyan yerə sürtən şəfqətli bir həkim kimi olun».

---

[57] Əl-Buxari. Həmçinin əbu-Mənsur əd-Dilmi, əbu-Naimdən.

Onun belə dediyi də rəvayət olunur: «Nalayiq adamlara hikmət anladanlar nadanlıq, layiq olduğu halda kimsəni hikmətdən məhrum edənlər isə ədalətsizlik etmiş olarlar. Hikmətin də haqqı var. Və eləcə də buna layiq insanlar var. Bu halda haqlıya öz haqqını verməlisən».

Böyük bəlalara gəlincə, bizim şəthə aid xatırladıqlarımız da buraya aiddir. Bura, həmçinin şəriətə aid, mənası hamıya məlum anlayışların gizli şeylərə şamil edilməsi də daxildir. Bunların batinilərin Quranı və sünnəni istədikləri şəkildə şərh etməsi kimi ağıla faydası olmaz. Bunlar həm də qadağan (haram) edilib və onların zərəri böyükdür. Axı sözlərin Şəriət Sahibindən Məhəmməd Peyğəmbərin bizə qalan yozumuna istinaddan imtina etmək və onların əqlin diktə etdiyi mahiyyətinə ehtiyac görmədən həqiqi mənasından ayırmaq bu anlayışlara etibarı azaldır. Allah və Onun Rəsulunun (ona Allahın xeyir-duası və salamı olsun!) buyurduqlarının əhəmiyyətini heçə endirir. Çünki buradan nə başa düşmək lazım olduğuna yəqinlik azalır. Gizlin olanın heç bir dəqiq ölçüsü olmaz. Əksinə, onunla bağlı bir-birinə zidd fikirlər və suallar doğar və ona hərə bir cür şərh verər. Bu da həmçinin dinə böyük zərər vuran ziyalı yeniliklərinin ən geniş yayılmışlarındandır. Bu baxış tərəfdarlarının məqsədi təəccüb doğurmaqdır. Çünki insan qəlbi qəribə şeylərə meyl edər və ondan zövq alar. Batinilər də bu üsulla – şəriətin hökmlərinə alleqorik şərhlər vermək və onları öz şəxsi mülahizələrinə uyğun nəzərdən keçirməklə şəriətin bütün təməllərini dağıtmağa çalışırlar. Bizim batiniləri təkzib etmək üçün yazdığımız «Müstəzxirin»[58] adlı kitabda bu barədə danışılmışdır. Adamların səhv yozumlarına görə, böyük fəlakətlər gətirmiş kəlmələrdən biri Allah-təalanın *buyurduğu «Fironun yanına get! Çünki o, artıq çox azğınlaşıb...» (Quran, 20:*24) ayəsində, guya pis işlərə meyl edən qəlb və ya nəfsə işarə olunmasıdır.[59] O şərhçilərin dediyinə görə, Firon deyildikdə ürək nəzərdə tutulur, çünki hər bir insanın qəlbi azır.

Allahın *«Əsanı yerə at!» (Quran, 28:31)* dediyi ayədə də, guya ki, insanın Qadir və Böyük Allahdan başqa, əlində olan hər şeyi atması nəzərdə tutulur. Məhəmməd Peyğəmbərin, Allahın

---

[58] Bu kitabın adı Abbasilər sülaləsinin 22-ci xəlifəsi Müxtəxsir-bil-Lahi əbu əl-Abbas Əhməd ibn əl-Müqtədir-bil-La Əbu əl-Qasim Abdullah əl-Abbasinin adındandır.
[59] Müqayisə et: «Mən özümü təmizə çıxarmıram (Rəbbimin rəhm etdiyi kimsələr istisna olmaqla), nəfs insana pis işlər görməyi əmr edər» (Quran, 12:53).

ona xeyir-duası və salamı olsun, buyurduğu «Səhər yeməyini dan yeri ağarmamış yeyin, çünki səhər yeməyində bərəkət vardır»[60] sözlərini də belə şərh edirlər ki, guya burada səhər erkən qida qəbul etməyin insanların günahlarını silməsi nəzərdə tutulub. Buna çox nümunələr gətirmək olar: onlar hətta Quranı əvvəldən axıradək təhrif edir və ibn Abbas və başqa alimlər tərəfindən təfsirlərini, onun «zahiri», «hərfi» mənada izahını rədd edirlər.

Bu cür fərqli təfsirlərin bir çoxunun yanlış olduğu tam aydındır. Məsələn, Fironu qəlb zənn etmək kimi. Firon konkret şəxsdir. Onun, həqiqətən, tarixdə mövcud olması və Musanın onu haqqa dəvət etməsi ağızdan-ağıza ötürülərək bizə çatmışdır. O, Əbu Cəhl, Əbu Ləhəb və digərləri kimi kafirlərdəndir. Firon heç şeytan və mələklər kimi gözəgörünməz məxluqlardan da deyil ki, bu səbəbdən ona hansısa fərqli yozum verilsin.

Sübh vaxtı qida qəbul etməyin (suhur) insanın günahlarını silməsi barədə fikir də bu qəbildən bir yalandır. Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, yemək yeyəndə ətrafdakılara deyərdi: «Sübh vaxtı yemək yeyin», «Bərəkətli qidadan siz də dadın».[61]

Belə şərhlərin yalan olduğunu fasiləsiz ötürülərək bizə gəlib çatan hədislər və həmçinin lamisə orqanlarımız vasitəsilə müəyyən edə bilərik. Bu yozumların bəzisi də tamamilə ehtimal üzərində qurulub və onların başa düşülən həqiqi mənası ilə heç bir bağlantısı yoxdur. Bütün bunları şəriət qadağan etmişdir və bunlar xalqın etiqadını sarsıdan bəladır.

Bu kimi yozumlar nə səhabələrdən, nə də onların davamçılarından qalmış rəvayətlərdə var. Xalqı daim Haqqa dəvət edən və onlara nəsihətlər verən Həsən əl-Bəsri də belə rəvayətlər nəql etməyib.

Məhəmməd Peyğəmbərin «Quranı öz şəxsi mülahizələri əsasında təfsir edənin yeri Cəhənnəm atəşidir»[62] kəlamından müstəqim mənadan başqa, məna çıxarmaq lazım deyil. Qoy Quranı təfsir edən hər kəsin fikri və qayəsi Allahın qoyduğu qanunların açıqlanması və təsbiti olsun. Qoy hər kəs Quranın ayələrini baxılan məsələdə sübut gətirsin və öz fikrinin isbatı üçün məfhumi, bayağı dillərdən əl çəksin.

---

[60] Müslim, əl-Buxari; Ənas ibn Malikdən

[61] Əbu Daud, ən-Nasai, İbn Həbban, əl-Arbad ibn Səriyədən. İbn əl-Kəttan bu hədisi zəif sayır

[62] Ət-Tirmizi; İbn Abbasdan, səhih

Bu söylənilənləri heç də Quranın təfsirində «sitatlara» (istinbat) və düşünməyə ehtiyac olmaması kimi anlamaq lazım deyil.

Həqiqətən, ayələr içərisində elələri var ki, Məhəmməd Peyğəmbərin əshabələri və Quran təfsirçiləri onların beş, altı, bəzən yeddi mənasını göstərmişlər. Bilirik ki, bu şərhlərin heç də hamısı Peyğəmbərin, ona Allahın xeyir duası və salamı olsun, dilindən eşidilməyib. Bəzən onlar bir-birinə zidd də olur və hamısının qəbul edilməsi bu səbəbdən mümkün deyil. Bu halda onların həqiqi mənası yaxşı dərk olunduqda və uzun zaman düşündükdə ortaya çıxarıla bilər. Bu xüsusda Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, İbn Abbasa, Allah ondan razı olsun, buyurmuşdur: «İlahi! Onu din elminə gətir və ona təfsiri öyrət».[63]

Böyük faciələrin baiskarı olan, Qurandakı sözləri bilərəkdən başqa şəkildə yozan və bununla guya xalqı Haqqa itaətə səslədiklərini iddia edən adamlar Allahın Rəsulunun, Allahın ona xeyir-duası və salamı olsun, adından həqiqət naminə söz uyduranlara bənzərlər. Onlar da eynən hər vəziyyətdə Məhəmməd Peyğəmbərin adından sözlər uyduran və bunu doğru hesab edənlər kimidirlər. Bu isə özbaşınalıq, azğınlıq və Məhəmməd Peyğəmbərin (Allahın ona xeyir-duası və salamı olsun) xəbərdarlıqlarına sayğısızlıqdır. Peyğəmbər buyurub: «Mənim barəmdə yalan söyləyənlər, qoy indidən Cəhənnəmdə yerlərini hazırlasınlar».[64] Bu sözlərin təhrifindən yaranan ziyan daha böyük, daha faciəvidir. Çünki belə şeylər Qurandan bəhrələnmək, onu dərk etmək yolunu qapayır. Şəriətə olan inamı azaldır.

Beləliklə, indi sən bildin ki, şeytan insanların bəyənilən elmlərə olan marağını necə çirkin elmlərə tərəf çevirib. Bütün bunlar şeylərin həqiqi adını təhrif edən pis niyyətli alimlərin uydurmalarıdır. Əgər sən İslamın ilk çağında nəyin həqiqət sayıldığına fikir verməyib, populyar şəxslərin arxasınca getsən, həkim adlandırılan birisinin arxasınca getməklə müdrikliyə yetmək istəyən birisinə bənzəyəcəksən. Axı indi təbibə də, şairə də, münəccimə də «həkim» adı verilir. Bu da həmin kəlmənin ifadə etdiyi mənadan uzaqlaşması ilə bağlıdır.

Beşinci ad-hikmətdir (hikma). Əslində, indi tə[illegible]lə, şairə də, astroloqa da və hətta bazarlarda oturub kəndlilərin ovcundakı

---

[63] Əhməd ibn Hənbəl, İbn Həbban, əl-Hakim. Əl-Buxari də İbn Abbasdan («Ona təfsir öyrət» sözləri olmadan), səhih.

[64] Müslim, əl-Buxari; Əbu Hüreyrədən və Ənas ibn Malikdən

ziyilləri təmizləyənlərə də həkim (müdrik) deyirlər. Amma həqiqi hikmət Qadir və Böyük Allahın bəyəndiyidir. Allah-təala buyurub: *«Allah istədiyi şəxsə hikmət (elm, mərifət, müdriklik) bəxş edər. Kimə hikmət bəxş edilmişsə, ona çoxlu xeyir (əbədi səadət) verilmişdir» (Quran, 2: 269).*

Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «İnsanın bir kəlmə hikmət öyrənməsi onun üçün bu dünyadan və onda olan hər şeydən daha xeyirlidir».[65] Gör əvvəllər hikmət deyəndə nə başa düşülürdü və indi o, nəyə çevrilib. Digər adlarla bunu müqayisə et və özünü məkrli alimlərin yalanından qoru. Axı onların dinə vurduğu zərər, şeytandan gələn zərərdən daha təhlükəlidir. Şeytan məhz onların vasitəsilə imanı insanların qəlbindən çıxarmağa çalışır. Bu səbəbdən Allahın Rəsulu (ona Tanrının xeyir-duası və salamı olsun) ondan «İnsanların ən pisi kimdir?» deyə soruşulduqda əvvəlcə cavab vermək istəməyərək: «İlahi, əfv elə», - demişdi. Nəhayət, bunu ondan bir neçə dəfə soruşduqdan sonra «Onlar pis niyyətli alimlərdir», - demişdi.[66]

Beləliklə, sən bəyənilən və bəyənilməyən elmlər, onlardakı yanlışlıqlardan nələrin törəndiyini bildin. İndi sən seçim qarşısındasan; ya nəzər-diqqətini cəmləyib, həqiqi mömin sələflərinin (sələf) yolu ilə getməlisən, ya da aşağılara enib, xülyaların ipindən yapışanlardan olmalısan. Sələflərin məşğul olduğu elmlərin hamısı indi yoxa çıxmışdır. İndi insanların ciddi-cəhdlə məşğul olduğu elmlərin əksəriyyəti uydurma və saxtadır. Allahın Rəsulu Məhəmməd Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur: «İslam əvvəllər qəribə təsir bağışlayırdı, sonunda yenə qəribə olacaqdır. Qəriblər nə bəxtiyardır!».[67]

Ondan soruşdular: «Qəriblər kimlərdir?». O cavab verdi: «İnsanların mənim sünnəmdə pozduqlarını bərpa edənlər və insanların mənim sünnəmdə unutduqlarını dirçəldənlər». Bu hədisin başqa bir şəklində deyilir: «Onlar indi sizin də daxilində olduğunuz həqiqətlərə sarılanlardır».[68] Digər bir hədisdə isə buyurulur: «Qəriblər insanlar arasındakı çox az əməlisaleh möminlərdəndir. Alla-

---

[65] Bu hədisin bənzəri yuxarıda da verilib

[66] Əd-Dərami; əl-Əhvasdan və İbn Hakimdən (onun atasının dilindən); zəif. Həmçinin əl-Bərrar, Məərdən zəif hədis kimi verib.

[67] Ət-Tirmizi; Əmra ibn Aufdan, səhih. Həmçinin Müslim; Əbu-Hüreyrədən, qısa şəkildə.

[68] Əl-Hafiz əl-İraqi bu hədisin mənbəyini tapmayıb

hın yaratdığı insanlar içində onlara həqarətlə baxanların sayı onları sevənlərin sayından çoxdur».[69]

O bəyənilən elmlər bu gün yoxa çıxıblar. Onları xatırlayanlara isə nifrətlə baxırlar. Buna görə də Sufyan əs-Sauri (Allah ondan razı olsun) demişdir: «Əgər bir alimin başına çoxlu dostlar yığışıbsa, bil ki, o, həqiqi alim deyil. Çünki əgər o, həqiqəti danışmış olsaydı, onu heç kəs sevməzdi».

**Bəyənilən elmlərin bəyənilmə dərəcələrinin izahatı**

Bil ki, bu xüsusda elmlər üç hissəyə bölünür: birinci hissəyə – az və ya çox dərəcədə çirkin olan (bəyənilməyən) elmlər, ikinci hissəyə – az və ya çox dərəcədə bəyənilən elmlər (bəyəniləsi şeylər nə qədər çoxsa, o qədər gözəldir), üçüncü hissəyə – kifayət qədər bəyəniləsi hikməti olan, lakin dərindən araşdırdıqda çoxlu da bəyənilməyən şeylər olan elmlər daxildir. Bu, eynilə bədənin halına bənzəyir, bədənlə bağlı bəzi hallar var ki, az da olsa, çox da olsa, gözəldir. Məsələn, sağlamlıq və gözəllik kimi. Bədənin bəzi halları isə az və çox olmasından asılı olmayaraq, xoşagəlməzdir. Məsələn, çirkinlik və pis vərdiş kimi. Bu hallar içərisində elələri də var ki, onlar həddində gözəl olur. Məsələn, malını Allah rizası üçün paylamaq bəyəniləndir, lakin burada israfçılıq bəyənilməz. Və yaxud qəhrəmanlıq göstərmək bəyənilən, lakin ehtiyatı əldən vermək bəyənilməzdir.

Elmlər də belədir. Onların bəyənilməyən hissəsi nə dində, nə də dünyəvi işlərdə heç bir xeyir gətirmir. Çünki sehrbazlıq, hərflərdə gizli məna axtarmaq və nücum kimi onların zərəri xeyrindən çoxdur. Bu hissə tam əhəmiyyətsizdir və insan üçün ən dəyərli şey olan ömrünü boşa verməkdir. Dəyərli şeyi itirmək isə bəyənilməz. Bu elmlərdən elələri də var ki, onların zərəri bu dünyada, zənn ediləndən çox-çox artıq olur. Biz hələ burada bu elmin birbaşa vurduğu zərəri hesaba almırıq.

Bütün tərəfləri ilə bəyənilən elmlərə (ikinci hissəyə) gəlincə, bunlar Allah-təala, Onun sifətləri, işləri, sünnəti-ilahiyyə, Onun hikməti, axirəti bu dünyada insanların öz əməlləri müqabilində quracağı haqqında elmlərdir. Bu elmlər həm insanların özü üçün, həm də axirətdə əbədi səadətə çatmaq üçün lazımdır. Bu meydanda nə qədər can qoysan da, bu, lazımi səviyyə əldə etməyə

---

[69] Əhməd İbn Hənbəl; Abdullah ibn Əmradan

kifayət etməz. Çünki bu, elə bir ümmandır ki, onun dərinliklərinə enmək mümkün deyil. Lakin hər kəs öz çabası qədər onun kənarında və ya sahilində dolaşa bilər. Yalnız peyğəmbərlər, övliyalar, elmlərdən dərin məlumatlı kimsələr aralarında və mövqelərində Allahın istəyi ilə olan fərqə baxmayaraq, onun sahilində gəzə bilirlər. Kitablarda əks olunmayan gizli elmlər elə budur. Əvvəlcə insana onu dərk etməkdə təhsil və axirət aləmindən xəbərdar olanların əməllərini və həyat tərzini izləmək kömək edir (Bunların əlamətləri barədə aşağıda danışılacaqdır). Sonra insana mücahidə (içəridə nəfslə mübarizə), riyad (nəfsi ram etmək), qəlbin təmizlənməsi (onun fani dünya ilə bağlılığından qurtarmaq) və peyğəmbər və övliyaların həyatını bilmək kömək edir. Bunların sayəsində də hər kəsə, əlbəttə ki, çalışmadan yox, Allahın verdiyi istedaddan asılı olaraq, bu biliklərdən nə isə əyan olur. Lakin burada cəhd etmədən (ictihad) nəyəsə nail olmaq da mümkün deyil. Çünki mücahidə (daxili mübarizə) – Hidayət yolunun[70] açarıdır və onun bundan başqa açarı yoxdur.

Qismən bəyənilən elmlərə gəldikdə, biz bu elmləri bütün cəmiyyət üçün lazımlı biliklərə aid bölümdə (fərz ülkifayə) xatırlamışıq. Həqiqətən, bu elmlərin hər birindən lazımi qədərdə kifayətlənmək yetərlidir. Bu, ən az olan və ən lazımlı, həddində olandır, qızıl mərkəzdir. Bu həddən o tərəfə olan sonsuzdur, ömrün sonuna qədər sürər. Bu halda bu ikisindən birini seç: ya öz nəfsinlə məşğul ol, ya da özünlə (nəfsinlə) məşğul olmadan qurtul, sonra başqaları ilə məşğul ol. Və özünü islah etməmiş başqalarına nəsihət verməyə cəsarət etmə. Əgər özünlə, nəfsinlə məşğulsansa, sənə vacib olan, sənin mövqeyinin tələb etdiyi və dinin buyurduğu biliklərə yiyələnməyə çalış. Məsələn, namazı (səlat), təharəti, orucu öyrən. Lakin bunların içərisində ən vacib olanı hamının etinasız yanaşdığı qəlbə xas keyfiyyətləri, onlardan hansının gözəl, hansının çirkin olduğunu öyrənən elmdir. Çünki insan tamah, paxıllıq, riyakarlıq, təkəbbür, xudbinlik və s. bu kimi xoşagəlməz keyfiyyətlərdən azad deyil. Bütün bu dağıdıcı keyfiyyətlərə biganə olub, dini göstərişlərin zahiri tərəfləri ilə məşğul olanlar qotur basmış birisinin bədənindəki irini qanalma və mədəsini təmizləyib müalicə etmək əvəzinə, onların üzərini kosmetika ilə örtənlərə bənzərlər. Ara həkimləri hər yaranın üstünə məlhəm çəkdiyi

---

[70] «Bizim uğrumuzda cihad edənləri öz yollarımıza qovuşduracağıq» (Quran, 29:69)

kimi, başdansovdu alimlər də insanları zahiri əməllərə səsləyirlər. Axirət alimləri isə insanlara əvvəlcə daxilən təmizlənməyi, xəstəliyin mənbəyini məhv etməyi və qəlbdə şərin cücərtilərini kökündən qoparıb atmağı məsləhət görməklə bəlanın yolunu qapamağa çalışırlar. Qəlbə təlqin etmək fiziki fəaliyyətdən çətin olduğundan çoxları mənən təmizlənməni bir tərəfə buraxıb, zahiri əməllərlə məşğuldur. Necə ki, acı dərmanlar qəbul etmək istəməyən xəstə hər məlhəmi bədəninə sürtərək oradakı irinləri artırmış olur.

Əgər sən axirətdə Cənnət arzusundasansa, məhvdən qurtulmaq və Cəhənnəmin əbədi əzabından uzaq olmaq istəyirsənsə, onda bizim «Mühlikat haqqında fəsil»də izah etdiyimiz kimi, gizli dərdlərin müalicəsi ilə məşğul ol. Bunlar səni bizim «Qurtarıcılar haqqında fəsil»də göstərdiyimiz kimi, mütləq şərəfli «məqamlara» (məqamət) yüksəldəcək. Çünki çirkinlikdən üz döndərən qəlb gözəlliklə dolmalıdır. Əgər torpağı da alaq otundan təmizləsən, oradan daxil və ya ətir saçan çiçəklər cücərər. Qəlb çirkin keyfiyyətlərdən təmizlənməsə, orada yaxşı keyfiyyətlərin baş qaldırması mümkün olmaz. Fərz ül-kifayə elmlərinə bütünlüklə aludə olma, xüsusən də bu elmlərlə məşğul adamlardan uzaq ol, çünki başqalarını tərbiyə etmək yolunda özünü fəda edən adamlar elə də ağıllı deyillər. Öz paltarına ilan və əqrəb dolmuş bir adam onlardan qurtulmaq yerinə, başqa birisinin üzərindəki milçəyi qovmaq həvəsindədirsə, o, çox səfeh adamdır. Çünki nə başqasına xeyri dəyəcək, nə də özünü ilan və ərqəblərdən qurtara biləcək.

Əgər sən öz nəfsini islah edib, onu təmizləyə bilsən, aşkar və gizli günahları tərk etməyi bacarsan, onda bu, səndə adi vərdişə çevriləcək. Amma, hələ ki, sən bundan uzaqsan, fərz ül-kifayə elmləri ilə məşğul ol və tədricən bu istiqamətdə irəlilə. Əvvəlcə Allah-təalanın Kitabından başla, sonra Allahın Rəsulu Məhəmməd Peyğəmbərin, ona Tanrının xeyir-duası və salamı olsun, sünnələrinə keç. Sonra təfsiri (Quranın izahı) və digər Quran elmləri, məsələn «ləğv edən və ləğv olunmuş» (ilm ən-nasix və əl-mənsux), «aydın» (möhkəm) və «aydın olmayan», «metaforik» (mütəşbihat) ayələr barədə bilikləri, həmçinin sünnə elmini öyrən. Daha sonra fiqhin tərkibinə daxil olan hüquqi-doqmatik istiqamətləri (məzhəbləri) öyrənən füpü («qollara parçalanma») elminə yiyələn. Məzhəbləri arasındakı ixtilaflara baş qoşma. Bundan da sonra fiqhin əsaslarını (üsul əl-fiqh) öyrən. Digər elmləri də beləcə, həyatındakı imkanına görə, hərəsini öz vaxtında mənimsəməyə səy et.

Ömrünü yalnız bir elmin dərindən öyrənilməsinə sərf etmə, çünki həyat qısa, elmlərsə çoxdur. Bu elmlər özu üçün əhəmiyyət daşımayıb, biri digərinin öyrənilməsi üçün bir vasitə və ya zəmindir. Buna görə də zəmin, vasitə olan doğru olmaz.

Bu halda ərəb dilini öyrən, onunla sən ərəblərin dilini başa düşəcək və ərəbcə danışa biləcəksən. Öyrənəcəyin kəlmələrin sayını Quran və hədislərdəki kəlmələrin sayı ilə məhdudlaşdır, bu dilin incəliklərini və dərinliklərini isə bir tərəfə burax. Qrammatika elmindən də Quran və sünnəni bilməkdə sənə yetəcək qədər bilsən kifayətdir. Çünki elə bir elm yoxdur ki, onda yetərli normal və dərin səviyyələr olmasın.

Biz bunu hədis, təfsir, fiqh və kəlam elmlərinin timsalında göstərək ki, sənə digər elmlərə münasibətdə bir meyar olsun.

Təfsir elmində yetərli olmaq, yəni Qurana bərabər təfsir deməkdir. Məsələn, Əli əl-Vahidi əl-Nişaburinin tərtib etdiyi «əl-Vaciz» kimi.

Adi, normal təfsir öz həcminə görə üç Qurana bərabər təfsirdir. Buna misal olaraq, yenə adını çəkdiyimiz müəllifin «Əl-Vasit» əsərini göstərmək olar.

Bundan artıq olan dərin tədqiqdir. Bu, sənə lazım deyil, çünki onun harada bitdiyi bilinməz.

Hədislər haqqında elmə gəlincə, orada yetərli olan «Səhih» adlı iki məcmuədəki (əl-Buxarinin və Müslimindir) hədisləri bilməkdir. Lakin bunu əldəki əlyazma nüsxələrini hədis mətnlərini dərindən bilən alimlərə yoxlatdırdıqdan sonra etmək lazımdır. Hədislərdəki şəxs adlarını əzbərləməyə gəldikdə, səndən əvvəlki hədis alimlərinin bu sahədəki çalışmaları sənə bəs edər. Sənə onların kitablarına müraciət etmək kifayətdir. Bu «Səhih» məcmuələrindəki hədislərin mətnlərini əzbərləməyinə də ehtiyac yoxdur. Lakin onları elə səviyyədə bilməlisən ki, ehtiyac olanda axtardığını tapmağı bacarasan.

Hədis elmində orta səviyyədə bu iki «Səhih» məcmuəsinə, onlara daxil edilməmiş, lakin müsnadlarda yazılmış hədisləri əlavə etməkdir.

Dərin tədqiqə gəldikdə, bura bundan sonrakı bizə gəlib çatmış bütün zəif (daif), güclü (kavi), etibarlı (müvəssəq), mötəbər (həsən), səhih (səhih) və saxta (səqim) hədisləri, həmçinin hədislərin necə ötürülməsi və hədis söyləyicilərinin adları, bioqrafiyaları, mənəvi keyfiyyətləri məsələlərini bilmək daxildir.

Fiqh elminə gəldikdə orada yetərli olan əl-Müzaninin, Allah

ona rəhmət eləsin, «Əl-Müxtəsər» əsərində olanları mənimsəməkdir. Biz onun qısa şərhini «Xülasə əl-Müxtəsər» adlı əsərimizdə vermişik.

Fiqhdə orta səviyyə, həcmi bizim «Əl-Vasit min əl-məzhəb» kitabı kimi olan «Əl-Müxtəsər» böyüklüyündə üç əsəri mənimsəməkdədir.

Fiqhin dərin tədqiqi bizim «Əl-Vəsit» adlı əsərimizdə şərh etdiyimiz, həmçinin iri-iri kitablarda toxunulan məsələlərdir.

Kəlama gəldikdə, bu elmin məqsədi pak, mömin sələflərdən sünnə əhlinin bizə ötürdüyü təməl inancları qorumaqdır. Bundan başqa vəzifəsi yoxdur. Bundan kənara çıxmaq, hədislərin həqiqi mahiyyətini başqa üsullarla aramağa cəhd etmək deməkdir.

Sünnəni müdafiə etməkdə məqsəd vacib dini məsələlərin qısa şərhini verməklə imanın əsasları barədə yetərli səviyyəyə çatmaqdır. Onun hansı səviyyədə olmasını biz «Dinin təməlləri kitabı»nda göstərmişik.

Kəlamda orta hədd – yüz səhifəlik bir kitab qədər kəlam biliyinə yiyələnmək deməkdir. Biz bu barədə «Dini etiqadda mötədillik» adlı kitabda bəhs etmişik. Bunlar ziyalı yeniliklərin tərəfdarları ilə mübahisə etmək və onların gətirdiyi yeniliklərə qarşı durmaqda gərəklidir. Belə ki, həmin yenilikləri puça çıxarmaq onları sadə möminlərin qəlbindən uzaq tutur. Amma bu, sadə möminlərin fanatizmə qapılmasından sonra xeyir gətirməz. Zərərli yeniliklərin tərəfdarları – bidətçilərə gəlincə, cədəl (mübahisə sənəti, karuistika) sənətindən az-çox bilik əldə etdikdən sonra dinin əsasları barədə heç bir söhbət onları islah etməyə kömək etməz. Sən onu dəlillərdə susdursan belə, o, öz məsləkindən əl çəkməyəcək və bunu yalnız özünün yaxşı mübahisə edə bilməməsinə bağlayacaq. Düşünəcək ki, sənin dəlillərinə qarşı tutarlı cavablar vardır, lakin sən mübahisədə onu dolaşdırdığından cavab verə bilmir.

Sadə möminlərdən mübahisə (cədəl) sənətinə aludə olub həqiqətdən uzaq düşən varsa, hələki bu yöndə fanatizmə qapılmayıblar. Onları bu yolla – tutarlı dəlillərlə haqqa qaytarmaq mümkündür. Sadə möminlər əgər fanatizmə qapılsalar, onda onların haqq yoluna qayıtmasına ümid yoxdur. Çünki fanatizm qərəzli alimlərin törətdiyi ziyanlı etiqadların qəlblərdə möhkəmlənməsinə səbəb olur. Onlar haqqa sədaqət yolunda ifrata varanlar və öz rəqiblərinə xor baxıb nifrət edənlərdir. Buna görə də rəqibləri də onlara eyni münasibət bəsləməyə haqq qazanar və birləşib onlara qarşı çıxarlar. Hətta birincilər yalana qarşı güclü dəlillər gətirsələr,

ikincilər həmin yalandan yapışmaq istəyəcəkdir. Əgər birincilər onlarla mülayim, rəhmli davransalar, onlara nifrətlə camaat arasında deyil, təklikdə məsləhətlər versələr, öz amallarına çatmaqda çox şey əldə edərdilər. Lakin, hələ ki, yüksək mövqeyə yiyələnmək üçün əsas olan daha çox tərəfdar tapmaqdır. Bu məsələdə isə dözümsüzlük, nifrət, təhqiramiz mübahisələr kütlələr üçün daha cəzbedici olduğundan onlar da fanatik dini dözümsüzlüyü özlərinə adət və vasitə edərək buna islamın müdafiəsi adı vermişlər. Əsl həqiqətdə isə bu, insanların məvhi, bidətin qəlblərə yol almasıdır. O ki qaldı son dövrlərdə yaranmış fikir ayrılıqlarına və qondarma mülahizə və mübahisələrə, onlar bizim pak, mömin sələflərimizin vaxtında olmayıbdır və sən də bu mübahisələrə baş qoşma. Səni öldürəcək bir zəhərdən qaçdığın kimi, bu ixtilaflardan kənar dur. Bu, bir sağalmaz bəladır ki, bütün fakihləri bir-birinə düşmən etmiş, onları xudpəsəndlərə çevirmişdir. İrəlidə bundan törəyən təhlükə və onun ziyanları barədə sənə danışacağıq.

Bəlkə də, qulaq asanlardan bir çoxu bu sözlərlə razılaşmayıb deyəcəklər: «İnsanlar bilmədiklərinin düşmənidir». Lakin sən onlar kimi düşünmə, çünki bilən adamların qarşısında onlar susmağa məcburdurlar. Sən ömrünün uzun illərini bu məsələlərə sərf etmiş və bu sahədə əvvəlki alimlərdən daha çox kitab, tənqidi əsər və şərhlər yazmış adamın bu nəsihətlərini[71] qəbul et. Allah sonradan ona doğru yol göstərib, öz eyiblərini görmək üçün onun gözlərini açmışdır. Bu andan o, yanlış yolu buraxıb, özü ilə məşğul olmuşdur. «Fitva – şəriətin dirəyidir. Fitva isə yalnız dindəki ixtilafları və fikir ayrılıqlarını bildikdə verilə bilər», – deyən adamların bu sözləri səni çaşdırmasın. Hər hansı bir məzhəbin illət və dilləri bütün mübahisəli tərəfləri ilə birlikdə həmin məzhəblərə dair kitablarda verilmişdir. Lakin sələflərimiz və Məhəmməd Peyğəmbərin, Allahın ona xeyir-duası və salamı olsun, səhabələri, fitva elminin incəliklərini daha yaxşı bildikləri halda, bu cür ixtilaflara aid bilgi verməmişlər. Bunlar hər hansı məzhəb elminə heç bir fayda verməməkdən əlavə, fiqh elminin əsl mahiyyətini qavramağı da çətinləşdirir. Çünki müftilik fərasəti olan adam fiqh elminə yiyələndikdə cədəl sənətinin tələblərinə aludəçilik onun bütün işlərini yarımçıq qoyacaq. Axı cədəlin qayda-qanunlarına alışmış adamın ağlı onun istəklərinə tabe olur və fiqhi ciddi mənimsəməsinə maneə törədir. Əslində, ixtilaflara maraq göstərənlər məzhəblərinin həqiqiliyini sübut etmək bəhanəsilə şöhrət və yüksək

[71] Müsəlmanlar arasında nifaq yaradan dini mübahisələrdən çəkinməyin vacibliyini

mövqe qazanmağa can atanlardır. Şeytandan və ona bənzəyən adamlardan özünü qoru. Çünki onlar şeytanın insanları azdırmaq işini öz öhdələrinə götürərək, onu bu zəhmətdən azad etmişlər.

Bir sözlə, ağıllıların bəyəndiyi şey odur ki, sən özünü dünyada Allahla tək-tənha qalmış kimi hiss edəsən. Və özünün ölümünü, Haqq Məhkəməsini, əməllərinə görə verəcəyin hesabatı, Cənnət və Cəhənnəmi gözlərinin önünə gətirəsən. Sənə nəyin kömək edəcəyi, qarşındakı və digər bu kimi şeyləri düşün. Salamat ol!

Şeyxlərdən biri yuxusunda məşhur (vəfat etmiş) alimlərdən birini görür və ondan soruşur: «Mücadilə etdiyin və mübahisələr açdığın elmlərin sənə faydası nə oldu?». Alım əlini açaraq, ovcuna üfləyib deyir: «Onlar hamısı toz kimi yox oldular. Mənə yalnız gecələr səmimi qəlbdən qıldığım iki rükət namazın faydası oldu».

Hədisdə deyilir: «Əvvəlcə hidayət yolunda olub, sonra yolun azmış insanlar yalnız cədələ uyanlardır».[72]

(Allah) Məhəmməd Peyğəmbərə buyurub: *«Onlar bunu sənə yalnız mübahisə etmək xatirinə dedilər. Şübhəsiz onlar höcətləşən bir qövmdürlər!» (Quran, 43: 58).*

Digər hədisdə Allah-təalanın *«Ürəklərində əyrilik (şəkk-şübhə) olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşahib ayələrə uyarlar» (Quran, 3:7)* kəlamı ilə əlaqədar deyilir: «Allah burada mübahisə salanları nəzərdə tutub və daha buyurub: *«Onların nəfslərinin istədiyinə uyma. Allahın sənə nazil etdiyinin bir qismindən səni tovlayıb yayındıra biləcəklərindən ehtiyat edib, özünü onlardan gözlə» (Quran, 5: 49).*[73] Pak möminlərin biri demişdir: «Dünyanın sonunda elə adamlar peyda olacaq ki, onların qarşısında yaxşı əməl qapıları bağlanıb, höcət qapıları açılacaq». Bir hədisdə deyilir: «Bir zaman gələcək ki, xeyir əməllər yoxa çıxacaq, ixtilafda olan insanlar peyda olacaqlar».[74] Hədisdə buyurulub: «Allahın ən çox bəyənmədiyi insanlar mübahisəyə ən çox meyl edənlərdir».[75] Başqa hədisdə isə deyilir: «Məntiqi biliklər və cədəl verilmiş insanlar mütləq xeyir əməllərdən uzaq düşürlər».[76]

Daha doğrusunu Allah bilir!

---

[72] Ət-Tirmizi. İbn Məcih; Əbu Ümandan, səhih
[73] Əl-Buxari, Müslim; Aişədən
[74] Əl-Hafiz əl-İraqi bu hədisin mənbəyini göstərmir.
[75] Əl-Buxari, Müslim; Aişədən, məşhur (məşhur hədis- üç və daha artıq mənbədə təsdiqləndir)
[76] Əl-Hafiz əl İraqi bu hədisin mənbəyini göstərmir

VII Fəsil

# AĞIL, ONUN ŞƏRƏFİ, MAHİYYƏTİ VƏ HİSSƏLƏRİ HAQQINDA

Bil ki, bunların şərhində isbatı üçün elə də çoxlu sübut və dəlillərə ehtiyac yoxdur. Ələlxüsus da elmin şərafətinin ağlın şərafətindən daha əvvəl bilindiyi halda özünü çətinliyə salmağa ehtiyac qalmır. Çünki, elm ağıldan törəyər. Ağıl elmin əsası və təməlidir. Elm ilə ağıl arasında münasibət meyvə ilə ağac, günəş ilə işıq, göz ilə görmək arasındakı münasibət kimidir.

Dünya və axirətdə səadətin vasitəsi olan ağıl necə şərəfli olmaya bilər? Və ya ona necə şübhə edilə bilər? Heyvanlar belə ətrafdakıları fərqləndirməkdə məhdud qabiliyyətə sahib olmalarına baxmayaraq, ağılla davranmağa meyl edirlər. Ən böyük, ən vəhşi və ən güclü heyvan belə, insan görəndə sanki ondan çəkinər, insanın özündən qüdrətli olduğunu fərq etdiyi üçün qorxu hiss edər. Çünki ona qismən təsəvvür etmək bacarığı verilmişdir.

Buna görə Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurmuşdur:

«Qövminin şeyxi[77] olan bir kimsə ümmətinin içində peyğəmbər kimidir».

Bu qiymət həmin insana sərvətinin çoxluğuna, bədəninin böyüklüyünə və yaxud gücünün artıqlığına görə verilməmişdir. Bu qiymət ona ağlının meyvəsi olan təcrübəsinin çoxluğuna görə verilmişdir. Buna görə də böyüklərə – şeyxlərə hörmət saxlayırlar. Dinin bir çox amansız və qatı düşmənləri Allahın peyğəmbərini böyük ağıl sahibi olduğuna görə öldürməyə cəhd etmişlər. Lakin gözləri peyğəmbəri görər-görməz, ona rəğbətləri yaranmış, peyğəmbərlik nuru nə qədər qəlbin dərinliyində gizlənsə də, onlar Rəsulun üzündə nübüvvət nurunu görmüşlər.

Ağılın şərafəti bilinməsi zəruri olan şeylərdəndir. Biz burada yalnız Məhəmməd Peyğəmbərin, onun yoldaşlarının söylədiklərində (əxbar) və Quran ayələrində ağılın şərafətinə dair deyilənləri misal çəkmək istəyirik. Böyük Allah Öz Kəlamında ağılı nur adlandırıb: *«Allah göylərin və yerin nurudur. Onun nuru içində çıraq olan bir taxçaya bənzər» (Quran, 24:35).*

---

[77] Ağıllı, həyat təcrübəsi olan hörmətli adam nəzərdə tutulur.

Və yenə O, ağılın qazandığı biliyi ruh, vəhy və həyat adlandırır: *«Sənə də beləcə əmrimizdən olan bir vəhy göndərdik» (Quran, 42:52).* Və *«Heç ölü olub (sonra) diriltdiyimiz, ona insanlar arasında gəzmək üçün bir nur (iman) verdiyimiz kimsə, zülmət içində qalıb, oradan çıxa bilməyən kimsə kimi ola bilərmi?» (Quran, 6:122).*

O, işıq və zülməti xatırlarkən biliyi və nadanlığı nəzərdə tutur. Belə ki, başqa ayəsində buyurur: *«Onları Öz izni ilə zülmətdən nura çıxarar» (Quran, 5:16).*

Allahın Rəsulu, ona Tanrının xeyir-duası və salamı olsun, buyurub: «Ey insanlar, Rəbbinizi tanıyın və anlayın. Bir-birinizə ağıllı tövsiyələr verin. Onda sizə nəyin əmr olunduğunu, nəyin isə yasaqlandığını ağılın gücü ilə bilmiş olarsınız. Bilin ki, Rəbbinizin qarşısında sizi qurtaracaq olan ağlınızdır. Bilin ki, ağıllı insan Allaha itaət edən insandır. Bu insan görünüşcə kifir, əhəmiyyətsiz və mövqecə aşağı olsa belə... Və yenə bilin ki, nadan insan Allaha asi insandır. Baxmayaraq ki, onun görünüşü gözəl, xalq arasında qədir-qiyməti böyük, mövqeyi yüksək, geyimi gözəl, danışığı bəlağətli olsa da belə... Allah yanında meymunlar və donuzlar Allaha üsyan edənlərdən daha ağıllıdır. Dünya nemətlərinə aludə insanların sizə tərif söyləməsinə aldanmayın. Çünki (axirətdə) zərərə düşən dünya nemətlərinə aludə olanlar olacaq».[78]

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, deyib: «Allahın yaratdığı şeylərdən ilkini ağıldır. Ağılı yaratdıqdan sonra Allah-təala ona: «Gəl!», – dedi və o, yaxınlaşdı. «Dön!», – dedi, o da arxasını çevirdi. Sonra Qadir və Böyük Allah buyurdu: «İzzət və cəlalıma and olsun ki, Özümə səndən də qiymətli heç nə yaratmadım. Sənin vasitənlə Mən istəyirəm və sənin vasitənlə də bəxş edirəm; sənin vasitənlə Mən mükafatlandırıram və sənin vasitənlə də cəzalandırıram».[79]

Əgər desən ki, ağıl aksidensiya (ərad)[80] isə, o, əradı bəlli edən cisimlər yaranmazdan əvvəl necə yaradılmışdır? Əgər o, mahiyyət (cövhər) isə, zatı ilə qaim olan cövhər necə olur ki, başqa

---

[78] Davud ibn əl-Məhbər; Əbu Hüreyrədən. Həmçinin əl-Haris ibn Əbu Usama da Davud ibn əl-Məhbərdən nəql edir.

[79] Ət-Təbərani; Əbu Umamdan; zəif. Əbu Naim; Aişədən; zəif

[80] Ərad – aksidensiya. Mütəkəllimlərə görə cismin (rəng, dad, qoxu, isti, soyuq, nəmlik, qaranlıq və s. kimi), ölçünün (uzunluq, en, dərinlik kimi), fiqurun, insan fəaliyyətinin, «vəziyyətinin» və sairin bütün məkan-zaman, kəmiyyət-keyfiyyət müəyyənliklərini bildirir (Bax: Abu alğ-Xasan alğ Aşari. Odobrenie zanətiə kalamom. V. kn. Srednevekovaə arabskaə filosofiə. M., 1998, s.377)

məkanı tutmur? Onda bil ki, bu mövzu gizli biliklərə (ilm əl-mükaşəfa) aiddir və onu davranış elmləri (ilm əl-muamələ) ilə qavramaq uyğun olmaz. Bizim isə bu anda məqsədimiz muamələ elmlərinə nəzər yetirməkdir.

Hədisdə deyilir: «Bir neçə adam Rəsulallahın yanında bir nəfəri tərifləyib, mübaliğə ediləcək səviyyəyə qaldırdılar. Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, soruşdu: «Tərifədiyiniz adamın ağlı necədir?». Onlar dedilər: «Biz o adamın ibadətindən, göstərdiyi xeyir əməllərdən danışırıq. Siz isə onun ağlını soruşursunuz». Allahın Rəsulu, ona Tanrının xeyir-duası və salamı olsun, buyurdu: «Axmaq adamın nadanlığından işlədiyi günah, fasiqin etdiyi günahdan qat-qat artıqdır. Allahın bəndələri Allah-təalaya ağıllarının miqdarına uyğun yaxın olacaqdır».

Ömər ibn əl-Xəttab, Allah ondan razı olsun, deyibdir: «Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «Heç bir kimsə ağıldan böyük fəzilətə sahib olmamışdır. Ağıl sahibini hidayət yoluna çıxarar və fəlakətdən qurtarar. İnsanın ağlı kamil olmasa, imanı və dini də mükəmməl olmaz».[81]

Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, buyurub: «Gözəl əxlaqı sayəsində gününü oruc, gecəsini ibadətdə keçirən insanın əqli kamil olmadıqca, gözəl əxlaqı da kamil olmaz. Ağlı kamil olanda imanı da kamil olar, o, iman sayəsində tamamən Rəbbinə tapınar və öz düşməni iblisə (şeytana) üsyan edər».[82]

Əbu Səid əl-Hədri, Allah ondan razı olsun, bu hədisi rəvayət edib: «Allahın Peyğəmbəri, Allahın ona xeyir-duası və salamı olsun, buyurmuşdur: *«Hər şeyin bir özülü, dirəyi vardır; mömininin dirəyi onun ağlıdır. İnsanın ibadəti onun ağlının nisbətində olur. Məgər siz Cəhənnəm oduna bələnmiş fasiqlərin bu qışqırtılarını eşitmədinizmi? Əgər biz dinləsəydik və ağıl alsaydıq, indi ataşə atılmışlar arasında olmazdıq» (Quran; 67:10).*

Rəvayət edilir ki, Ömər ibn əl-Xəttab, Allah ondan razı olsun, Təmim əd-Daridən soruşur:

- Sizdə əsas olan nədir?

Təmim cavab verir:

- Ağıldır.

---

[81] İbn əl-Məhbər, ondan da əl-Haris ibn Əbu-Usama.

[82] İbn Məhbər; Əmra ibn Şuaybdan. Şuayba bu hədisi atası, ona da valideyni danışıb. Qısa şəklini («onun əxlaqı da kamil olmaz» sözləri yoxdur) ət-Tirmizi Aişəyə istinadən verib.

Ömər deyir:

- Sən doğru söylədin. Çünki mən səndən soruşduğumu Allahın Rəsulundan da soruşmuşdum və o da sənin verdiyin cavabın eynisini buyurmuşdu. Peyğəmbər bu cavabı verdikdən sonra söyləmişdi: «Mən də Cəbraildən nəyi əsas tutduğunu soruşdum, «ağılı»- deyə, cavab verdi».[83]

Əl-Bərai ibn Azibdən, Allah ondan razı olsun, nəql edilən hədisdə deyilir: «Bir gün Allahın Rəsulundan, Allahın ona xeyirduası və salamı olsun, çox sual soruldüğunda o, belə buyurdu: «Ey insanlar, hər mövcudatın bir vasitəsi vardır. İnsanın vasitəsi onun ağlıdır. Dinin sübut və dəlillərini yaxşı bilənlər içərisində əqlən ən üstün olanlardır».[84]

Başqa bir hədisdə deyilir: «Allahın Elçisi, ona Tanrının xeyir-duası və salamı olsun, Uhud müharibəsindən (Mədinəyə) dönəndə eşitdi ki, bəziləri belə deyirlər: «Filan adam filan adamdan daha cəsurdur, filan adam elə cani-dildən döyüşdü və elə rəşadət göstərdi ki, heç kim belə bir şey eşitməmişdi» və s.

Bundan Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, hiddətlənərək dedi: «Bu məsələdə hökm vermək sizlik deyil, bunu siz bilməzsiniz». Onlar dedilər: «Necə biz bilə bilmərik ki, ya Rəsulallah?». O, Allahın ona xeyir-duası və salamı olsun buyurdu: «Uhud döyüşündə iştirak edənlərin hər biri Allahın ona verdiyi ağıl səviyyəsində müharibə etdi. Məqsədləri və qalibiyyətləri ağıllarının miqdarına və şərafətinə görədir. Ölənlər müxtəlif dərəcəli yaralar almışlar. Qiyamət günü gəldiyi zaman dərəcələri, niyyətləri və ağıllarının nisbətində Onun yanında yer alacaqlar».[85]

Bərai ibn Azib, Rəsulallahın bu buyuruğunu rəvayət edir: «Mələklər ağıl sayəsində çalışıb Allahın itaətində səy göstərirlər. Adəm övladlarından imanlı olan kimsələr də ağılları miqdarında (Ona itaətdə) səy göstərirlər. Onların içərisində Böyük və Qüdrətli Allaha ən ciddi-cəhdlə ibadət edənlər ən dərin ağıla sahib olanlardır».[86]

Aişədən, Allah ondan razı olsun, söylənən hədisdə isə deyilir: «Mən soruşdum: «Ey Allahın Rəsulu, dünyada insanlar nə ilə

---

[83] İbn əl-Məhbər, ondan da əl-Haris ibn Əbu Usama

[84] İbn əl-Məhbər, ondan da əl-Haris ibn Əbu Usama

[85] İbn əl-Məhbər; Əbu Hüreyrədən

[86] İbn əl-Məhbər, ondan da əl-Haris ibn Əbu Usama. Həmçinin əl-Baqvinin «Mücam əssəhabə» əsərində peyğəmbərin səhabəsi İbn Azibin dilindən Əl-Bəraidən, Məhbərin də göstərdiyi yerə istinadən verilib.

bir-birlərindən üstün ola bilərlər?». O cavab verdi: «Ağılları ilə». Davam edərkən soruşdum: «Bəs o biri dünyada?». Rəsulallah buyurdu: «Yenə ağıl ilə». Mən (təəccüblə) dedim: «Məgər axirətdə hər kəsə öz əməlinə görə mükafat verilmirmi?». Allahın Rəsulu dedi: «Ey Aişə! Məgər insanlar Allahın onlara verdiyi ağıldan artıq əməl sahibi ola bilərlər? Hər kəsə nə qədər ağıl verilmişsə, onun nisbətində də xeyirli əməlləri olur və bu xeyirli əməlləri nisbətində də mükafat alır».[87]

İbn Abbasdan, Allah ondan razı olsun, belə rəvayət edilir: «Allahın Rəsulu, Allahın ona xeyir-duası və salamı olsun, buyurmuşdur: «Hər şeyin öz alətləri və vasitələri vardır. Mömінin aləti onun ağlıdır. Hər adamın bir minəcək heyvanı vardır, əsl kişinin miniyi – onun ağlıdır. Hər şeyin dirəyi vardır, dinin dirəyi ağıldır. Hər insanın bir hədəfi vardır, abidlərin hədəfi isə ağıldır. Hər qövmin bir dəvətçisi vardır, ibadət edənlərin dəvətçisi isə ağıldır. Hər tüccarın bir sərmayəsi vardır, Allah yolunda çalışanların sərmayəsi isə ağıldır. Hər xanənin bir idarəçisi vardır, doğru olanların xanələrinin rəisi isə ağıldır. Hər xaraba qalan yerin təmiri vardır, axirətdə həyatın təmiri isə ağıldır. Hər kişinin bir züryəti vardır ki, ona aid edilir və o da nəsli ilə yaddaşda yaşayır. Lakin düzgün insanlara aid edilən və onların yad edilmələrinə vasitə olan ağıllarıdır. Hər səyahətdə çadıra ehtiyac vardır, mömінin çadırı isə onun ağlıdır».[88]

Peyğəmbər, ona Allahın xeyir-duası və salamı olsun, başqa bir hədisdə buyurub: «Allah yanında möminlərin ən sevimlisi Allaha itaətdə möhkəm, qullarına nəsihət edən, əqilcə kamil, nəfsini boğan, təhlükəni görüb, həyatı müddətincə bu təhlükədən qurtarmaq üçün yaxşılıqlar edən bir kimsədir. Belə insan bu dünyada ağılın buyurduğuna uyğun davranar və həm də (axirətdə) zəfəri əldə etmiş olar».[89]

Yenə Allahın Rəsulu, ona Tanrının xeyir-duası və salamı olsun, buyurub: «Sizin içərinizdə ağıldan ən yetkin olan Allahdan ən çox qorxandır. Allahın buyurduqlarını ən yaxşı yerinə yetirən və Allahın qadağan etdiklərindən ən çox çəkinən də, əməlləri az olsa belə, ağlı yetkin olandır».[90]

---

[87] İbn əl-Məhbər, ət-Tirmizi əl-Hakim; Aişədən
[88] İbn əl-Məhbər, ondan əl-Haris ibn Əbu-Usamal; İbn Abbasdan
[89] İbn əl-Məhbər; Əbu Kətadədən
[90] Yenə oradan

**Ağlın mahiyyəti və hissələri haqqında izahat**

Bil ki, ağılın tərifi və onun mahiyyətinin izahında insanların fikirləri fərqlidir. «Ağıl» kəlməsinin müxtəlif mənalarından xəbərsiz olan bir çoxları bu səbəbdən fikir ayrılığına səbəb olmuşlar. Bu xüsusda tədqiqat predmeti üzərindən pərdəni qaldıran və ixtilafların qarşısını alan hökm budur ki, «ağıl» dörd mənada işlədilən bir anlayışdır. «Ayn»[91] kəlməsinin bir neçə mənası olduğu kimi... Burada kəlmənin bütün mənalarını əhatə edən bir tərif verilməsi uyğun görünmür. Əksinə, hər mənanın ayrı-ayrı təriflərini verib, onun mahiyyətini öyrənmək gərəkdir.

**Birinci hissə**. Ağıl insanı heyvanlardan fərqləndirən bir keyfiyyətdir ki, bunun sayəsində düşüncə məhsulu (nəzəri) elmlər və gizli, təfəkkür məhsulu olan sənətlərin dərki hazır bir vəziyyətə gəlir. Əl-Haris ibn Əsəd Əl-Mühasibi özünün «Ər-Riayə» kitabında əqlin tərifini verərkən məhz bunu nəzərdə tutmuşdur: «Həqiqətən, ağıl insanın fitrətindədir. Onun vasitəsilə əqli biliklərə yiyələnmək mümkün olur. Sanki ağıl qəlbə düşən bir nurdur ki, bu qəlbin sahibi o nur vasitəsilə şeylərin mahiyyətini dərk etməyə hazır olur».

Bunu qəbul etməyib, ağılı yalnız zəruri elmlərə (apodiktik) aid edənlər yanılırlar. Çünki elmlərdən xəbərsiz olan və ya yatmış kimsə də fitrətən ağıla sahib olduğuna görə ağıllı sayılır. Həyat insan bədənini sərbəst hərəkətlər və hisslərlə təmin edən fitri keyfiyyət olduğu kimi, ağılın köməyi ilə bəzi canlıların da əqli biliklərə yiyələnməsi mümkün olur. Əgər fitri bacarıq və hissi qavrama baxımından insanla ulaq arasında bərabərlik işarəsi qoysaq və desək ki, Allah-təala öz qanunu və öz yaradıcı gücü ilə ulaq və ya başqa heyvanlara deyil, yalnız insana ağıl bəxş etmişdir, onda eşşəklə cansız əşyanı, mineralı müqayisə edib demək olar ki, Qadir və Böyük Allah heyvana da hərəkət etmə bacarığı vermişdir.

Həqiqətən, əgər ulaq cansız minerallа müqayisə edilsə, o zaman deyə bilərik ki, bizim onda müşahidə etdiyimiz hər bir hərəkəti Allah, Ona həmd olsun, əyani ardıcıllıqla yaratmağa qadirdir.

Ulaqla mineralın hərəkət fərqi yalnız fitri xüsusiyyətdədir. Ulağı fərqləndirən bu xüsusiyyət həyat adlanır. Eyni ilə insanla heyvanın əqli anlayışlara sahib olma imkanında fərq fitri bacarıqdadır və ağıl adlanır. Ağıl başqa şeylərin şəkil və rənglərini özün-

---

[91] Ayn – I. 1) göz; 2) casus; 3) dəlik; 4) suyun qaynağı; 5) kupe; 6) zoğ, saplaq, 7) əşya, predmet; 8) pulun olması; 9) məxluq, mahiyyət; 10) seçmə, ən yaxşı. II. Eynən olan.

də əks etməklə, hər birini digər cisimlərdən fərqli xüsusiyyətlərinə görə ayıran cilalanmış güzgü kimidir. Necə ki, göz görə bilmək keyfiyyəti sayəsində özünəməxsus keyfiyyətləri və formasına görə alından fərqlənir.

Fitri bacarığın əqlə və biliklərə münasibəti gözlə seyr etmənin, görüntünün münasibəti kimidir.Quran və şəriətin elmə yiyələnmə imkanı verən bu fitri bacarığa münasibəti isə günəş nurunun gözə münasibəti kimidir. Bu fitrəti beləcə anlamaq da gərəkdir.

**İkinci hissə.** Ağıl artıq nəyin mümkün, nəyin isə qeyri-mümkün olduğunu ayırd edə bilən uşağın zatında meydana çıxan elmdir. Məsələn, ikinin birdən çox olduğunu və ya bir adamın eyni vaxtda iki yerdə ola bilməyəcəyini anlamaq kimi. Mütəkəllimlərdən biri ağıla tərif verərkən bunu nəzərdə tutaraq demişdir:«Ağıl zəruri (apodiktik) elmlərin bir qismidir. Mümkünlərin mümkün, mümkün olmayanların isə müəmma olduğunu bilmək kimi...» O, mahiyyət etibarilə haqlıdır. Çünki belə elmlər mövcuddur və bu elmlərə ağıl demək aydındır ki, doğrudur. Ancaq əqlin fitrətən olduğunu inkar etmək və bu elmlərdən başqa, heç nəyin olmadığını demək qeyri-əxlaqidir.

**Üçüncü hissə**. Həyatın durumunun və vəziyyətin dəyişməsi ilə əldə edilənlər, öyrənilənlər elmdir. Çünki həyat təcrübəsindən keçmiş və müxtəlif təlimlərdən tərbiyə almış birinə adətən «ağıllı» – deyirlər. Kim ki bu sifətlərdən məhrumdur, ona da «axmaq», «qafil», «cahil» deyilir. Bu da elmlərin başqa bir növüdür və bu növə «ağıl» adı verilir.

**Dördüncü hissə.** Fitri bacarıq, əqli qüvvə elə bir həddə çatır ki, insan ətraf aləmdə baş verənlərin sonunu dərk edir, özündə ötəri şəhvət hisslərini boğur. Həqiqətən də, belə gücə malik olub, keçici nəfsini boğmağa cəsarəti çatan, işin nə nəticə verəcəyinə görə hərəkət edən adam ağıllı adlanır. Bu, həm də insanı heyvandan fərqləndirən xüsusiyyətdir.

Beləliklə, ağılın birinci mənası (hissəsi) onun əsası, özülü və mənbəyidir. İkinci hissə birinci hissəyə ən yaxın olan budağıdır. Üçüncü hissə isə birinci və ikinci hissələrin budağıdır. Çünki fitri bacarıq və zəruri (apodiktik) biliklər təcrübi biliklərlə yekunlaşır. Dördüncü hissə isə ən yüksək qayə və ən son meyvədir. Bu halda birinci və ikinci hissə fitrətən olur, üçüncü və dördüncü hissələr isə çalışılaraq qazanılır. Həzrəti-Əli Əleyhissəlam buyurmuşdur:

Mən ağılı iki cür gördüm –
Biri təbii, digəri eşidilən ağıldır.
Təbii ağıl olmayınca,
Eşidilən ağıl fayda verməz.
Necə ki, göz görməzsə,
Günəş işığının faydası olmaz.

Birinci, təbii ağıl haqqında Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, bu sözü nəzərdə tutulur: «Allah ağıldan daha üstün və şərəfli bir xilqət yaratmamışdır».[92]

Sonradan qazanılmış ağıl haqqında Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, digər hədisində buyurulmuşdur: «İnsanlar (Allaha) düzgünlük və saleh əməllərə yaxınlaşmaq istədikləri zaman, sən də Ona ağlınla yaxınlaş».[93]

Allahın Rəsulu, ona Allahın xeyir-duası və salamı olsun, Əbu əd-Dərdaya müraciətlə dediyi sözlərdə bunu nəzərdə tuturdu:

«Ey Əbu Dərda! Əqlən inkişaf et ki, Rəbbinə də yaxınlaşmaqda inkişaf edəsən.

Əbu-Dərda cavab verir:

- Atam-anam sənə fəda olsun! Mən buna necə nail olum?

Allahın Rəsulu buyurur:

- Allah-təalanın qadağan etdiyindən çəkin, Onun əmrlərinə əməl et, onda əqlin artar. Əməlisaleh ol və onda həm bu fani dünyada şanın yüksələr, şərəfin artar, həm də axirətdə bu etdiklərinə görə Allah yanında şərəfin artar və səadət taparsan».[94]

Səid ibn əl-Müseyyibin dilindən bir hədisdə deyilir: «Ömər ibn əl-Xəttab, Əbu ibn Kaab və Əbu Hüreyrə, Allah hamısından razı olsun, Allahın Rəsulunun, ona Allahın xeyir-duası və salamı olsun, yanına gəlib soruşurlar:

- Ey Allahın Rəsulu, insanların ən bilikli olanı kimdir?

O cavab verir:

- Ağıllı olan.

Onlar soruşurlar:

---

92 Ət-Tirmizi; əl-Həsən əl-Bəsridən

93 Əbu Naim; Əli ibn Əbu Talibə zəif istinad: «İnsanlar müxtəlif saleh əməl sahibi olurlar ki, bizim Allah-təalaya yaxınlaşsınlar, sən də özündə əqlin çeşidlərini artır və insanları mələklər cərgəsinə və Allah yanında uca yerə qaldır».

94 İbn əl-Məhbər, ət-Tirmizi; Əbu-Dərdadan. Həmçinin əl-Haris ibn Əbu Usamaya istinad edilir.

- İnsanların ən mömini kimdir?
Peyğəmbər cavab verir:
- Ağıllı olan.
Onlar yenə soruşurlar:
- Bəs insanların ən fəzilətlisi kimdir?
Rəsulallah cavab verir:
- Ağıllı olan.
Onlar yenə deyirlər:
- Məgər alicənab, mürüvvətli, gözəl bəlağətli, əliaçıq və yüksək mövqeyi olan ağıllı deyilmi?

Rəsulallah əleyhissəlam onda «Quran»ın bu ayəsini misal gətirir: *«Bunlar hamısı yalnız dünya həyatının keçici mənfəətləridir. Axirət isə Allah qatında təqva sahibləri üçündür» (Quran, 43:35).*[95]

Həqiqətən, ağıllı adam bu dünyada ehtiyac içində və zəlil yaşasa belə, Allahdan qorxar. Digər bir hədisdə isə deyilir ki, Peyğəmbər, Allahın ona xeyir-duası və salamı olsun, buyurub: «Ancaq ağıllı insan Allaha iman gətirər və Onun peyğəmbərlərini təsdiq edib, Onun buyurduqlarına itaət edər».[96]

Görünür, «ağıl» kəlməsinin kökü dildə olduğu kimi bu fitri bacarığı ifadə edən sözün mahiyyətinin adıdır. Zəruri biliklərə ona görə elm adı verilir ki, onlar ağılın məhsuludurlar. Necə ki, bir şeyə onun səmərəsinə görə ad verilir. Buna görə deyilir:

«Elm – qorxudur, alim – isə Allahdan qorxan; Allah qorxusu – elmin bəhrəsidir».

Bu halda «ağıl» kəlməsi fitri mənadan əlavə, ağılın digər hissələrini şərti olaraq ifadə edir. Lakin bizim bu kitabda qayəmiz sözlərin mənasını öyrənmək deyil. Bizim məqsədimiz sözü gedən bu dörd mənanın (hissənin) mövcudluğunu bilmək və «ağılın» bütün bunlara şamil olduğunu göstərməkdir. Birinci hissə istisna olmaqla, digər hissələrin varlığında heç bir ixtilaf yoxdur. Fitri bacarığın varlığı həqiqətdir və bu, digər üç hissə üçün yalnız əsas və təməldir.

«Ağıl» adı verilən bu elmlər sanki fitri olaraq ağıl cövhərində mövcuddur. Onların varlıq aləminə çıxarılmasına səbəb olan vasitə, mövcud olduğu zaman ancaq vücud dünyasında görünür

---

95 İbn əl-Məhbər
96 İbn əl-Məhbər; Səid ibn əl-Müsəyyibdən; natamam (mürsil)

Sanki bu elmlər kənardan ağılın üzərinə varid olmuş hər hansı bir şey deyillər. Sanki bu elmlər ağılın içində gizlənmişlər və nəhayətdə aşkara çıxmışlar. Bunun bənzəri, məsələn, torpaq altında gizli olan su kimidir. Su yalnız quyular qazılıb toplanandan sonra hisslər sayəsində müəyyən olunur. Badam meyvəsinin yağı və ya qızılgülün ləçəklərindəki gülab suyu da bunun kimidir. Allah-təala buyurmuşdur:

*«Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən nəsillərini çıxarıb, onları özlərinə şahid tutaraq:*[97] *«Mən sizin Rəbbiniz deyiləmmi?» – soruşmuş, onlar da: «Bəli, Rəbbimizsən»,- deyə cavab vermişdilər...» (Quran, 7:172).*

Bu ayədə şahidlik deyilirkən sözlə təsdiq deyil, məhz ruhların etirafı nəzərdə tutulur. Çünki insanlar sözlə ifadə etməyi şəxs kimi yarandıqdan və dil var olduqdan sonra bacarmışlar. Kimisi Allah-təalanı iqrar etmiş, kimisi də inkar etmişdir. Buna görə Böyük Allah buyurub: *«Onlara «göyləri və yeri kim yaratdı?» - deyə sorsanız, əlbəttə ki, onlar: «Allah»,- deyə cavab verəcəklər» (Quran, 43:87).* Bu ayənin mənası budur ki, əgər baş verənlərə diqqət yetirsək onda görəcəyik ki, onların ruhları, iç aləmləri şəhadət etməkdədir.

*«(Ey Rəsulum), həqiqi müsəlman olaraq özünü dinə doğru yönəlt. Allahın dininə ki, insanları onun üzərinə yaratmışdır. Hər kəs Haqq dini qəbul edə biləcək yaradılmışdır» (Quran, 30:30).* Yəni hər bir insan Allaha iman edə biləcək şəkildə yaradılmışdır. Həm də şeyləri olduğu kimi dərk etmək (maarifa) bacarığı vardır. Mərifət isə Allahın vəhdətini dərk etməyə ən yaxşı qabiliyyətdir.

Sonra, əgər ki, Allaha inam fitri olaraq ruhda mərkəzləşmişdir, insanlar iki qismə ayrıla bilər: imandan üz çevirən, onu unudan kafirlər və düşüncə işığında onu xatırlayan möminlər.

Belə bir mömin hər hansı bir məsələdə şahidlik etdiyi halda, qəflətən o, şahidliyi unutmuş, lakin çox düşünməklə onu xatırlaya bilmiş bir adam kimidir. Bunun üçün Allah-təala buyurmuşdur: *«Bəlkə düşünüb xatırlasınlar!» (Quran, 14:25, 28:43, 28:51, 39:27, 44:58)*, *«(Bu Quran) sizə nazil etdiyimiz (elə) mübarək bir kitabdır ki, insanlar onun ayələrini düşünüb dərk etsinlər və ağıl sahibləri ondan ibrət alsınlar» (Quran, 38:29), «Allahın sizə olan*

---

[97] Qurana görə, Allah Adəmi yaratmazdan əvvəl, insan ruhlarını yığaraq Onun Vahid Allah olmasına şəhadət almışdır.

*nemətini və «eşitdik və ibadət etdik» dediyiniz zaman sizinlə bağladığı əhdi unutmayın» (Quran, 5:7) və «Biz Quranı ibrət almaq (başa düşmək) üçün belə asanlaşdırdıq, ancaq heç bir ibrət alan varmı?» (Quran, 54:17), 54:22, 54:32, 54:40).*

Fitri yaddaşa xatırlama demək tam məqbuldur. Xatirə, bir növ, iki qismə ayrılır. Biri əvvəl insanın qəlbində olan, lakin sonradan itmiş bir obrazı xatırlamaqdır. Digəri isə fitri olaraq qəlbində olan bir obrazı xatırlamaqdır.

Ağılın işığında (bəsirət) baxan bir kimsə üçün bu həqiqətlər aydın görünür. Lakin öyrənməkdən və əyan olmadan uzaq olub, başqalarının eşitdiyinə və təqlidə istinad edən adama bu həqiqətlər çətin gəlir. Bunun üçün də belə adamlar bu kimi Quran ayələrinin şərhində yanlışlıqlar edir, Adəm oğullarının ruhlarının iqrarını açmaqda çətinlik çəkirlər. Ona elə gəlir ki, Peyğəmbərin hədislərində, xəbərlərdə (əxbar) və Quran ayələrində müxtəlif bir-birinə zidd məsələlər vardır. Beləleri çox zaman bu fikrə düşdüyündən Quran ayələrinə və hədislərə hörmətsizliklə yanaşar, oradakı dəlilləri çox zəif və düşük hesab edər. Bu, bir evə girib, orada səliqə ilə qoyulmuş əşyalara toxunub yıxılan kor adamın məsəlinə oxşayır. Kor bu zaman deyir:

- Bu əşyalara nə olub? Məgər onları yoldan götürüb, yerlərinə qoymaq olmazmı?

O zaman kora deyirlər:

- Əslində bütün əşyalar öz yerindədir. Yerində olmayan ancaq sənin gözlərindir.

Bəsirətin qüsuru da bunun kimi zahiri gözlərin qüsurunu əvəz etmiş olsa, daha böyük fəlakətə yol açar. Çünki ruh minici, bədən isə minikdir, atlının korluğu isə atın korluğundan daha artıq zərər verər.

Bəsirətlə xaricdəki gözlə görmənin bənzəyişləri haqqında Allah-təala buyurmuşdur: *«Qəlb (Peyğəmbərin qəlbi) onun gördüyünü yalan saymadı» (Quran, 53:11). «Beləcə, İbrahimə göylərin və yerin mülkünü (səltənətini, oradakı qəribəlikləri və gözəllikləri, onların Allah qüdrəti ilə yaradılmasını) göstərdik ki, tam qənaətlə inananlardan olsun» (Quran, 6:75).* Bunun əksini O, korluq adlandırır. Belə ki, Allah-təala buyurur: *«Bu dünyada kor olanlar axirətdə də kor olar və (haqq) yoldan daha da çox azar» (Quran, 17:72).*

Gizli aləmin bir çox məsələlərini peyğəmbərlər gözlərilə, bir çoxlarını isə bəsirətləri ilə görmüşlər. Lakin hamısına «görmə» deyilmişdir. Bir sözlə, bəsirət nuru olmayan bir kimsənin qəlbində dinin yalnız qabıqları olar. O, dinin nüvəsini, həqiqətlərini, gizli mahiyyətini deyil, zahiri mərasimlərini sevər.

Beləliklə, «ağıl» kəlməsinə aid edilən qismlərin bunlar olduğunu bildik.

**İnsanların ağıl barəsində fikir ayrılıqlarının izahatı**

Ağıl mövzusunda alimlər müxtəlif görüşlərə sahibdirlər. Və onlar fikirlərini bilikləri az olanlara nəql etmək fikrindən uzaqdırlar. Ən yaxşısı birbaşa həqiqətin izahına keçməkdir. Ağılın dörd qismindən (hissəsindən) ikincisi istisna olmaqla, digərləri haqqında fərqli fikirlər irəli sürülmüşdür. Bu ikinci hissə mümkünün mümkün, qeyri-mümkünün isə mümkünsüzlüyünü öyrənən zəruri elmdir. Çünki ikinin birdən çox olduğunu bilən insan bir əşyanın eyni zamanda iki yerdə və bir şeyin həm əzəli, həm də sonradan yaranmış ola bilməyəcəyini də anlayır. Bunlar kimi şəksiz və şübhəsiz dərk edilən hər şeydə hökm belədir.

Ağılın digər üç qisminə gəlincə, onlar haqqında da müxtəlif və fərqli fikirlər irəli sürülmüşdür.

Güc yolu ilə şəhvətin boğulmasından ibarət dördüncü hissəyə gəldikdə, bu xüsusda insanların fərqli olduqlarını görməmək mümkün deyil. Bəlkə, eyni şəxsin müxtəlif durumları da bu xüsusda fərqli ola bilər. Bu fərq, bəzən şəhvətin fərqliliyindən irəli gəlir. Məsələn, ağıllı bir adam bəzi şəhvət hisslərini tərk etməyi bacardığı halda, digər qismindən əl çəkə bilmir. Hətta tərk etdiyi şəhvəti əməllərdən belə tam qorunmur. Məsələn, gənc bir insan bəzən gəncliyindən zinanı tərk etməyə aciz olur. Lakin yaşa dolduğu və ağlı kamilləşdiyi zaman bunu bacara bilir. Riya və ziyankarlıq kimi hissləri isə əksinə, yaş ötdükcə tərk etmək də çətinləşir. Bunun səbəbi bir çox hallarda bu şəhvani hisslərin təhlükəsi barədə biliklərə nə dərəcədə yiyələnməklə də bağlı olur. Buna görə də bəzən həkim zərərverici bir çox qidalardan nəfsini qoruya bildiyi halda, onunla eyni ağılda, lakin həkim olmayan başqası özünü mühafizə edə bilmir. Baxmayaraq ki, o da bəzi yeməklərin zərərli olduğuna, az da olsa, inanır. Lakin həkimin bilgisi çox olduğundan, qorxusu da o qədər çoxdur. Və sözsüz ki, qorxu ağılın əsgəri və nəfsini ram etməkdə ağılın əlində silahdır.

Beləcə, alim elminin gücü və günahlardan gələn zərəri daha yaxşı bildiyindən cahildən bu xüsusda (günahı tərk etməkdə) daha müqtədirdir. Biz burada bəzəkli qara cübbəli, höcətcil və fırıldaqçı alimləri deyil, əsl alimləri nəzərdə tuturuq.

Əgər insanlarda fərqlilik şəhvətdən gəlirsə, bu fərqi əqldən fərqliliklə eyniləşdirmək olmaz. Yox, əgər şəhvətin zərəri barədə biliklərdə fərq varsa, biz artıq bu biliyə ağıl demişik.

Bu bilik ağılın fitri imkanlarını gücləndirər. Bu zaman fərqlilik də «ağıl» kəlməsinin aid olduğu şeylər arasında olacaq. Fərqlilik bəzən ağıl cövhərinin çılpaq, təcrid olunmuş qalması ilə olur. Ağıl cövhəri qüvvətləndikcə, şəhvətlərin yox edilməsi də o nisbətdə sürətlənmiş olur.

Təcrübi elmlərdən olan dördüncü hissəyə gəlincə, insanların bununla bağlı fərqli görüşlərinin olması həqiqətdir və onu qəbul etməmək olmaz. Çünki insanlar baş verənlərə az-çox dərəcədə doğru qiymət verməkdə və onu dərk etmək sürətində fərqlənirlər. Bunun səbəbi ya onların fitri istedadında, ya da təcrübələrinin fərqli olmasındadır.

Ağıl cövhərində (fitrətən) ayrılıq və fərqin olduğunu inkar etmək mümkün deyildir. Çünki bu fərq qəlbə işıq salan günəş kimidir. Yetkinlik yaşına yaxınlaşdıqca onun nuru görünməyə başlar, sonra get-gedə artar və tam kamala dolduqda, təxminən qırx yaşında tam doğmuş olar. Bu, səhərin açılması kimidir. Çünki bu işıqlanma əvvəlcə zorla duyulur. Yavaş-yavaş artmağa başlayır və nəhayət, günəşin doğması ilə gerçəkləşmiş olur.

Bəsirət nurunun fərqliliyi zahirdəki göz nurunun fərqliliyi kimidir. Gözü pis görənlə yaxşı görən arasında fərq məlumdur. Allahın qanunu belədir ki, O, bütün məxluqatın varlığında tədricilik yolunu tutmuşdur. Hətta şəhvət belə həddi-buluğa yetən gəncdə qəflətən yaranmır və yaşlanmış adamda birdən yox olmur. Əksinə, yavaş-yavaş yaranır və tədricən də itir.

İnsandakı bütün bacarıq və keyfiyyət belədir. Və o adam ki, insanlarda ağılın fitrətindəki fərqi inkar edir, o, özü öz ağlından imtina etmiş olur.

Hər kim ki Məhəmməd Peyğəmbərin, ona Allahın xeyir-duası və salamı olsun, ağlını adi adamların və ya kobud bədəvilərin ağlı ilə bərabər tutsa, o, insanların ən rəzili və alçağıdır.

İnsanların fitri ağlı arasında fərqi necə inkar etmək olar? Əgər bu olmasaydı, onda insanlar yalnız nəsihətçilərin uzun-uzadı

öyüdlərindən sonra bir şey anlayan axmaqlara, kiçik işarədən və göstərişdən başa düşən ağıllılara və həqiqəti təhsil almadan öz zəkası ilə dərk edən kamil insanlara bölünməzdilər. Necə ki, Allahtəala buyurub: «Onun yağı - od toxunmasa belə - sanki işıq saçır. O, nur üstündə nurdur» (Quran, 24:35).

Peyğəmbərlər, onlara salam olsun, belələrindəndir. Çünki onlar öyüd və dərs almadan ilahi təqlid (ilham) yolu ilə qəlblərində bir çox gizli və sirli şeyləri dərk etmişlər. Allahın Rəsulu bu barədə buyurmuşdur: «Ruhul-Qüds (Cəbrail) mənim qəlbimə bunları buyurdu: «İstədiyin kimsəni sev, sonunda ondan ayrılacaqsan. İstədiyin qədər yaşa, sonunda öləcəksən. İstədiyin əməli et, sonunda qarşılığını alacaqsan».

Mələklərin peyğəmbərlərə bu şəkildə bilgi verməsi qulaqla dinləmək və gözlə görməkdən ibarət açıq vəhylərdən tamam fərqlidir. Ona görə də «qəlbinə ilham etmək» adlanır.

Vəhyin dərəcələri və növləri çoxdur. Onlar gizli elmlərdən (ilm əl-mükaşəfa) olduğundan onlar haqqında davranış elmlərinin (ilm əl-müamələ) köməyi ilə danışmaq olmaz. Vəhyin dərəcələrini bilməyi vəhy mərtəbəsinə qalxmaq kimi zənn etmə. Çünki həkimin xəstəyə səhhəti barədə məlumat verməsi və ya alimin fasiqə ədalət dərəcələrini öyrətməsi başqa şeydir. Səhhət dərəcələrini bilən xəstə və ədalət dərəcələrini bilən fasiq səhhət və ədalətdən uzaq ola da bilir. Bilmək ayrı şeydir, bilinənin varlığı ayrı bir şeydir. Peyğəmbərlik haqqında (nübüvvə) və övliyalıq haqqında (vilayə) bilən hər kəs peyğəmbər və ya övliya deyildir. Təqvanı və onun incəliklərini bilən hər kəs də müttəqi, Allahdan qorxan deyildir.

İnsanların özləri ayılıb dərk edənlərə, ancaq öyrənməklə və göstərilməklə bilənlərə və öyrətmə və göstərişlərlə belə heç bir biliyə yetməyənlərə bölünməsi ərazinin suya görə üç qismə ayrılması kimidir:

1) Suyun çox toplanmasından qüvvətlənib çeşmələr əmələ gələn ərazilər;
2) Suyunu üzə çıxarmaq üçün qazılmalı ərazilər;
3) Qazılmaqla da su çıxmayan quraq ərazilər.

Bunlar da fərqli torpaq növlərinin əmələ gəlməsinə səbəb olurlar.

Əqli cövhərinə görə insanlar arasındakı fərq də bunun kimidir. Ağılın fərqliliyinə dair söylənən hədislərdən birində deyilir:

«Bir dəfə Abdullah ibn Salam bu barədə Peyğəmbərə sual vermişdi, Ərşin böyüklüyü barədə soruşmuşdu. Peyğəmbər buyurmuşdur: «Mələklər Allahdan soruşdular: «Ya Rəbbimiz, Ərşdən də böyük bir şey yaratdınızmı?». Allah: «Bəli, ağılı yaratdım»,- deyə buyurmuşdur. Mələklər yenə soruşmuşlar: «Onun qiymətini, böyüklüyünü nə ilə ölçmək olar?». Allah-təala yenə buyurmuşdur: «Heç kim onun ölçüsünü bilməz. Ey mələklərim, sizdə qum dənələrinin sayını bilən bir elm varmı?». Mələklər demişlər: «Xeyr». Onda Böyük və Qüdrətli Allah buyurmuşdur: «Mən qum dənələri kimi çoxsaylı fərqli ağıllar yaratdım. İnsanlar arasında eləsi var ki, ona bir dənəcik, kimisinə üç-dörd, kimisinə firqlə,[98] kimisinə də bir (gəmi) yükü qədər, kiminə bundan da artıq verdim».[99]

Əgər sən soruşsan ki, niyə bəzi sufilər ağıl və idrakı (məql)[100] məzəmmət edirlər? Onda bil ki, bunun səbəbi ondadır ki, insanlar «ağıl» (əql) və «idrak» (məql) adlarını mübahisə edənlərin barışmazlığı, digərinə öz yanlışlarını etirafa məcbur etməsi ilə müşayiət olunan «mübahisə» və «sözgüləşdirmə» anlayışlarına gətiriblər və bütün bunlar kəlam sənətidir. Onlar özləri üçün etiraf etmək halında deyillər ki, «həqiqətən, biz ağılın müəyyən edilməsində səhv etmişik». Nə qədər ki, bu səhv təyinetmə onların qəlbindən silinə bilməyib, ağızdan-ağıza keçib və onların qəlbində möhkəmlənib. Beləcə onlar «ağılı» və «idrakı» rüsvay ediblər və bu rüsvayçılıq odur ki, onlar onu «ağıl» adlandırıblar. Gizli ağılın (bəsirə) işığına gəlincə isə, onun vasitəsilə uca Allah və onun elçilərinin doğruluğu etiraf olunur, onda bu məzəmməti necə təsəvvür etmək olar. Axı uca Allah ağılı Quranda tərifləyir?! Və əgər bu dünya məzəmmət olunursa, onda bundan sonra nə tərifləmək? Və əgər təriflənən İlahi Qanunlardırsa (şər), onda nəyin köməyi ilə şəriətin həqiqiliyi dərk olunur? Və əgər şəriət məzəmmət olunan ağıl vasitəsilə dərk olunursa – hansına ki, güman edilmir – onda axı İlahi Qanun da beləcə məzəmmətlənəcək. Ona diqqət verməyə dəyməz ki, kimsə deyir: «İlahi Qanun doğruluğun görülməsi ilə dərk olunur (əyn əl yəqin- idrakın ikinci mərhələsi, həqiqətin görünməsi, sufi anlamında dindarlığın ikinci mərhələsi) və inamın işığı ilə, ağıl vasitəsilə yox, başqa sözlə, biz ağıl deyəndə onu nə-

---

[98] Firq – dənə ilə ölçülən şeyləri ölçmək üçün qab.

[99] İbn əl-Məhbər, Ənas ibn Malikdən. Tirmizi «Ən-Nəvadirə» əsərində də qısa şəkildə verir.

[100] Dərk olunan

zərdə tuturuq ki, o, doğruluğun görünməsi və inamın işığı deı..
dir, bu isə Adəm oğlunu (insan) heyvanlardan fərqləndirən gizli keyfiyyətdir və bunun köməyilə şeylərin həqiqətini dərk edir.

Bu çaşqınlıq daha çox insanların nadanlığından gəlir - hansı ki, həqiqəti sözlərin hərfi mənasından almaq istəyirdilər - bu ifadə və sözləri işlədən və insanlar tərəfindən terminlərin müxtəlif izahları içində azdılar və yuxarıda gətirilən sübutlar ağılın mahiyyətini aydınlaşdırmaq üçün kifayətdir.

Daha doğrusunu Allah bilir!

Rəhmli və rəhman Allaha şükürlərlə ağıl haqqında kitab tamamlandı. Allah bizim yol göstərənimiz Məhəmmədi və göydə və yerdə yaşayanlardan öz seçilmiş qulunu alqışlasın. (Onun ardını Uca Allah izni ilə «İnam təliminin əsasları haqqında kitab»da verəcəyik). Hər şeyin başlanğıcı və sonu olan Allaha, onun Birliyinə həmd olsun!